| | |
|---|---|
| **Farscadan tər-<br>cümə edənlər:** | Məmmədağa Soltan –şerlər<br>Rəhim Sultanov və İsmayıl Şəms – nəsr |
| **Şərh:** | Şamil Cəmşid |
| **Rəssam:** | Mikayıl Abdullayev |

**Sədi Şirazi**
**Gülüstan –3-cü nəşr. –…**


Firdovsi, Xəyyam, Hafiz, Nizami, Fizuli kimi Sədi Şirazi də dünya mədəniyyət xəzinəsində özünə məxsus yer tutan cahanşünas və görkəmli şairlərdəndir.

Faydalı nəsihəətlər, zərbüməsəllər, nəcib duyğularla zəngin olan inun «Gülüstan» və «Büstan» əsərləri Yaxın və Orta Şərq xalqları rasında xüsusi şöhrətə malikdir.

Sədinin «Gülüstan» əsəri 1962-ci ildə görkəmli Azərbaycan şərqşünas alimləri R.Sultanov və M.Sultanov tərəfindən tərgüm və nəsr edilmişdir. Oxucuların rəğbətini qazanmış bu əsəri müəlliflər onun elmi-tənqidi mətni əsasında daha da təkmilləəşdirən 1987-ci ildə yenidən nəşr etdirmişlər.

Oxuculara təqdim olunan yeni üçüncü nəşri qabaqkı nəşrdə yol verilən bəzi çatışmamazlıqlar (çətin fars və ərəb sözlərinin lüğət bəhsinə əlavəsi, günün tələbinə uyğun bir sıra ifadə və tarixi rəqəmlərin düzəlişi) aradan qaldırılmışdır.



## Sədi Şirazi və onun «Gülüstan» əsəri

Sədi Şirazi Şərq ədəbiyyatının ən görkəmli nümayəndələrindən Firdovsi Xəyyam, Nizami, Hafiz və Füzuli kimi əsərləri bütün dünya mədəniyyəti xəzinəsinə daxil olan şairlərdəndir. O, hələ öz zəmanəsində Hindistandan tutmuş Misrə qədər Yaxın və Orta Şərqin bütün xalqları arasında böyük şöhrət qazanmışdır. Sədi «Gülüstan» əsərinin müqəddiməsində[1] «öz adının dillərdə əzbər olduğunu, sözlərinin bütün dünyanı tutduğunu» qeyd edir.

Sədi Şirazinin tərcümeyi–halı haqqında qısaca olaraq aşağıdakıları demək olar:

Müşərrəf ibn. Müsləhəddin Abdulla, «Sədi» təxəllüsünü Şiraz hakimi Atabəy Əbubəkr Səd ibn Zənginin[2] adı ilə əlaqədar qəbul etmişdir. Sədi təqribən 1184–cü miladi ilində İranın qədim mədəniyyət mərkəzlərindən biri olan Şiraz şəhərində bir ruhani ailəsində anadan olmuşdur. Bəzi mənbələrin göstərdvyinə görə, məşhur münəccim və böyük alim Qütbəddin Şirazi Sədinin dayısıdır. Sədi kiçik yaşlarında ikən atası Müsləhəddin vəfat etmişdir. Atasının ölümü Sədiyə böyük təsir etmiş, onun kədərlənməsinə səbəb olmuşdur. O, atasının xatirəsini uzun zaman unuda bilməmişdir. «Bustan» və «Gülüstan»da atasına həsr edilmiş bir sıra təsirli şerlər bunu açıq sübut edir. Sədi hələ gənc yaşlarında ikən monqol hücumları başlamış və bütün Yaxın Şərq, o cümlədən şairin vətəni olan Şiraz da təcavüzlərə məruz qalmışdır. Bu dövrdə şair öz vətənini tərk edib İraqi–Ərəbə, Bağdada getmiş, orada məşhur «Nizamiyyə» məktəbində öz dövrünün böyük alimləri Əbu İshaq Şirazi, Əbülfərəc Əbdürrəhman ibn Cövzi və sonra Şəhabəddin Söhrvərdidən dərs almış, ərəb dilini və öz dövrünün başqa elmlərini mükəmməl öyrənmişdir. Coşğun qəlbə malik olan bu istedadlı gənc, müəllimlərinin təlimi və Bağdadın ab–havasilə kifayətlənməyib Yaxın və Orta Şərq ölkələrini diyar–diyar dolaşmaq qərarına gəlmiş, Azərbaycan, Kiçik Asiya, Həbəşistan, Misir, Suriya, Fələstin, Hindistan və İran torpağını əksərən piyada səyahət etmiş, Xəlici–fars, Ümman dənizi, Hind okeanı və Aralıq dənizini ticarət gəmilərində keçmişdir.

Buna görə də bəzi mənbələr Sədini eyni zamanda orta əsrin böyük səyyahlarından biri hesab etmişlər.

Sədi öz səyahəti zamanı müxtəlif vəziyyətlərə düşmüş, gah dər-

viş libasında yazdığı şerləri oxuyaraq, xalqa xeyri–şəri başa salmağa çalışmış, gah şeyxlərə, sufilərə qoşulmuş, gah azadixahlarla oturub durmuş, bəzən karvana qoşulmuş, bəzən muzdla xurma dərmiş, su paylamış., bir sözlə o, müxtəlif sənətə malik olan şəxslərlə, alim və avamlarla, dövlətli və yoxsullarla, mülkədar və kəndlilərlə oturub durmuş, onlarla yaxından tanış olmuşdur. Bu səyahət Sədinin dünya-görüşündə böyük dəyişiklik yaratmışdır. Şairin itigörən nəzəri xalqlar arasında mövcud olan əlaqələri, bu xalqların adət və ənənələrini bütün dərinliyi ilə görmüş, əsərlərində onlardan yeri gəldikcə istifadə etmiş və hikmətli nəticələr çıxarmışdır. Sədi səyahətləri zamanı Şərqdə davam edən səlib müharibələrindən birində iştirak edərək əsir alınmış və bir təsadüf nəticəsində ölümdən xilas olmuşdur.

Vətənini qızğın məhəbbətlə sevən, həmişə vətən həsrətilə yanan şair deyir: «Mən istərdim ki, Bəsrədə və ya Bağdadda qalım, lakin Rüknabad suyu və Şiraz torpağı məni özünə tərəf çəkir».

Arasıkəsilməz səyahətdən yorulan Sədi nəhayət XIII əsrin orta-larında vətəni Şiraza döndükdə artıq böyük həyat təcrübəsinə malik, kamil bir şair idi. Bu zaman monqol istilasının ağır, dağıdıcı hücum-ları sakitləşmiş, Atabəy Əbubəkr Səd ibn Zəngi Şirazda hakimiyyət başında qalmışdı. O, monqol sərkərdələrinə bac–xərac verib, ölkəni və əhalini qətl və qarətdən xilas etmiş və beləliklə, çoxlarının; o cüm-lədən vətənpərvər şairin də rəğbətini qazanmışdı. Buna görə də şair özünün məşhur «Gülüstan» əsərini ona ithaf etmişdir.

Sədi tarix üçün misilsiz qiymətə malik olan əsərlər yadigar qoy-muşdur. O, şahların qəzəbindən, hökmdarların zülmündən qorxmaya-raq öz əsərlərində müstəbidlərə qarşı çıxmış, məzlumların tərəfini saxlamış, ədaləti tərənnüm etmiş, heç bir bəxşiş və mükafat qarşısın-da həyatının sonuna qədər bu mövqeyini, əldən verməmişdir. Onun qəsidələri də əsasən şahlara və böyüklərə nəsihət və məsləhətdən ibarət olmuşdur.

Sədi ömrünün son günlərini kuşənişinliklə keçirərək, Şirazın şi-mal–qərbində bir dağ ətəyindəki xanəqahda yaşamış və ölməz əsər-lər, qəzəllər, qitə və rübailər yazıb yaratmışdır. Təsadüfi deyildir ki, onun şairlik şöhrətini eşidən böyük şəxsiyyətlər uzaq vilayətlərdən Sədinin ziyarətinə gəlmiş, ona qiymətli hədiyyələr gətirmişlər. Lakin Sədi dünya malı toplamamış, əksinə, əlinə düşənləri ehtiyacı olanlara paylamışdır. Xalq arasında Sədi haqqında belə deyilirdi: «Sədi»nin bir qapısından nemət daxil olur, o biri qapısından ehtiyacı olanlara



paylanır». Mənbələrin dediyinə görə Sədi yüz ildən artıq yaşayaraq 1291–ci miladi ilində vəfat etmişdir.

Sədinin vəfatından təqribən 30 il sonra onun əsərlərini Əli ibn Əhməd ibn Əbubəkr Bistun adlı bir ədəbiyyatşünas toplayıb nizama salmışdır. Bistun topladığı əsərlərin hamısını «Külliyyat» şəklində tərtib edərək ona geniş bir müqəddimə də yazmışdır. O, Sədinin əsərlərini əlifba üsulu ilə düzdüyünü və onu bir neçə kitaba ayırdığını bu müqəddimədə qeyd edir. Bistunun tərtib etdiyi «Kül–liyyat» 1791–ci ildə Hindistanın Kəlküttə şəhərində daş çapı ilə nəşr edilmişdir. Bu «Külliyyat»ın əvvəlində Sədinin müxtəlif mövzuda 6 risaləsi də vardır. «Külliyyat»da bu risalələrdən sonra Sədinin ən qiymətli və şah əsəri olan «Gülüstan» və «Bustan» gəlir. «Gülüstan» 8, «Bustan» isə 10 babdan ibarətdir.

Sədinin bu iki əsəri ona dünya şöhrəti qazandırmışdır. Bu əsərlər yeddi əsrə yaxın bir müddətdə dünyanın bütün mədəni xalqlarının sevə–sevə oxuduğu kitablardır. «Gülüstan» latın, ingilis, fransız, alman, ərəb, türk, rus və MDB ölkələri xalqlarının əksərinin dillərinə təkrar–təkrar tərcümə edilmişdir. «Gülüstan» 100 dəfədən artıq çap edilmişdir. Bu əsərlərin sürətlə artan şöhrətini görən şairlər bu kitablara bir çox nəzirələr yazmışlarsa da onlardan heç biri bu səviyyəyə qalxa bilməmişlər. Sədinin həmin əsərləri Avropa dillərinə tərcümə edildikdən sonra bu ölkələrin bəzi məşhur şairləri öz əsərlərində Sədinin ifadə və fikirlərindən istifadə etmişlər. Misal olaraq Volter, Lafonten, Göte kimi adı dünya şöhrəti qazanmış böyük şairləri köstərmək olar.

Sədinin «Külliyyat»ında «Gülüstan» və «Bustan» əsərlərindən sonra, şairin ərəb və fars dilində yazdığı qəsidələr dərc edilmişdir. Bu qəsidələr, yuxarıda deyildiyi kimi, poeziyada klassik ənənənin əksinə olaraq, mədhnamədən çox didaktik məzmuna malikdir. Sədinin elə bir qəsidəsi yoxdur ki, orada o şahlara və görkəmli saray xadimlərinə nəsihətlər verib, onları ədalətə çağırmasın.

«Külliyyat»da qəsidələrdən sonra Sədinin qəzəliyyatı gəlir. Bu qəzəliyyat isə «Təyyibat», «Bədaye», «Xəvatim» və «Qəzəlliyati–qədim»–deyə dörd hissəyə bolünür. Qəzəliyyatdan sonra Sədinin monqol hökmdarı Abağa xanın vəziri olan məşhur Şəmsəddin sahibi–divanın adı ilə baqlı olaraq yazdığı «Sahibiyyə» (və ya «Sahib namə») adlı şerləri, sonra şairin «Məsnəvilər»i, «Qitələr»i, «Rübailər»i və «Müfrədlər»i toplanmışdır.

Sədinin qəzəlləri haqqında da olduqca yüksək fikirlər söylənmişdir. Tədqiqatçıların fikrincə Sədinin qəzəlləri olmasaydı, fars ədəbiyyatında Hafiz Şirazi kimi lirik şairlər yetişə bilməzdi. Hafiz özü Sədini qəzəl ustadı adlandırmışdır. XIII əsrin məşhur hind şairi Əmir Xosrov Dəhləvi də öz müasirləri Sədi Şirazi və Hümam Təbrizini qəzəl ustadı adlandırmışdır. Sədinin qəzəlləri özündən qabaqkı şairlərə nisbətən daha çox lirik, daha çox insan duyğularını tərənnüm edən, bədii əsərlər idi. Deməк olar ki, o, qəzəli əsl mənasında özünə məxsus bir ğövqeyə yüksəltmiş, ona nikbin əhvali–ruhiyyə vermişdir. Burada təbiət təsvirləri, məhəbbət və eşqin ülviyyəti çox yüksək zövq ilə tərənnüm edilmişdir. Onun müxtəlif şöbələrdə toplanmış olan qəzəlləri əsas etibarilə bir–birindən fərqlənmirlər. Bistunun fikrinə görə, qəzəllərin belə qruplaşması, onların müxtpəlif dövrlərdə (gənclik, qocalıq) yazılması ilə əlaqədardır. Məzmuna qalinca, Sədinin qəzəllərinin hamısı insanpərvər bir duyğu ilə yazılmışdır. Onun qitələri, rubailəri və müfrədləri də didaktik mahiyyət daşıyaraq şairin əsas dünuagörüşü ilə bağlıdır. Təsadüfi deyildir ki, ərəblər Sədini öz dahi şairi Əl–Mütənnəbbi, ingilislər isə öz dahi dramaturqu Şekspir ilə müqayisə etmişlər. Çünki bu şairlərin əsərlərində də insan müqəddəratı, həqiqət əsas yer tutmuşdur. Şekspirin dramlarda irəli sürdüyü ideyaların çoxunu Sədi qısa hekayə və qitələrdə məharətlə ifadə etmişdir.

Şərq ədəbiyyatında Sədiyə qədər «Bustan»a bənzər əsər tapmaq mümkünsə də, «Gülüstan»a oxşar əsər tapmaq çətindir.

Sədi «Gülüstan»ı son dərəcə mahiranə bir surətdə həm nəsr, həm də şerlə yazmışdır. Demək olar ki, bu, Sədinin öz yaradıcılıq ixtirasıdır. «Gülüstan» əsəri elə məharət və qüdrətlə yazılmışdır ki, istər onun nəsr hissəsi, istərsə Şer hissəsi füsünkar bir qələmin məhsulu kimi nəzərə çarpır. Burada dil sadəliyi, məzmun dərinliyi, yığcamlıq, zərbəni düz hədəfə vurmaq qabiliyyəti özünü bütün parlaqlığı ilə köstərmişdir. «Gülüstan» əsərinin belə aləmşümul şöhrət qazanması təkcə onun məzmununa görə deyildir. Bu əsər eyni zamanda ustalıqla yazılmış, sadə və bədii ifadələri, təşbih, məcaz, səc, kinayə, istiarə və başqa bədii ifadə tərzləri ilə də özündən qabaqkı va sonrakı əsərlərdən çox fərqlənir.

Təsadüfi deyildir ki, məhz Sədinin «Gülüstan» əsəri bütün dünyada fars dili öyrənmək istəyənlərin ilk dərs kitabı olmuşdur.

Yaxın Şərqdə fars dilində təhsil alan uşaq hər şeydən qabaq



«Gülüstan» əsəri ilə tanış olur və ömrünün sonuna qədər bu kitabdan ayrıla bilmirdi.

Sədi öz nəsihətlərini elə məharətlə oxuculara aşılayır ki, ondan həm hakim, həm məhkum, həm alim, həm cahil, həm zahid, həm də rind ibrət dərsi götürə bilir. Buna görə də sonra gələn şairlər «Gülüstan»a bənzər əsərlər yazmağa çox çalışmışlar. Məşhur Əbdürrəhman Cami «Baharistan», Məcdəddin – «Xaristan», Qaani – «Pərişan», Sünbüli – «Gəndistan»[3] adlı əsərlərini «Gülüstan»a nəzirə olaraq yazmışlar, lakin onların hər biri «Gülüstan» zirvəsinə yüksələ bilməmişdir.

Təsadüfi deyildir ki, məşhur hind şairi Həsən Dəhləvi «Gülüstan» əsəri haqqında demişdir:

«Həsən Sədinin «Gülüstan»ından bir gül dərib gətirmişdir. Çünki məna əhli ancaq bu Gülüstandan gül dərər».

Sədi ilə yaxından dost olan Azərbaycan şairi Hümam Təbrizi də Sədinin şairlik qüdrətini çox yüksək qiymətləndirib onu özünə ustad hesab etmişdir.

Sədinin «Gülüstan» əsərinin getdikcə daha çox yayılmasının, müxtəlif dillərə təkrarən tərcümə edilməsinin əsas səbəbi şübhəsiz ki, onun insanlar arasında sülhü, dostluğu və proqressiv fikirləri təbliğ etməsidir. Sədinin əsərləri Yaxşı adamlara məhəbbət, pis adamlara nifrət, hissilə doludur. Böyük hümanist şair insanın zahiri görünüşünü deyil, onun mənəviyyatını nəzərə alır. Şairin fikrincə paltar, mal, dövlət, vazifə, rütbə insanlıq şərəfi deyildir. İnsanlıq şərəfi xalqa xeyirli olmaqdadır.

«Gülüstan» əsəri müqəddimədən və kitabın yazılma səbəbindən sonra – hökmdarların rəftarı, dərvişlərin əxlaqı, qənaətin fəziləti, susmağın faydaları, eşq və cavanlıq, zəiflik və qocalıq, tərbiyənin təsiri, söhbət qaydaları – başlıqları ilə səkkiz fəslə bölünür.

«Gülüstan» əsərinin lap birinci fəslində Sədi şahlardan bəhs edir. Bu fəsildə Sədinin ictimai və siyasi görüşləri oz ifadəsini tapmışdır. O, burada şahlara nəsihət vermiş, onları ədalətə, düz yola çağırmışdır:

O, bir qitəsində:

«Əmirin, vəzirin və hökmdarın
Səbəbsiz dolaşma ətrafında sən»...

deyərək saraylardan ehtiyat etməyi məsləhət görür» Başqa bir Şerində zülmkar şahlara xitab edərək deyir:

Şahlara yaraşmaz zülm etmək bir an,
Qurddan ola bilməz sürüyə çoban.
Padşah zülm etsə xalqına əgər,
Özü öz mülkünü tarümar edər.

Şair qorxmadan şahlara, sultanlara xatırladır ki, onlar öz xalqlarına zülm etsələr, xalq da onlardan üz döndərər.

Şair düzgün dərk edir ki, şahların rəiyyətə etdiyi balaca ədalətsizlik böyük fəlakətlərə səbəb olar. Şah rəiyyət bağından bir alma dərsa, onun adamları ağacları kögündən qoparar.

Şah rəiyyət bağından bir alma dərsə, həmən –
Nökərləri çıxarar ağacları kögündən.
Beş yumurta alıb şah zülm eyləyən zamanda,
Qoşunu min toyuğu şişə çəkər bir anda.

Monqol istilasının ağır illərində şahlara nəsihət etmək o qədər də asan deyildi. Sədi isə belə bir cəsarətə malik şairlərdən olub onlara həqiqəti demakdən, doğru yola dəvət etməkdan qorxmurdu. Çünki Sədi özü deyirdi: «O adam şahlara nəsihət verə bilər ki, öz başından qorxmasın və şahlardan qızıl ummasın».

Sədinin nəzərində şahlar xalqa xidmət üçündür. Xalq şahların qulluğunda deyil, şah xalqın qulluğunda durmalıdır. O, bu fikri «Gülüstan» əsərinin bir hekayətində çox közəl ifadə etmişdir:

Padişah yoxsulun pasibanıdır,
Nə qədər olsa da güclü hökmran.
Qoyunlar çobanın malı deyildir,
Qoyuna baxmaqçın qoyulur çoban.

Sədi şahlara, əmirlərə moizə və nəsihətin təsir etmədiyini gördüyü zaman onları məzlumların odlu ahı və qiyamət gününün haqq hesabı ilə qorxudurdu.

Şahlardan birisi Sədidən ona dua etməsini xahiş etdikdə Sədi demişdir: «Öz xalqına qarşı ədalətli ol ki, düşməndən xilas olasan».



Şairin fikrincə: «öz ölkəsində xalqı ədalətlə idarə edən hökmdarın başqa ölkələri müharibə yolu ilə almağa ehtiyacı yoxdur». Sədi həmişə sülh tərəfdarı olaraq ölkələri xarabazara çevirən muharibələri rədd etmişdir.

O, deyir: «Bir məsələni ki, sülh ilə həll etmək mümkündür, onu müharibə yolu ilə həll etmək ağılsızlıqdır». Şairin bu sözü hələ bu gün də yüksəkdən səslənməkdədir.

Sədi hər yerdə, hər şəraitdə belə nəsihətlər verməkdən çəkinmirdi. Lakin orta əsr feodalizm əsarətinin hökmran olduğu bir dövrdə şərin xeyrə qalib kəldiyini görən Sədi, öz zəmanəsindən acı–acı şikayət etmişdir. Monqol istilaları əlindən baş götürüb dünyanı diyar–diyar gəzən şair Yaxın və Orta Şərqin hər yerində zəhmətkeş xalqın ağır və fəlakətli halına qəlbən açımışdır. Sədi orta əsr feodalizm dövründə biri dikərinin hesabına yaşayan sinifləri aydın görə bilmirdi. Ona elə gəlirdi ki, şah ağıllı olsa və ya ağıllı adamların sözünə baxsa, ölkədə ədalət və firavanlıq hökm sürər.

Bununla birlikdə Sədi həmişə öz hekayələrində zəhmətkeşlərin tərəfində olmuşdur. Bu cəhətdən Sədinin insanpərvərliyi və xəlqiliyi təqdirə layiqdir. O, əsərinin bir yerində birlik və ittafaq məsələsinə böyük əhəmiyyət vermiş, adi insanlar əl–ələ versə, ağır fəlakətləri aradan qaldıra biləcəklərini onlara başa salmağa çalışmışdır.

Sədi qüvvətli zülmkarlara qarşı birlik, vəhdət, ittifaq və qardaşlığın gücünü obrazlı olaraq belə təsvir edir:

Fildə çox olsa da, qüvvət, cəsamət,
Hünülər birləşsə yıxarlar yəqin.
İttifaq bağlasa qarıncalar da,
Dərisin deşərlər qızmış şirlərin.

Sədinin dini əqidəsi də onun belə realist fikirlər söyləməsinə mane ola bilməmişdir. Çünki ömrünün böyük və şüurlu hissəsini səyahətdə keçirərək, xalqların acınacaqlı məişətlərini müşahidə edən mütəfəkkir şair istər–istəməz onları birliyə çağırmış, həqiqəti olduğu kimi dərk etməyə çalışmışdır. O, ölkəni, cəmiyyəti sağlam ağıl və idrakla idarə etməyi lazım bilmiş, insanların bərabər hüquqda yaşamaq ixtiyarı olduğunu irəli sürmüşdür. Sədi bunun neçə və hansı vasitələrdə əldə edilməsini bilməsə də, hər halda o dövr üçün olduqca cəsarətli və mütərəqqi bir addım atmışdır.

Sədi şahların və saray xadimlərinin çirkin sifətlərini aydın gördüyü üçün, onların qarşısında qul kimi əli qoynunda durmağı pisləmişdir. Bu nöqteyi–nəzərdən «Gülüstan»dakı iki qardaş hekayəti çox maraqlıdır.

«İki qardaş var idi, birisi şah sarayında qulluq edər, o birvsi öz zəhmətilə çörək yeyərdi. Bir gün varlı qardaş yoxsul qardaşına dedi nə uçün şaha qulluq etmirsən ki, canını əziyyətdən qurtarasan? Qardaşı dedi: «bəs san nə üçün işləmirsən ki, qulluq fəlakətindən xilas olasan?..»

Ümumiyyətlə Sədi əməkçi xalqı cəmiyyətin ən şərəfli və nəcib üzvləri hesab edərək, onları ciddi müdafiə etmişdir.

Onun aşağıdakı kiçik hekayətinə diqqət edin:

«Hatəmi–Taidən soruşdular: dünyada özündən səxavətli bir adam görüb eşitmisənmi?

Dedi:

–Bəli, bir gün qırx dəvə qurban kəsib ərəb əmirləri ilə səhranın bir guşəsinə çəkilmişdim. Meşədən şələ bağlayıb aparan bir odunçu gördüm. Dedim:

–Nə üçün Hatəmin qonaqlığına getmirsən, bu saat bütün xalq onun süfrəsi başına toplanmışdır.

Dedi:

Kim öz əməyilə dolansa, əlbət,
Hatəmi–Taidən götürməz minnət.

İnsafla demak lazımdır ki, mən onu özümdən daha səxavətli və mərd gördüm».

Sədi feodalizm dövrünün məhdudiyyətindən yaxa qurtara bilməyib təvəkkül, qismət, səbr, tale, bəxt kimi səfsətələrə inanmışsa da, eyni zamanda insanın tale və bəxtə qarşı fəal rolunu da qəbul etmişdir.

Məsələn, şair deyir:

Mağara içində nə tapar arslan,
Uçmayan qartala ovmu gələcək?
Kim evdə oturub ruzi gözləsə,
Axırda o dönüb olar hörümçək.



Buna görə də Sədi boş–boşuna dolanıb havayı ruzu axtaranları cəmiyyətin, xalqın canına daraşmış tüfeyli hesab edir, tüfeyli olmamaq uçün isə ancaq elmə, sənətə sahib olmağı irəli sürür.

Atanın adına və dövlətinə arxalanıb heç bir elm və sənət öyrənməyən oğulları Sədi çox haqlı olaraq bədbəxt və avara adlandırır. O, deyir:

«Böyük adamların səfeh oğulları vətəndə bekar qalar, qürbətdə avara». Onun bir kiçik hekayəti bu fikri daha çox məharətlə ifadə edir: «Bir alim uşaqlarına nəsihət verirdi ki, ey əzizlərim, bir sənət öyrəniniz ki, dünyanın mal və dövlətinə arxalanmaq olmaz... sənət isə qaynar bulaq və tükənməyən xəzinədir. Əgər sənət sahibi kasıblığa düşsə, qorxusu yoxdur, çünki sənətin özü ona dövlətdir. Sənət sahibi haraya getsə hörmət görər... sənəti olmayan isə hara getsə gədalıq edib çətinlik çəgər...»

Qitə

Nakanan Şamda bir iğtişaş düşdü,
Hərə baş götürüb qaçdı bir yana.
Elmli, kamallı kəndli övladı,
Gedib vəzir oldu şaha, sultana.
Lakin fərasətsiz vəzir balası,
Kəndlərdə diləndi hey yana–yana.

Sədi bilik və ləyaqətə də şəxsi məsələ kimi baxmır, onun fikrincə, cəmiyyətin ləyaqətli üzvü olan hər kəs özünə səadət təmin etdiyi kimi, cəmiyyətə də xeyir verməlidir. Çünki, özünü sevməyənlər, öz həyatını qiymətləndirməyənlər cəmiyyətin də halına qalmaz, bəlkə ona bir yük olarlar. Deməli, elm və sənətə sahib olmaq ən vacib məsələlərdəndir. Eyni zamanda elmə söykələnənlər onu əməldə göstərməli və həyata tətbiq etməlidirlər. Bilik onun üçün əldə edilir ki, o cəmiyyətə, xalqa xeyir versin. Xeyirli işə sərf olunmayan bilik əldə edilməsə daha yaxşıdır.

Sədi deyir:

Biliyin olsa da bir Ümman qədər, –
Nadansan əməlin olmasa əgər,
Eşşəyə yüklənsə bir neçə kitab

Nə alim olar o, nə də süxənvər.
Başı boş o yazıq heyvan nə bilsin
Dalında odundur, ya kitab–dəftər.

Sədi hansı peşə ilə məşğul olmağından asılı olmayaraq bütün insanları düzlüyə çağırmışdır. Onun fikrincə düzlüklə çalışan adama zaval yoxdur. Əyri işlərlə məşğul olan adamlar isə hər şeydən qabaq özlərinə pislik etmiş olurlar.

O yazır:

Düzlüyü çox sevər taleyi yazan,
Görmədim düz yolda yolunu azan.

Başqa bir qitəsində demişdir:

Düşməni sən aciz etmək istəsən,
İşində heç israf eyləmə zinhar.
Sən təmiz həyat sür, kimsədən qorxma,
Ki, daşa çırpılar natəmiz paltar.

Gülüstan» əsərində dostluq məsələsinə də çox yer verilmişdir. Sədi o adamı yaxşı dost hesab edir ki, o dostunun nöqsanını uzünə deyir və bu qüsurların aradan qalxmasına kömək edir. Şair nöqsanı gizlədən dostdansa, nöqsanı göstərən düşməni üstün tutur.

O dostdan həmişə şikayətim var,
Ki, yaxşı deyələr pisimə onlar

Sədinin fikrincə düz sözdən, şirin dildən daha təsirli bir vasitə ola bilməz.

O deyir:

...Kimin olsa əgər bir şirin dili.
Tük ilə çəkər o, dalınca fili.

Eyni zamanda Sədi başqası danışanda onun sözünü kəsməyi tərbiyəsizlik hesab edir və öyrədir ki, ağıllı adamlar məclisi sakit görməyincə dil acmaz. İnsan hər bildiyi sözü də hamıya söyləməyə



borclu deyildir.

Təsadüfi deyildir ki, «Gülüstan»ın bir çox şerləri sonralar zərbülməsəl kimi dillər əzbəri olmuşdur. Tarixdə hələ heç bir kitab bu qədər zərbülməsələ çevrilməmişdir.

Sədi «Gülüstan»ın əbədi qalacağına əmin idi.

Doğrudan da qərinələr keçdi, şahlar, xaqanlar gəlib getdi, ali saraylar tikildi, dağıldı, dünya dəyişdi, lakin Sədinin «Gülüstan»ı getdikcə daha çox təravətlə ətir saçdı, onun əlvan gülləri heç zaman solmadı.

Burasını da demək lazımdır ki, Sədinin verdiyi tərbiyə dərsi bütün dövrlərə eyni dərəcədə aid ola bilməz. Orta əsr feodalizm dövründə mövhumat və cəhalətin hökm sürdüyü bir zamanda Sədinin əksər fikirlərinin mütərəqqi olmasına baxmayaraq, onun yaradıcılığında, dünyagörüşündə məhdudiyyət və ziddiyyətlər də olmuşdur. Xüsusilə çətinliyə dözüb daima səbr etməyi, təvəkkülə, bəxtə, taleyə inam, müəyyən irqlərə mənfi münasibət, pislik edənlərə də yaxşılıq etmək, kuşənişinliyi təbliğ və sairə, şübhəsiz ki, Sədi yaradıcılığında kölgəli cəhətlərdən hesab edilməlidir.

Azərbaycan xalqı bütün dünya xalqlarının, o cümlədən qonşu fars xalqının mütərəqqi yazıcı və sənətkarlarını həmişə sevmiş və onların yaradıcılıqlarını yüksək qiymətləndirmişdir. Sədinin əsərləri 600 ildən artıqdır ki, Azərbaycanda geniş yayılmış və öyrənilmişdir. Azərbaycan Respublikası Milli Elmlər Akademiyası Respublika əlyazmaları fondunda böyük qayğı ilə mühafizə edilən «Bustan» və «Gülüstan» əlyazmaları. Azərbaycan xalqının bu əsərləri nə qədər dərin bir məhəbbətlə sevdiyini nümayiş etdirir.

«Bustan» və «Gülüstan» əsərlərinin bir çox nüsxələri Azərbaycanın Şamaxı, Qazax, Təbriz, Ağdaş və Qarabağ xəttatları tərəfindən nəfis surətdə köçürülmuş və bəzi beytləri Azərbaycan dilinə tərcümə və şərh edilmişdir. Orta əsr təhsil mədrəsələrində ilk dərs kitablarından biri həmişə «Gülüstan» əsəri olmuşdur. Şairlik qüdrəti imtahan edilərkən Nizami və Xaqani ilə yanaşı Sədinin «Bustan» və «Gülüstan» əsərlərindən də tərcümələr əsas yer tutmuşdur. Təsadüfi deyildir ki, XIX əsrin məşhur müəllim şairi Seyid Əzim Şirvani gələcəyin böyük satarik şairi Mirzə Ələkbər Sabirə dərs verərkən, onun şairlik qüdrətini yoxlamaq üçün məhz ona Sədinin şerlərindən bədii tərcümə etməyi taşpırmış və tərcümənin dürüstlüyünə mükafat olaraq ona Nizaminin «Xəmsə»sini bağışlamışdı.

Fars dilindən Azərbaycan dilinə tərcümə edilən əsərlər içərisində Sədinin «Bustan» və «Gülüstan» əsərləri də mühüm yer tutur. «Gülüstan» əsəri təqribən 70 il bundan qabaq Mirzə Sadıq Rahil tərəfindən tərcümə və şərh edilərək «Bəhr ül–həqayiq» adı ilə çap edilmişdir. Bundan sonra Seyid Zərgər təxəllüslü şair Mirzə Əbdülvahab tərəfindən «Bustan» əsəri «Miyzan–ül–ədalət» adı ilə tərcümə və nəşr edilmişdir. Doğrudur bu əsərlərin hər ikisində ciddi təhriflərə yol verilmişdir, lakin hər halda bu tərcümələr Sədi yaradıcılığına olan hüsn–rəğbəti aydın surətdə ifadə etməkdədir.

1958–ci ildə «Bustan» əsərindən seçilmiş parçalar şair Mir Mehdi Seyidzadə tərəfindən tərcümə və nəşr edilmişdir.

Azərbaycan alimi Rüstəm Əliyev «Gülüstan» əsərinin elmi–tənqidi mətnini hazırlamış və Sədi yaradıcılığı üzrə mühüm tədqiqat işi aparmışdır.

Əməkdar elm xadimi, professor Rəhim Sultanov «Sədi yaradıcılığında «Gülüstan»»» adlı kitabında «Gulüstan» əsərini ətraflı surətdə təhlil etmişdir.

«Gülüstan»ın oxuculara təqdim edilən bu tərcüməsinin orijinala mütabiq olmasına ciddi səy göstərilmişdir.

***M. SULTANOV.***



# G Ü L Ü S T A N

## MƏRHƏMƏTLİ VƏ MEHRİBAN ALLAHIN ADI İLƏ BAŞLAYIRAM

İzzət və calal sahibi olan allaha şükr edirəm ki, itaət etməklə ona yaxınlaşır, şükr etməklə öz nemətini artırırsan. Hər nəfəs aldıqca ömür uzanır, hər nəfəs verdikcə ürək şadlanır. Deməli, hər nəfəs almaqda iki nemət mövcuddur və hər nemətə şükr etmək kərək.

Beyt

Məgər əldə dildə var öylə hünər,
Edə xaliqə şükr lazım qədər...

Şer

Bəndə odur kim bilə təqsirini,
Üz tutaraq allahına yalvara,
Çünki ona layiq olan xidməti,
Kimsə bacarmaz edə bu dünyada.

Onun hesabsız rəhmət yağışı hər yerə yağmış, əsirgəmədiyi nemət süfrəsi hər yerə yayılmışdır. Öz bəndələrinin namus pərdəsini balaca günah üçün parçalamaz, səhvən onu inkar edənləri də ruzisiz qoymaz.

Şer

Ey kəramət sahibi, başı bağlı xəznəndən
Tərsayə də, gəbrə də bol–bol ruzi verirsən.
Düşmənlərə sən belə nəzər salan zamanda,
Unutmazsan yəqin ki dostlarını bir an da

Fərş sahibi, Səba yelinə əmr etdi ki, öz yaşıl fərşinin yer üzünə sərsin, bahar buludunun dayəsinə də buyurdu ki, bitkilərin qızlarını yer beşiyində boya–başa çatdırsın. Ağaclar Novruz xələtilə yaşıl paltarı bürünüb, yaz mövsəminin gəlişilə budaqlarının balaları başına çiçək papağı qoydu. Onun qüdrətilə şirinlik yarandı, xurma toxumu cücərib gözl ağaca çevrildi.

Şer



Bulud, külək, qəmər, günəş fələk daim işdədir,
Ki, bir qarın çörək tapıb sən yeyəsən ləzzətlə.
Hər şey olmuş sənin üçün hərəkətdə, fərmanda,
Düzgün olmaz sən vaxtını keçirəsən qəflətlə

Belə xəbər verirlər kainatın başçısı, bütün mövcüdatın iftixarı, aləmin qoruyucusu, insanların hamisi, zamanın son peyğəmbəri Məhəmməd Mustafa–allah onu səlamət etsin

Beyt

Şəfaətli, itaətkar, kəramətli peyəmbər,
Ədalətli, şücaətli, mürüvvətli peyəmbər

Beyt

Ümmətinin nə dərdi var sən tək arxa olan zaman,
Nuh gəmiçi olan yerdə qorxmaz heç kəs tufanlardan.

Beyt

Əngin fəza kəmalıdır, Günəş bənzər gəmalına
Gözəlliyin cəlalıdır, alqış ona və alına*

Əgər günahkar və halı pərişan olan bir bəndə ümmidlə o yüksək cəlallı həqqin dərgahına yalvarış əlini qaldırıb paz–piyaz etsə, böyük yaradandan etina görmədikdə yenə əl qaldırıb ah–nalə ilə ondan kömək istəsə, allah taala buyurar: mənim qulumun məndən başqa köməyi olmadığından onun istəyini yerinə yetirdim, arzusuna çatdırdım ki, öz bəndəmin nə qədər yavarışından xəcil oldum.

Beyt

Gör nə qədər allahda vardır lütfü kəramət
Bəndə günah eyləmiş o sa çəkir xəcalət.

---

* ал–аиля, йахын адамлар

Onun cəlal Kəbəsində bir guşəyə çəkilib ibadət edənlər özlərinin layiqincə ibadət edə bilmədiklərin etirafla, camalının gözəlliyini vəsf edənlər heyrət içində qalıb demişlər: biz sənin mərifətini layiqincə dərk edə bilmədik.

Şer

Kim sorsa allahın vəsfini məndən,
Nişansız varlığı bilərmi bir kəs?
Aşiqlr məşuqun ölmüşləridir,
Çıxmaz, şübhəsiz ki, ölmüşlərdən səs.

Ariflərdən biri başını aşağı salıb fikir dəryasına qərq olmuşdu, elə ki, düşüncədən ayrılıb özünə gəldi, dostlardan biri soruşdu:

–Getdiyin bostandan bizə bir hədiyyə ver.

O, dedi:

–Gedəndə yadımda idi ki, əkər gül ağacına çatsam, ətəyimi doldurub dostlara hədiyyə gətirəcəyəm. Lakin elə ki, bostana çatdım, gülün ətri məni o qədər məst etdi ki, ətəyimdən belə tuta bilmədim.

Şer

Ey mürği–səhər eşqi bu pərvanədən öyrən,
Yandısa canı çıxmadı ondan yenə avaz.
Bu müddəilər bilməyir əsla nə xəbərdir,
Kim tutsa diləkdən xəbər, ondan xəbər olmaz.

Şer

Ey xəyaldan üstün olan sirri bilinməz qüdrət,
Çox dedilər, çox eşitdik, çox oxuduq, nəhayət,
Məclis bitdi, ömür çatdı başa biz də qocaldıq,
Lakin yenə biz əvvəlki nöqtədə donub qaldıq.

## Atabəy Əbubakr ibn Sədin tərifi**

** Цзəриндə немрə гойулмуит ад вə бейтлəр китабын



Sədinin gözəl tərifinin dillərə düşməsi, şair avazəsinin dünyaya yayılması, şirin hekayələrinin ağızda şəkər dadıb əsər–lərinin hər yarpağının qızıl vərəqi tək əldən–ələ gəzməsi, onun öz fəzilət və sanətkarlığının yetkinliyindən deyil, bəlkə cahanın hökmdarı, zəmanənin sərdarı, Süleyman taxtının varisi və iman sahiblərinin hamisi, şahlar şahı Atabəy Müzəffərəddin Əbubəkr ibn Səd ibn Zənginin (yer üzündə allahın gölkəsi odur. İlahi, ondan razı ol və könlünü şad elə!) Ona mərhəmət nəzərilə baxıb, sənətinə yüksək rəğbət və həqiqi məhəbbət bəsləməsindəndir. Xalqın da ona dərin məhəbbəti bu səbəbdəndir.

Şer

Mənə ki, salırsan belə xoş nəzər,
Günəşdən məşhurdur yazdığım əsər.
Olsa da qulunda çox eybü nöqsan,
Hünərdir hər eybi bəyənsə sultan.

Şer

Gecən gün hamamda ətirli bir gül,
Yetişdi əlimə bir dost əlindən.
Soruşdum müşksən, ya inki ənbər,
Ki, belə məst oldum sənin iyindən?
Dedi ki, yararsız bir palçıq idim,
Bir müddət gül ilə etdim nişimən.
Mənə dost kamalı eyləmiş təsir,
Yoxsa ki, yararsız haman giləm mən!

Allah Şiraz torpağını adil hökmdarların gücü və işgüzar alimlərin himmətilə dünya durduqca əmin–amanlıqda saxlasın.

Yəqin bu Pars mülkunə toxunmaz afəti–dövran,
Ki, salmış başına sayə sənin tək sayeyi–yezdan.

сонунда изаh едилмишдир.

Tapa bilməz yəqin heç kəs gəzərsə cümlə dünyanı,
Sənin dərgahi–alin tək ki, versin dərinə dərman.
Özünsən arxası hər bir zavallı bəndənin daim,
Görüm versin mükafatın sənin ol xaliqa–keyhan.
Bu xaki–Parsı sən saxla ilahi badi–afətdən,
Nə qədri abü xak olsa cahanda baqi, cavidan.



## KİTABIN YAZILMASININ SƏBƏBİ

Bir gecə gecən günləri xatırlayıb hədər getmiş ömrümə təəssüf edir, könlümün saray daşını göz yaşımın almaz danələrilə deşir, öz halıma münasib olan bu beytləri deyirdim:

Şer

Ömürdən gedir bu gecən hər nəfəs
Baxıram ətrafa qalmamış bir kəs
Ey yatan əlli il qəflətdə bütün,
Qoyma ki, boş gecə bu qalan beş gün
Utansın o kəs ki, ömrü puç etdi,
Dünyadan köçəndə xəcalət getdi.
Köç vaxtı səhərin şirin yuxusu.
Qoyar piyadəni yoldan, doğrusu.
Hər gələn dünyada bir bina saldı
O getdi, mənzili özgəyə qaldı.
Çoxları dünyaya göstərdi həvəs.
Tikdiyi binada qalmadı bir kəs.
Vəfasız dünyaya meyl etmə, zinhar.
Dostluğa yaramaz bu köhnə qəddar
İndi ki, öləcək pis də, yaxşı da.
Xoş ona ki çatdı yaxşı bir ada.
Bir yarpaq göndər öz qəbrinə bu gün
Ki, sonra göndərmök deyildir mümkün.
Dövran bir günəşdir, ömür isə qar
Hələ gör xacədə necə qürrə var?
Ey pulsuz bazara gedən sərsəri,
Xorxuram əliboş dönəsən geri.
Sütülkən kim yesə əkinin hər il,
Başşaq toplayacaq xirmən üstü bil.

Bu düşüncələrdən sonra belə qərara gəldim ki, xəlvət bir guşəyə çəkilib heç kəslə söhbət etməyim, sinə dəftərimi mənasız sözlərdən təmizləyib, daha hədərən–pədərən danışmayım.

Beyt

Qalıb bir kuşədə sakit danışmaz olsa bir insan,
Daha xoşdur, açıb dil boş, ləyaqətsiz danışmaqdan.

Elə bu zaman vaxtilə kəcavədə həmnişinim[4] və hücrədə həmdəmim olan dostlarımdan biri qabaqkı adəti üzrə qapımdan içəri girdi. O, nə qədər gülüb–danışıb, zarafat etdisə, cavab vermədim və başımı ibadətdən qaldırmadım. İncik nəzərlə məni süzüb dedi:

Şer

Bu gün mümkün ikən danışmaq sənə,
Dil ac, qardaşım, söylə, xoşluqla din!
Əcəl peyki bir gün yaxandan tutar.
Zərurət üzündən susarsan, yəqin.

Yaxın adamlarımdan biri vəziyyəti görüb, dostumu başa saldı ki, filankəs qalan ömrünü dünyada kuşənişinliklə keçirib, tənhalıq və sükutla başa vurmağı qərara almışdır. Əgər bacarırsan, sən də öz başının çarəsini qıl, nə məsləhət bilirsənsə elə də et.

Dedi:

– O böyük izzətə və qədim səmimiyyətə and olsun, əgər o, mənimlə həmişəki kimi dostcasına danışmasa, əl çəkib, ayaq geri qoymayacağam. Çünki dostun gönlünə dəymək nadanlıqdır. İçdiyi andın günahını isə asanlıqla yuya bilər. Onun seçdiyi bu yol düz yol deyil, ağıllı adamlar rəva bilməzlər ki, Əlinin zülfüqarı qınında, Sədinin sözü qəlbində qalsın.

Şer

Nədir dil ağızda, ey ağlı olan,
Hünər xəznəsinə açardır inan.
Əgər bağlı olsa, kim anlar ki, o,
Cavahir satandır, ya muncuq satan



Şer

Ədəb sayılsa da məclisdə susmaq,
Məsləhət zamanı danışmaq kərək.
İki şey ağıla nöqsan sayılır,
Yersiz susmaq ilə yersiz söz demək.

Nəhayət onunla danışmaqdan boyun qaçırıb, üz döndərməyə insafım yol vermədi, o mənim ən yaxın dostum və sədaqətli sirdaşım idi.

Beyt

Necə vuruşasan, o adamla sən,
Ki, onun üzündən gecə bilmirsən.

Onunla söhbət etməyə məcbur oldum. Qalxıb gəzə–gəzə seyrə çıxdıq. Bahar fəsli idi, şaxtalı soyuqlar zamanı keçmiş, qızıl gül dövranı çatmışdı.

Nəzm

Ağaclar üstündə yarpaq köynəyi,
Bayram paltarıdır şadlıq bağında
Birinci günüdür Ordibehiştin,[5]
Bülbüllər oxuyur gül budağında.
Qızılgül üzünə al şəbnəm qonmuş.
Sanki tər düzülmüş yar yanağında.

Gecəni dostlarımızdan birinin bağında keçirməli olduq. Gözəl və səfalı bir yer idi. Ağaclar baş–başa vermiş, sanki torpağına mina zərrələri səpilmiş, budaqlarına ulduz danələri asılmışdı.

Şer

Cənnəttək bir bağdır, cağlayır sular, .
Quşların səsilə dolmuşdur hər yan.
Al–əlvan lalələr bəzəmiş yeri.

Meyvələr doldurmuş bağı firavan.
Külək ağacların kölgəliyində.
Rəngbərəng fərşləri döşəmiş əlvan.

Səhər açılanda qayıtmaq arzusu qalmaq istəyinə üstün kəldi, dostumun ətəyini cürbəcür güllər və çiçəklərlə doldurub, şəhərə aparmaq istədiyini gördüm. Ona dedim:

–Özün bilirsən ki, külün davamı, gülüstanın isə vəfası yoxdur. Atalar yaxşı demişlər: ömrü az olan şeyə könül bağlamağa dəyməz.

Dedi:

–Nə etmək lazımdır?

Dedim:

–Oxuyanlara səfa, eşidənlərə şəfa verən «Gülüstan» adlı bir kitab yazmaq lazımdır ki, heç bir xəzan yeli onun yarpaqlarına əl vura bilməsin və zamanın gərdişi onun nəşəli baharını boranlı qışa çevirə bilməsin.

Şer

Nəyinə lazımdır gül tabaq–tabaq,
Kəl, «Gülüstan»ımdan apar bir varaq.
Kül beş–altı günə saralıb solar,
Mənim Gülüstanım daim xoş olar.

Mən bu sözləri deyən kimi dostum ətəyindəki gülləri yerə töküb, ətəyimdən yapışdı və dedi:

–Kişi vədinə vəfa etməlidir.

Elə həmin gün «Ünsiyyət və söhbət qaydaları barəsində» natiq–lərə fayda verən, yazıçılara sənətkarlıq öyrədən iki fəsil hazır oldu. xülasə, gülüstandan kül qurtarmamış «Gülüstan» kitabı tamam oldu.

Lakin, həqiqətdə bu kitab o zaman bitmiş hesab edilə bilər ki, o, dünyanın pənahı, allahın (yer üzərində) kölgəsi, yaradanın mər–həmət nuri, zamanın zinəti, sülhün dayağı, göylərdən kömək alan, düşmənlərə zəfər çalan, qalib dövlətin qüvvəti, millətin parlaq çırağı, dövranın camalı, islamın kamalı, Səd ibn Atabək, böyük, əzəmətli şahlar şahı, ümmətin ümidi, Ərəb və Əcəm hakimlərinin başcısı, quruların, dənizlərin sultanı, Süleyman mülkinin varisi, Müzəffəraddin Əbubəkr ibn Səd ibn Zənginin (allah, onun səadətini



əbədi et, cəlalını artır, işlərinə rəvac ver) sarayında bəyənilsin və (şahzadə) öz lütfkar nəzərlərilə ona baxmış olsun.

Şer

Bəzərsə mərhəməti bu kitabı sərvərimin,
Olar bu Çin bəzəyi ya ki, nəqşi–«Ərjəngi»[6]
Ümidlərim bunadır ki, qəbula layiq olar,
Ki, gülüstan ola bilməz məkani–diltəngi
Ələlxüsus onun əvvəlində xoş xətlə,
Yazılsa Səd Əbubəkr Səd bini Zəngi.

Mənim fikrimin gəlini zinətdən məhrum olduğu üçün, utan–dığından başını yuxarı qaldırıb, yaslı gözlərini xəcələtin ayağı altından ayıra bilmir. Nə qədər ki, böyük əmir, alim və ədalətli, qələbələr ilhamçısı, səltənət təxt–tacını qoruyanların başçısı, məmləkətin tədbirçilər tədbirçisi, fəqirlərin pənahı, qəriblərin istinadgahı, alimlərin hamisi, zahidlərin dostu, fars əhlinin iftixarı, din və dövlətin fəxri, islamın və müsəlmanların köməkçisi, şahların, sultanların etimadlısı Əbubəkr ibn Əbunəsr (allah onun ömrünü uzun, mənsəbini böyük, ürəyini geniş, yaxşı əməllərinin mükafatını artıq etsin. Çünki, o, dünyanın ən böyük adamlarının tərifinə layiq olmuş, xasiyyətlərin ən gözəllərini özündə toplaya bilmişdir) bu əsəri qəbul edib, onu öz mərhəməti ilə zinətləndirməyincə (bu kəlin) ariflər məclisinə çıxa bilməyəcəkdir.

Şer

Onun kölgəsində kim olsa, əlbət,
Kini dostluq olar, günahı taət.

Dərvişlərdən başqa hər bir bəndənin və xidmətçinin bir və–zifəsi vardır. Bunlardan hər kim öz işində kahıllıq etsə və səhlən–karlığa yol versə, danlanılar və məsuliyyətə cəlb olunarlar. Dərviş tayfası isə böyüklərin nemətləri müqabilində şükür edib xeyirdua oxuyurlar. Belə bir xidməti zahirdə etməkdənsə gizlində etmək daha münasibdir, çünki, birincisi yaltaqlığa yaxındır, ikincisi qədirdanlığa, ona görə də tez müstəcab olar.

Şer

Bu fələyin qaməti şadlıq ilə oldu rast
Ta ki sənin tək oğul doğdu bu bətni–zaman.
Hikməti var xaliqin, lütf eləsə hər kəsə,
Bəndəni xas eyləyib xalqa edər hökmran.
Kim yaşadı xeyrilə, tapdı əzəl dövlətin,
Xeyir–dua saxlayar yaxşı adı cavidan.
Əhli–kəmal etsə də etməsə də vəsfini,
Məşşata lazım deyil gül uzə heç bir zaman.

Saray xidmətindən çəkinib guşənişin olmağımın səbəbi bu misaldakı **Hikmət**ə görədir: hind filosoflarından bir neçəsi bir yerə yığışıb Bozorcmehrin[7] fəzilətindən söhbət açmış və nəhayət onun ağır–ağır danışmasından başqa bir eybini tapmamışlar; yəni o, danışarkən çox düşünür, dinləyici isə onun fikrinin sonunu intizarla gözləməli olurmuş. Bozorcmehr bunu eşidib demişdir:

– Əvvəlcə «nə deyim», haqqında fikirləşmək, sonradan «niyə dedim?» peşmançılığından yaxşıdır.

Şer

Dünya görmüş qoca söz ustadı, bil,
Əvvəlcə fikir edər, sonra açar dil.
Tələsik söyləməz sözünü bir dəm.
Fikrini kamil de, kec olsa nə qəm!
Düşünüb sonra de sözü müxtəsər,
O qədər danışma, «bəsdir» desinlər.
Nitqilə üstündür heyvandan insan.
Heyvandan əskiksən boş–boş danışsan

Xüsusən böyük hökmdarın ariflər və bilikli alimlər iştirak edən hüzurunda danışmağa cəsarət göstərsəm, utanmazlıq edər və hüzuri–mübarəkə dəyərsiz mal gətirmiş odardım. Cavahirat bazarında muncuğun bir arpa qədər qiyməti olmaz. Çıraq, günəş qarşısında işıq verməz, uca minarələr Əlvənd dağı[8] yanında alçaq görünər.



Şer

Kim xalqa iddia göstərsə əgər,
Hər yerdən başına bir zərbə dəyər.
Sədisə yazıqdır, qəlbi azada,
Yazıqla kim dava edər dünyada?
Əvvəlcə bir düşün, sonra dilə gəl,
Divar tez yıxılar olmasa təməl,
Mən də bir gülcüyəm, bostandan uzaq.
Mən də bir Yusifəm Kənandan[9] uzaq.

Loğmandan[10] soruşdular ki, «elmi kimdən öyrəndin?» Dedi: kor–lardan, onlar ayaqları altını yoxlamadan irəli addım atmazlar. Atalar demişlər:

– Bir yerə girməzdən əvvəl oradan necə çıxacağını düşün! Fərd. Kişiliyini sına, sonra arvad al.

Şer

Xoruz cəld olsa da savaşda, lakin,
Qızıl quş cənginə o qadir deyil,
Pişik siçan üçün pələng olsa da,
Pələng qarşısında bir siçandır bil.

Lakin alicənab şəxslər öz tabeliklərində olan adamların eyblərini üzə vurmayıb, xırda qüsurlarını açmadıqlarına əmin olduğumdan, müxtəsər şəkildə bir sıra qəribə hekayələri, təmsilləri, şer və nağılları, həmçinin keçmiş hökmdarların əxlaq və rəftarlarından bəhs edən rəvayətləri bu kitabda topladım və əziz ömrümün bir hissəsini ona sərf etdim.

Şer

Bu dünya duracaq illər boyunca,
Lakin torpaq olar bizim bu bədən.
Bir xəyal qalacaq bizdən yadigar.
Varlıqsa yox olub gedəcək həmən

Bəlkə bir xeyirxah biz yazıqları,
Rəhmətlə xatırlar dua edərkən.

Kitabı tərtib edib fəsillərə ayırarkən, mətləbi qısa bir surətdə ifadə etməyə diqqət göstərməyi lazım bildim və oxucunun da–rıxmaması üçün behişt bağlarına oxşayan bu «Gülüstan» kitabını səkkiz fəslə böldüm:

1. Hökmdarların rəftarı haqqında.
2. Dərvişlərin əxlaqı haqqında.
3. Qənaətin fəziləti haqqında.
4. Susmağın faydaları haqqında.
5. Eşq və cavanlıq haqqında.
6. Zəiflik və qocalıq haqqında.
7. Tərbiyənin təsiri haqqında.
8. Söhbət qaydaları haqqında.

Günümüz xoş ikən, keçmədəydi bil,
Hicrətdən altı yüz əlli altı il,
Qəsdimiz verməkdi düz yolu nişan,
Allaha tapşırıb köçdük dünyadan.



# I FƏSİL

## HÖKMDARLARIN RƏFTARI HAQQINDA

### 1. Hekayət[11]

Nağıl edirlər ki, bir padşah bir əsirin öldürülməsini əmr etmişdi. Yazıq əsirin ümidi kəsildikdə, ağzına gələni deyib padşaha söyüşlər yağdırmağa başladı. Məsəl var deyərlər: canından əl çəkən ağzına kələni deməkdən qorxmaz!

Beyt

Yoxsa bərk ayaqda qaçmağa imkan,
Kəsərli qılıncı qarmalar insan.

Şer

Ümidsiz qalsa hər insan
Açar dil, qorxmaz aləmdə.
Hücum eylər itə birdən
Pişik məğlub olan dəmdə.

Padşah yanındakılardan əsirinnə danışdığını soruşdu. Xeyirxah vəzirlərdən biri dedi:

–Ey hökmdar, o deyir ki, qəzəblənəndə özünü saxlaya bilən adam, başqalarının da günahını bağışlaya bilər.

Padşah rəhmə gəldi, əsirin ölümündən əl çəkdi. Xeyirxah vəzirin rəqibi olan başqa bir vəzir sözə qarışıb dedi:

–Hökmdarın hüzurunda yalan danışmaq bizim kimi adamlara yaraşmaz. Bu əsir padşahı söyüb, ona nalayiq sözlər dedi.

Şah bədxah vəzirin bu sözündən hiddətlənərək dedi:

–Onun yalanı sənin doğrundan xoş idi, çünki o, xeyirxahlıq məqsədilə deyilmiş, səninki isə bədxahlıq. Ağıllı adamlar demişlər: «Sülh doğuran yalan, fitnə törədən doğrudan yaxşıdır».

Şer

Kimin ki, sözünə əməl edir şah,
O, kərək hər sözdə olsun xeyirxah.

Fridunun[12] sarayının tağında yazılmışdır:

Lətifə

Bu dünya məgər qaldımı bir şaha?
Get öz qəlbini bağla bir allaha.
Bu dünya, bu mülkə sığınma bir an,
O sən tək çoxun məhv edibdir, inan.
Nə fərqi gedərkən bu canü, bu tən,
Ya töxt üstə öl, ya da torpaqda sən?

**2. Hekayət**

Xorasan hakimlərindən biri yuxuda gördü ki, Mahmud Səbüktəkinin[13] bütün badəni çürüyüb torpağa qarışmış, lakin gözləri hələ də öz hədəqəsində hərlənir və ətrafa baxır. Bütün alimlər bu yuxunu yozmaqda aciz qaldılar. Ancaq orada olan dərvişlərdən biri baş əyib dedi: «Gözləri həsrət çəkir, axı, ölkəsi əldan–ələ keçir».

Şer

Çox gömüldü yer altına mənəm–mənəm deyənlər
Ki, onlardan bu dünyada bircə ad–san qalmadı.
Torpaq altda yatanlara bir diqqətlə nəzər sal.
Torpaq yedi, sümüyündən belə nişan qalmadı.
Yaxşı addır Nuşirəvanı[14] bu dünyada yaşadan.
Lakin, köçdü bu dünyadan Nuşirəvan, qalmadı.
Ey filankəs, xeyirxah ol, bil həyatı qənimət,
Nə qədər ki, deməmişlər filan–filan qalmadı.

**3. Hekayət**

Bir şahzadə haqqında eşitmişəm ki, özü çirkin və qısaboylu, qardaşları isə gözəl və uca idi. Bir dəfə şah ona alçaq nəzərlə baxıb, etinasızlıq göstərdi. Oğlan həssas idi, başa düşdü və dedi:



– Ata, ağıllı gödək, axmaq uzundan yaxşıdır. Hər qaməti uca olanın qiyməti baha olmaz. Qoyun kiçik olsa da təmiz, fil böyük olsa da murdardır.

Şer

Çox alçaq olsa da Tur dağı[15] bişək,
Allah dərganında sayılır yüksək.

Şer

Söylədi bədəncə zəif bir alim,
Bir şişman axmağa: «Varmı xəbərin
Əgər ərəb atı arıq olsa da,
Bir töylə eşşəkdən yaxşıdır, yəqin».

Atası güldü, söz dövlət başçılarının ürəyinə yatdı, qardaşlarında isə kin oyatdı.

Şer

Nə qədər dil açıb dinməmiş insan,
Hünəri və eybi qalacaq nihan.
Gördüyün hər meşə sanma ki, boşdur,
Bəlkə də yatmışdır orada qaplan.[16]

Deyirlər ki, həmin günlərdə güclü bir düşmən padşahın ölkəsinə hücum etdi. Hər iki tərəfin qoşunları üz–uzə gəldikdə döyüş meydanına birinci atılan haman oğlan oldu.

Vuruş çağı kimsə görməmişdir arxamı,
Bəlkə torpaq–qan içində görəcəksən döşümü.
Hər döyüşən öz başını itirirsə vuruşda,
Dönüb qaçan, girə verər saya gəlməz qoşunu.

Bunu deyib, özünü düşmən qoşununa vurdu, bir necə pəhlivan öldürdükdən sonra atasının yanına gəldi, baş əydi və dedi:

Şer

Məni belə zəif hesab edən sən,
Demə ancaq boydadır hər iqtidar.
Döyüşlərdə incə belli at gərək.
Kök öküzün meydanda nə xeyri var?!

Nağıl edirlər ki, duşmənin qoşunu son dərəcə çox, hökmdarınkı isə az idi. Buna görə də onun qoşunundan bir hissə döyüşdən qorxub qaçmağa başladı. Bu vaxt haman oğlan nərə çəkib dedi:

–Ey, kişisinizsə, çalışın qadın paltarı keyməyin! Süvarilər onun bu sözündən qeyrətə gəlib cəsarətləndilər, qaçanlar da geri döndülər, hamısı birlikdə düşmənə qarşı hücuma keçdi. Padşahın qoşunu həmin gün düşmənə qələbə çaldı.

Şah igid oğlunu bağrına basıb öpdü. Sonra şahın ona qarşı məhəbbəti gündən–günə artmağa başladı, nəhayət onu özünə vəliəhd təyin etdi. Qardaşları paxıllıqdan onun xörəyinə zəhər qatdılar. Bacısı eyvandan bunu gördü, dərhal pəncərəni bərk çırpdı. Oğlan işin nə yerdə olduğunu duydu və əlini xörəkdən çəgərək dedi:

–Heyifdir, hünərlilər ölə, hünərsizlər onların yerini tuta!

Beyt

Dünyadan yox olsa gər hüma quşu,
Bir kimsə sayəban etməz bayquşu. [17]

Ataları bu xəyanətdən xəbərdar olub oğlanlarını yanına cağırtdırdı, onlara lazımi qulaqburması verdikdən sonra, hərəsinə ölkənin uzaq bir hissəsində yer ayırdı. Bununla da aralarındakı fitnə yatdı və ədavət aradan qalxdı, çünki məsəl var deyərlər: «On dərviş bir kilimə yığışar, iki padşah bir ölkəyə sığışmaz»

Şer

Bir çörək taparsa mömin, düz adam,
Yarısın paylayıb, yarısın yeyər.
Padişah bir ölkə aldıqda, yenə
İkinci ölköni almaq istəyər.



**4. Hekayət**

Ərəblərdən bir dəstə quldur dağ başında məskən salıb, karvan yolunu kəsmiş, dağın zirvəsində ən uca yerdə möhkəm bir mövqeyi tutmuşdular. Buna görə şah qoşunları quldurlara bata bilmir, camaat isə onların qorxusundan yata bilmirdi. Quldurların bu hərəkəti bir müddət də davam edərsə, onlara üstün gəlməyin mümkün olmayacağını görən o ətrafın başçıları tədbir üçün bir yerə toplaşdılar.

Şer

Yeni rişə atan cavan bir çinar,
Bir adam əl atsa yerindən çıxar.
Lakin kök atarsa o xeyli zaman,
Fələk də gələrsə, qoparmaz, inan.
Çeşmə tutulsa da kiçik bel ilə,
Dolarsa keçilməz böyük fil ilə.

Başçılar məsləhətləşib bir nəfəri quldurları pusmağa göndərdilər və hücum üçün fürsət gözləməyə başladılar. Pusquda oturmuş adam tezliklə xəbər gətirdi ki, quldurlar məskənlərini yiyəsiz qoyub, hansı bir tayfa üzərinə isə basqına getmişlər. Bunu eşidən kimi dərhal sınanmış və müharibə görmüş bir dəstə döyüşçü göndərdilər, onlar gedib quldurların məskən saldığı dağın keçidində pusquda dayandılar. Axşamüstü quldurlar çoxlu qənimətlə öz məskənlərinə qayıtdılar, qənimətləri yerbəyer edib, silahlarını açdılar, paltarlarını soyunaraq yatdılar. Onların başının üstünü alan birinci düşmən yuxu oldu. Gecədən xeyli keçdi.

Beyt

Günəşi bürüdü zil bir qaranlıq,
Guya ki, Yunisi udmuşdur balıq. [18]

Pusqudakı igidlər dərhal hücum edib quldurların qollarını bir–bir dallarına bağladılar, səhər açılan kimi şahın hüzuruna gətirdilər. Şah

quldurların hamısını öldürməyi əmr etdi. Onların içərisində ginc bir oğlan da var idi. Onun gül çöhrəsi bahar çəməni tək təzəcə çiçəklənir, gənc ömrünün həyat bağında ilk meyvələr yetişirdi. Vəzirlərdən birinin ona rəhmi kəldi, irəli çıxaraq şahın taxtı önündə təzim etdi və dedi:

– Bu gənc hələ həyat baqından meyvə dərməmiş, cavan ömrünün ləzzətini görməmişdir. Hökmdarın kəramət və səxavətinə arxalanaraq xahiş edirəm ki, şah onun qanından keçsin və bu qulunu minnətdar etsin.

Vəzirin bu sözündən xoşlanmayan şah hiddətləndi və dedi:

Beyt

Yaxşıdan ibrət götürməz, zati bəd, nacins olan,
Necə ki günbəz başında qoz dayanmaz heç zaman.

Belə yaramazların nəslini kəsib, dudmanlarını dağıtmaq lazımdır. Odu söndürüb qorunu saxlamaq, əfini öldürüb balasına rəhm etmək ağıllı iş deyildir.

Şer

Göylərdən yağsa da dirilik suyu,
Söyüd ağacında görməzsən səmər.
Alçaq adamlarla oturub durma,
Həsir qamışından alınmaz şəkər.

Vəzir şahın sözunü istər–istəməz təsdiq etdi, onun fikrinə afərin deyib əlavə etdi:

–Cahan hökmdarının buyurduqları həqiqətdir, yaramazlar içərisində tərbiyə alan, onların xasiyyətini də mənimsəyər. Lakin bu oqlan hələ uşaqdır və quldurların yaramaz sifətləri onda möhkəm təsir buraxa bilməz. Qulunuz ümid edir ki, əgər o, bundan sonra xeyirxah adamlar arasında tərbiyələnsə, gözəl xasiyyətlər qəbul edib, islah oluna bilər. Bir hədisdə deyilir ki, insan fitrətən pak doğulur, lakin sonra, ata–anasının tərbiyəsi ilə, ya yəhudi, ya xristian, ya da atəşpərəst olur.



Şer

Pislərə yar oldu Lutun arvadı
Ayrıldı peygəmbər xanədanından.
İtisə bir zaman Əshabi–kəhfin,
Yaxşılarla getdi oldu bir insan.[19]

Şahın yaxın adamlarından bir neçəsi də vəzirə qoşulub vasitəçilik etdilər. Nəhayət şah oğlanın günahından keçdi və dedi:

–Məsləhət bilmirəm, lakin bağışlayıram.

Şer

Zal bir gün söylədi oğlu Rüstəmə:[20]
«Biçarə və zəif sanma düşməni,
Çox gördük balaca çeşmənin suyu,
Güclənib apardı yüklü dəvəni».

Xülasə, oğlanı nazü nemətə çatdırıb, tərbiyəsini təcrübəli bir müəllimə tapşırdılar. Nəhayət oğlan natiqlik, hazırcavablılıq və saray qaydalarını dərindən öyrənib, hamısının rəğbətini qazandı.

Bir dəfə vəzir şahın hüzurunda oğlanın fəzilətləridən danışaraq dedi ki, ağıllı mürəbbilərin tərbiyəsi yaxşı nəticə vermiş, köhnə, yaramaz xasiyyətlərdən oğlanda əsər qalmamışdır.

Hökmdar vəzirin sözünə gülümsəyib dedi:

Şer

İnsanla qalmağa etsə də adət,
Qurd oğlu qurd olar, yenə, nəhayət.

Bu hadisədən bir–iki il keçdi. Oğlan bir dəstə yerli dələ–duzlarla dostlaşıb, onlarla yoldaşlıq etməyə başladı. Əvvəlki quldurluq xasiyyətləri onda yenidən baş qaldırdı. Nəhayət günlərin birində fürsət tapıb həmən vəziri, onun iki oğlunu öldürdü, evini soyub, var–dövlətini yığışdırdı, quldurların mağarasına qaçıb, atasının yerində oturdu və yol kəsməyə başladı. Padşah bu hadisədən xəbərdar olduqda təəssüflənib dedi:

Şer

İti şəmşir olmaz paslı dəmirdən,
Gözləmə nakəsdən adamlığı sən.
Yağışla sulansa bağ da, şoran da,
Bağda lalə bitər, şoranda tikan.

Şer

Şoranlıq bitirməz sünbül heç zaman
O yerdə zəhməti eyləmə hədər.
Pisə yaxşılıqla, yaxşıya pislik,
Mənaca bir şeydir, düşünsən əgər.

**5. Hekayət**

Oğulmuşun[21] sarayında çox ağıllı, düşüncəli və dərrakəli bir sərhəng oğlu var idi. Hələ uşaqlıq vaxtlarından alnında böyüklük nişanəsi parlardı.

Şer

Kəmalı ulduz tək başı üstə bax.
Parlardı hər yana işıq saçaraq.

Xülasə, oğlan həm yaraşıqlı idi, həm də ağıllı. Ona görə hökmdarın rəğbətini qazanmış və mənsəbə çatmışdır. Atalar doğru demişlər: «Dövlət malda deyil, kamaldadır, ağıl yaşda deyil, başdadır». Bir gün tay–tuşları oğlanın vəzifzsinə həsəd aparıb, onu xəyanətkarlıqda tzqsirləndirdilər, öldürülməsi üçün səy göstərdilər.

Misra

Düşmən nəçidir, dost, sənə qəmxar olsa.

Hökmdar oğlanı yanına çağırıb soruşdu: «Bunların sənə qarşı düşmənçiliyinin səbəbi nədir?». Oğlan dedi:



– Böyük hökmdarın mərhəmətilə, paxıllardan başqa hamını razı sala bilmişəm, paxıla gəldikdə o, mənim nemətdən, hökmdarın isə səadətdən məhrum olmasını istəyir.

Beyt

Bacararam bir ürəyə toxunmayım heç zaman,
Nə edim ki, paxıl özü öz qəlbini edir qan.
Öl ey paxıl, bəlkə canın rahat ola büsbütün,
Çünki səni yalnız ölüm qurtarar bu əzabdan.

Şer

Alçaqlar arzu edər ki, daim,
Dünyada olmasın bəxtəvər insan,
Gündüz yarasalar görmürsə əgər,
Bununçun varmıdır günəşdə nöqsan?
Kor olsun minlərlə qoy elə gözlər!
Günəşə çökməsin qaranlıq bir an.

**6. Hekayət**

Belə rəvayət edirlər ki, Əcəm[22] hökmdarlarından biri rəiyyətin var–yoxunu əlindən alıb, onlara əziyyət verməyə başladı. İş o yerə çatdı ki, xalq bu zülm və sitəmə davam gətirməyib başqa ölkələrə qaçmağa və qürbətdə yaşamağa məcbur oldu. Əhali əskildikcə ölkədə məhsul da azaldı, xəzinə boş qaldı. Bunu görən düşmənlər təzyiq göstərməyə başladılar.

Beyt

Kim müsibət günü istər ona bir yar olsun,
De ki, xoş gündə özü xalqa havadar olsun.
Qulağı halqalı qul, hörməti görməzsə gedər,
Lütf qıl, lütf sənə yadları da bir qul edər.

Bir gün onun hüzurunda «Şahnamə»[23] kitabından Zöhhakın[24] devrilməsi və Fridunun qələbəsi haqqındakı hissəni oxuyurdular.

Vəzir soruşdu:

– Heç bilmək olmur ki, xəzinəsi, mülkü və qüvvəsi olmaya–olmaya Fridun hökmdarlığı necə ələ ala bildi?

Hökmdar dedi:

–Məgər eşitmədinmi ki, camaat ona tərəfdar çıxıb, ətrafında sıx birləşmiş, taxt–tacı ələ gətirməsinə kömək etmişdir.

Vəzir dedi:

–Ey hökmdar, əgər camaatı ətrafında sıx birləşdirmək şahlağın əsasıdırsa, bəs nə üçün sən xalqı başından dağıdırsan? Məgər sən şahlıq etmək istəmirsən?

Beyt

Ordunu can kimi bəslə hər zaman,
Orduyla sayılar hər yerdə sultan.

Hökmdar dedi:

–Ordu və camaatı ətrafımızda birləşdirməyin şərti nədir? Vəzir dedi:

–Şah səxavətli olmalıdır ki, onun ətrafına toplansınlar; rəhmli olmalıdır ki, ondan qorxub qaçmasınlar; səndə isə bunların heç biri yoxdur.

Şer

Şahlara yaraşmaz zülm etmək bir an,
Qurddan ola bilməz sürüyə çoban.
Padişah zülm etsə xalqına əgər.
Özü öz mülkünü tar–mar edər.

Ağıllı vəzirin məsləhəti hökmdarın xoşuna gəlmədi, hiddətlənərək onu zindana göndərdi. Çox çəkmədi ki, hökmdarın əmoğlanları üsyan edib atalarının haqqını almaq üçün qoşun çəkdilər. Şahın zülm və sitəminə davam gətirməyən, vətənini tərk etmiş adamlar da qayıdıb onlara qoşuldular. Nəticədə hökmdar məğlub oldu və hökmdarlıq əmoğlanlarının əlinə keçdi.

Şer



Rəiyyətə zülm edərsə bir ağılsız hökmdar.
Düşmən bir gün edər onun ölkəsini tar–mar.
Rəiyyətlə sülh edən şah dəf edər hər afəti.
Adil şahın ləşkəridir çünki öz rəiyyəti.

**7. Hekayət**

Bir şah öz əcəm qulu ilə gəmiyə minmişdi. Demə qul ömründə gəmiyə minməmiş, dəniz səfərinin əziyyətini görməmiş imiş. O, qorxudan əsməyə və ucadan ağlamağa başladı. Gəmidəkilər nə qədər çalışdılarsa onu sakit edə bilmədilər. Qulun bu halı şahın kefini pozdu. Lakin bir çarə tapa bilmirdilər. Gəmidə müdrik bir adam var idi, vəziyyəti belə gördükdə dedi:

–İcazə versəniz, mən onu sakit edə bilərəm. Hökmdar dedi:

–Son dərəcə lütf göstərmiş olarsınız.

Əmr etdi qulu dənizə atdılar, Qul bir neçə dəfə suya batıb çıxdı; sonra saçlarından tutub onu gəmiyə tərəf dartdılar. O, iki əlli sükandan yapışıb sallandı və elə ki, gəmiyə çıxdı, susub dinməz, söyləməz birküncdə oturdu. Şaha bu qəribə gəldi, haman müdrik adamdan soruşdu ki, bunda nə hikmət var?

Dedi:

–Bu qul dənizdə qərq olmaq qorxusunu keçirmədiyindən gəmidəki əmin–amanlığın qədrini bilmirdi. O da məlumdur ki, fəlakətədüşməyən sakitliyin qədrini bilməz!

Şer

Ey tox, sənə xoş gəlməyir əgər arpa çörəyi,
Bil ki, sənə xoş gəlməyən bu şey mənə nemətdir.
Cənnət əhli bir cəhənnəm sanar ikən erafı,[25]
Cəhənnəmin əhli üçün eraf özü cənnətdir.

Beyt

Fərqi vardır: birisinin ağuşunda gözəl yar,
Digərinin iki gözü yolda qalmış intizar.

**8. Hekayət**

Hörmüzə dedilər: – Atanın vəzirləriidən nə xəta baş verib ki, onları həbs etdiribsən?

Dedi: – Elə bir xəta baş verməyib ki, həbsə səbəb olsun. Lakin gördüm, zəhmim onların ürəyinə elə çöküb ki, verdiyim vədlərə belə inanmırlar. Qorxdum canlarının qorxusundan canıma qəsd etsinlər. Ona görə də alimlərin sözürə əmal etdim. Alimlər deyiblər ki:

Şer

Kim səndən qorxursa, qıl ondan həzər,
Olsan da yüz elə şəxsə bərabər.
Pişik aciz qalsa, görmürsən, dərhal,
Pələngin gözünə atacaq çənkal.
İlan ona görə çalır çobanı
Ki, qorxur çomaqla alınsın canı.



**9. Hekayət**

Ərəb hökmdarlarından biri qocalıq vaxtında xastələnib, həyatdan ümidiyi kəsmişdi. Bu zaman bir atlı gəlib, xoş xəbər verərək dedi:

–Hökmdar sağ olsun, düşmənin qalasını dağıdıb başçılarını da əsir aldıq. Düşmənin camaatı və qoşunları hökmdarın bayrağı altına keçdilər.

Hökmdar kədərlə köksünü ötürüb dedi:

–Bu xoş xəbəri mənə yox, varislərimə ver!

Şer

Əziz ömür başa çatdı xoş arzular içində,
Dedim kaş ki, ürəyimdən gecən girsin qapımdan.
Ürəyimdən gecən gəldi, lakin ümid yoxdur ki,
Gecən ömür geri dönə, mən də olam kamran.

Şer

Köç təblini vurdu əcəl əlilə,
Ey gözlərim başa deyin: əlvida.
Ey əl, bilək və qol daha ayrılın.
Üzə, gözə, qaşa deyin: əlvida.
Düşmənlərin kamınça mən gedirəm,
Barı bu yoldaşa deyin: əlvida!
Mən nadan yaşadım dunyada, barı,
Dostum, sən xoş yaşa, deyin əlvida!

**10. Hekayət**

Dəməşq məscidində, Yəhya peyğəmbərin məqbərəsində olduğum zaman, ədalətsizlikdə şöhrət tapmış bir ərəb hökmdarı da təsadüfən oraya ziyarətə gəlmişdi. O, namaz qıldıqdan sonra dua oxuyub, allahdan köməkliklər istədi.

Beyt

Kasıb da, varlı da bu yerdə quldur.

Daha dövlətlisə, daha yoxsuldur.[26]

Sonra o, mənə müraciət edib dedi:

–Dərvişlərin mərhəmətli və sədaqətli olduğuna inandığıma görə, xahiş edirəm, mənə bir məsləhət verəsiniz, çünki güclü bir duşmən məni hədələyir. Cavabında dedim: – Gücsüz rəiyyətə rəhm elə ki, güclü düşməndən zülm görməyəsən!

Şer

İnsaf deyil, güclü ikən göstərərək zor, qüvvət.
Sındırasan bir yazığın pəncəsini nəhayət.
Qorxsun o kəs, biçarəyə rəhm etməyib zülm edə.
Yıxılanda kimsə ona hayan durmaz əl–əlbət.
Hər kim əkib «pislik» dəni, yaxşı məhsul gözləsə.
Xam xəyala düşmüş olar, boşa çıxar bu niyyət.
Qulağından pambığı at, ver bu xalqın haqqını.
Sən verməsən, gələr bir gün, haqqın istər rəiyyət.

Şer

Bir bədən üzvüdür bu bəni–adəm.
Eyni bir çövhərdən yaranmış aləm.
Bir üzvü dərdlərə salsa ruzigar.
Tutmaz başqa üzvü yerində qərar.
Özgənin dərdinə əgər qalmasan,
Yaraşmaz adına deyilsin insan.

**11. Hekayət**

Duası müstəcab olan bir dərviş Bağdad şəhərinə gəldi. Həccac Yusifə[27] xəbər verdilər, onu yanına çağırtdırıb dedi:

–Mənim üçün bir xeyir–dua ver!

Dedi:

–Ey allah, Həccacın canını al!

Həccac soruşdu:

–Allah xatirinə, bu necə duadır?

Dedi:



–Bu duanın həm sənə, həm də bütün müsəlmanlara xeyri vardır.

Şer

Məzlumlara zülm edən ey hökmran!
Nə vaxtadək sürəcəkdir bu dövran?!
Nə dörd əlli tutmusan bu dünyanı,
Birdəfəlik öl ki, mərdümazarsan.

**12.Hekayət**

Zalim hökmdarlardan biri, bir abiddən soruşdu:

–İbadətlərdən hansı yaxşıdır?

Dedi:

–Sənin üçün yarım günlük yuxu. Heç olmasa camaat yarım gün sənin əziyyətindən qurtarmış olar.

Şer

Gündüz gördüm yatıbdır bir zülmkar,
Bu fitnədir dedim, yatsa yaxşıdır.
Oyaqlıqdan yatması xoş olan kəs.
Birdəfəlik yerə batsa yaxşıdır.

**13. Hekayət**

Nəql edirlər ki, bütün gecəni eyş–işrətlə məşğul olan bir hakmdar səhərə yaxın məst halda deyirdi:

Bizim üçün bu dünyada bundan artıq dəm yoxdur.
Ki, yaxşı, pis şeylər üçün fikir yoxdur, qəm yoxdur.

Bayırda, şaxtalı havada çılpaq yatmış bir dərviş bunu eşidib dedi:

Beyt

Ey deyən dünyada, ən xoşböxt bizik,

Tutaq, sən qəmsizsən, biz də qəmsizik?

Dərvişin sözündən hökmdarın xoşu gəldi, ona min qızıl verməк istədi, pəncərədən qızıl kisəsini çıxarıb səslədi:

—Dərviş, ətəyini aç!

Dərviş dedi:

–Paltarım var ki, ətəyim olsun?!

Dərvişin belə yazıq vəziyyətini və zərif təbiətini görən hökmdarın ona həddən artıq rəhmi gəldi. O, qızıl kisəsinin üstünə bir xələt də qoyub, dərvişə verdi. Lakin çox çəkmədi ki, dərviş pulu xərclədi, xələti də satıb yedi və yenə bəxşiş ümidi ilə hökmdarın yanına qayıtdı.

Beyt

Azadə kəslərin əli boş olar,
Xəlbirdə su qalmaz, aşiqdə qərar.

Hökmdarın söz dinləməyə meyli olmadığı vaxt dərvişin gəldiyini ona xəbər verdilər. Hiddətlənib, qaşqabağını tökdü.

Buna görə ağıllı adamlar deyiblər ki, hökmdarların qəzəbindən ehtiyat etmək lazımdır. Çünki hökmdarlar ölkənin böyük məsələlərilə məşğul olduqlarından qara camaatın hayına qalmazlar.

Şer

Hər kim gozləməsə vaxtı, fürsəti,
Ona haram olar şahın neməti.
Hər zaman sözünün bil məqamını
Boş sözlə məhv etmə ehtiramını.

Hökmdar dedi:

– O qədər dövləti az bir vaxtda dağıdıb tələf edən bu həyasız, israfçı gədanı buradan qovun! Dövlət xalqın malıdır. Kömək yoxsullar üçündür, israfçılar üçün deyil.

Beyt



Axmaq əgər yandırarsa şamını gündüz çağı,
Gecə vaxtı şamsız qalar, zülmət olar otağı.

Ağıllı vəzirlərdən biri sözə qarışıb dedi: – Ey hökmdar, məncə belə adamlara xərcliyi az–az verməк yaxşıdır ki, birdən israf etməsinlər. Cəzalandırmaq məsələsinə gəldikdə isə, əmriniz onu tərbiyələndirmək məqsədilə olsa da, bəziləri bunu sizin səxavətsizliyinizə yozarlar. Bundan əlavə, ümidvar etdiyiniz adamı yenidən naümid edib könlünü sındırmaq kəramətinizə yaraşmaz.

Beyt

Tamahkara öz qapını çalış açma heç zaman,
Açdınsa bil, bir də onu bağlamaq olmaz asan.

Şer

Kim görmüş dünyada Hicaz[28] təşnəsi,
Şor suyun yanında yurd salıb yaşar?
Lakin harda şirin bir bulaq olsa,
İnsan, quş, qarınca ora toplaşar.

**14. Hekayət**

Keçmiş hökmdarlardan biri ölkəni idarə etmək işində bacarıqsız olub, qoşuna yaxşı fikir vermirdi. Gunlərin birində ölkəyə güclü bir düşmən basqın etdi. Əsgərlər hökmdardan üz döndərib, düşmənə qarşı vuruşmaqdan boyun qaçırdılar.

Beyt

Əsgərə xəzinə qıymasa sultan,
O da əl qılınca atmaz heç zaman.

Hökmdara sədaqətskzlik göstərənlərdən birisi mənimlə dost idi. Onu danlayıb dedim:

–İllər boyu xidmət etdiyin və nemətindən faydalandığın şəxsin vəziyyəti azacıq dəyişəndə ondan üz çevirmək – sədaqətsizlik, nan-

korluq və alçaqlıqdır.

Dostum dedi;

–İnsaf etsən, üzrümü qəbul edərsən, çünki atım arpasızlıqdan buxovda, çulu isə qonşu yanında girovda idi. Bir də ki, döyüşçüyə pulunu əsirgəyön hökmdara canı fəda etmək olmaz!

Beyt

Sən əsgərə qızıl versən, o düşmənə meydan açar,
Son qızılı əsirgəsən, baş götürüb uzaq qaçar.

Beyt

Əgər qarnı tox olarsa, hücum edər pəhlivan,
Əgər qarnı boş olarsa, geri qaçar durmadan.

**15. Hekayət**

Bir vəzir işdən çıxarılıb, saraydan qovuldu. O, tərkidünya olub, dərvişlərə qoşuldu. Az keçmədi ki, dərvişlərin söhbəti ona təsir etdi. O da hər cür qayğını unutdu,

Bir gün hökmdar yenidən ona mərhəmət göstərib, xidmətə çağırdı. O isə hökmdarın çağırışını rədd edib dedi:

–Ağıllı adamların əqidəsincə, səhrada qul olmaq, saraya qulluq etməkdən yaxşıdır.

Şer

Qənaət güncündə oturan kəslər,
Naəhlin və itin dilini kəsər.
Qələmi sındırıb kağız cıranlar,
Qeybətçi kəslərdən yaxa qurtarar.

Hökmdar israr etdi:

–Ölkənin işlərini layiqancə yerinə yetirmək üçün bizə ağıllı, istedadlı adam lazımdır.

Vəzir dedi:

–Ey hökmdar, ağıllılığın elə əsl əlaməti olur ki, bu kimi işləri



öhdənə götürməyəsən.

Beyt

Şərəflidir hüma quşu bütun quşlardan əlbət,
Sümük yeyir, çünki vermir bir canlıya əziyyət.

**Zərbülməsəl.**

Çölpişiyinə dedilər:

–Nə üçun həmişə şirin dalınca gəzirsən? Cavab verdi:

–Ovladığı şikarın tör–töküntüsünü yeyib, ac qarnımı doyurur və onun heybəti sayəsində özümü düşməndən qoruyuram.

Soruşdular:

–İndi ki, kölgəsində dolanır, nemətinə şükür edirsən, bəs nə üçün çox yaxınlaşmırsan ki, onun sədaqətli xadimləri sırasına gecəsən?

Dedi:

–Axı qəzəbindən də arxayın deyiləm.

Beyt

Yüz il atəşpərəst tonqal yandırar,
İçinə bir dəfə düşən tək yanar.

Saray xadimi bəzən qızıl alarsa, bəzən də baş verər.

Filosoflar demişlər:

–Hökmdarların daima dəyişilən xasiyyətlərindən qorxmaq lazımdır, çünki bəzən salamdan hiddətlənər, bəzən söyüşdən xoşlanıb xələt verərlər.

Bir də deyiblər ki, həddən artıq zarafat etmək nədimlər üçün hünər, alimlər üçün qüsurdur.

Beyt

Öz qədrini sən yaxşı bil, vüqarını vurma yerə,
Qoy mənasız zarafatlar qismət olsun nədimlərə.

**16. Hekayət**

Bir gün dostlarımdan biri yanıma gəlib həyatının uğursuzluğundan şikayətlənərək dedi:

– Ailəm çox, gəlirim yox, yoxsulluq dərdinə də tab gətirə bilmirəm. Dəfərlərə bu fikrə düşmüşəm ki, baş götürüb özgə vilayətə gedim, orada necə yaşasam, nə yaxşımı bilən olar, nə pisimi.

Beyt

Çox ac yatmış, lakin onu bilməmişdir bir insan,
Çox ölənin başı üstə tapılmamış ağlayan.

Yenə düşmənin tənəsindən qorxub düşünmüşəm ki, məni dalda lağa qoyarlar, ailəm haqqında göstərdiyim səyi namərdlik hesab edib deyərlər:

Şer

Bircə sən o nanəcibə nəzər sal,
Gülməyəcək bəxti onun üzünə,
Tək özünə asudəlik düşünür,
Ailəni salır çölün düzünə.

Sənə məlumdur ki, mühasibat elmindən azacıq başım çıxır. Əgər sənin hörmətin xatirinə mənə bir iş versələr, ürəyim rahat olar, nə qədər ömrüm var sənə minnətdar olaram.

Dedim:

– Qardaşım, şah sarayında xidmət etqməyin iki başı var: ümid və qorxu, yəni bir tərəfdən çörək, digər tərəfdən can qorxusu.

Çörək ümidilə canı qorxuya salmaq isə ağıllı adamdarın işi deyil.

Şer

Heç bir şeyi olmayana deməzlər,
«Torpaq və bağ vergisi ver darğaya»
Ya qüssəyə, qəmə, dərdə razı ol,
Ya da pay ver cigərini qarğaya.



Dostum israr etdi:

– Sözlərin istəyimə müvafiq, sualıma mütabiq olmadı. Yalnız xəyanətkarlar sorğu–sualdan qorxar.

Beyt

Düzlüyü çox sevər talei yazan,
Görmədim düz yolda yolunu azan.

Filosoflar demişlər: «Dörd adamın dörd adamdan xoşu gəlməz: quldurun – sultandan, oğrunun – qarovulçudan, əyyaşın – xəbərçidən və fahişənin – darğadan. Haqq–hesabı düz olanın hesab verməkdən nə qorxusu!».

Şer

Düşməni sən aciz etmək istəsən,
İşində heç israf eləmə zinhar.
Sən təmiz həyat sür, kimsədən qorxma,
Ki, daşa çırpılar natəmiz paltar.

Dedim:

–Sənin hekayətin tülkünün əhvalatına oxşayır. Bir gün gördülər ki, tülkü özünü itirmiş halda qaçır, özünü ora–bura vurur, gan yıxılır, gan durur. Bir nəfər soruşdu: «Nə olub ki, belə qorxuya düşübsən?» Tülkü dedi:

– Eşitmişəm ki, dəvəni biyara aparırlar.

Soruşan dedi:

–Ay axmaq, dəvə ilə sənin nə əlaqən, heç sən dəvəyə oxşayırsanmı?

Dedi:

–Sus, əgər paxıllar qərəzlə desələr ki, dəvədir, məni də tutub apararlar. Onda kim dərdimə qalıb, can yandıracaq və mənim tülkülüyümü sübut edəcək? Eşitməmişsən ki, deyiblər: «Tülkü tülkülüyün sübut edincə, dərisini boğazından çıxardarlar?!»

–Sən ağıllı, düz və etibarlı adamsan. Lakin paxıllar pusquda, düşmənlər isə küncdə gizlənmişlər. Onlar gözləyirlər ki, imkan tap-

caq sənin yaxşı sifətlərini şahın qarşısında pis qələmə versinlər və onun sənə qəzəbi tutsun. Belə bir hal baş verərsə, kimin danışmağa cürəti çatar ki, səni müdafiə etsin? Məsləhət görürəm ki, aza qənaət edib rəislik fikrindən daşınasan.

Beyt

Dənizdən çox xeyir olsa da hasil,
Şübhəsiz yaxşıdır yenə də sahil.

Dostum bu sözləri eşitcək hirsləndi, üzünü çevirib ağır sözlər deməyə başladı və dedi:

–Sən nə danışırsan, ağıllı, düşüncəli adam belə sözlər deyərmi? Atalar doğru demişlər: «Dost dar gündə bilinər, süfrə başında düşmən də dost görünər».

Şer

Ona dost demə ki, süfrə başında,
Deyə: «Qardaşın da, dostun da mənəm»
Ona dost deyərəm ki, çətin gündə,
Dostun arxasında dayana möhkəm.

Dostumun açıqlandığını və nəsihətimi qərəz sandığını gördükdə Sahib–divanın[29] yanına getdim. Çoxdan bəri yaxın olduğumuza görə dostumun əhvalını ona nağıl etdim, ləyaqətli, və sədaqətli olduğunu söylədim. Nəhayət, dostumu kiçik bir vəzifəyə təyin etdilər. Bir müddət həmin vəzifədə işlədikdən sonra düz və bacarıqlı olduğunu görüb bəyəndilər, daha yüksək bir vəzifəyə təyin etdilər. Beləliklə, getdikcə onun tale ulduzu yüksəldi, nəhayət istədiyi ən yüksək mərtəbəyə çatdı, hökmdarın rəğbətini qazanaraq onun ən yaxın xidmətçilərindən biri oldu. Kefinin köklüyündən xəbərdar olduqda sevinib dedim:

Beyt

Darıxma iş görünsə bir qaranlıq quyuda
Çünki qaranlıqdadır o dirilik suyu[30] da,



Beyt

Qardaşım, qəm çəkib etmə ahü–zar,
Allahın çox gizli mərhəməti var

Beyt

Zəmanə dərdindən çəkmə qəm, kədər,
Səbr acı olsa da, şirin bar verər.

Təsadüfən mən bir necə dostumla səfərə getməli oldum. Məkkədən qayıdanda həmin dostum məni qarşılamağa gəldi. Dərhal duydum ki, işdən çıxarıblar, Çünki dövlət adamları ancaq işdən çıxarıldıqları zaman dostu axtarmağa vaxt tapa bilərlər.

Şer

Vəzifə başında, baxt gülən zaman.
Dostların üzünə baxmaz bircə an.
Kasıblıq, çətinlik üz verən dəmdə.
Dostuna söyləyər dərdini haman.

Üzündə qəm nişanəsi qiyafəsində kədər ifadəsi görüb soruşdum ki, bu nə haldır?

Dedi:

–Necə ki, demişdin, elə də oldu. Bəzi adamlar paxıllıq edib, məni xəyanətkarlıqda ittiham etdilər. Hökmdar isə işin nə yerdə olduğunu aydınlaşdırmaq üçün səy köstərmədi. Qədimki dostlarım, səmimi yoldaşlarım da keçmiş sədaqəti unudaraq həqiqəti deməkdən çəkindilər.

Şer

Vəzifə başında olan kəslərə,
Hamı söyləyər: mərhəba, afərin,

Vəzifə başından salan tək fələk,
Başından basarlar, ürəklərdə kin,

Xülasə, cürbəcür işgəncələrə məruz qaldım. Nəhayət bu həftə həccə gedənlərin sağ–salamat qayıtmaları münasibətilə məni həbsdən azad etdilər və yalnız atadan qalan mirası geri verdilər.

Dedim:

–O zaman sözümü qəbul etmədin, hökmdarlara xidmət etmək dəniz səfəri kimidir, həm qorxusu var, həm faydası, ya xəzinə taparsan, ya dənizdə batarsan,

Beyt

Ya xacə bağrına basar simü zər,
Ya dəniz xacəni[31] bir gün qərq edər.

Bundan artıq onu danlamağı, yaralı könlünə duz səpib yenidən sızıldatmağı rəva germədim, sözümü bu iki beytlə müxtəsər etdim:

Şer

Bilmirdin, nəsihət dinləməyəndə,
Nəhayət ayağın düşəcək bəndə?
Əqrəb yuvasına barmaq uzatma,
Əgər ağrısına tab yoxsa səndə!

**17. Hekayət**

Dərvişlərdən bir neçəsi mənimlə dost idi. Onlar zahirən təmiz adamlar idilər. Buna görə də böyük mənsəb sahiblərindən biri onlara həddən artıq inanaraq, hərəsini bir vəzifəyə təyin etmişdi. Bir gün onların birindən dərvişə yaraşmayan bir hərəkət baş verdi, mənsəb sahibi hamımızdan şübhələnməyə başladı və beləliklə bazarımız kasadlaşdı. Yoldaşların işini bir təhər yenidən bərqərar etmək üçün mənsəb sahibinin yanına getdim. Qapıçı bəd üz göstörib əvvəlcə məni içəri buraxmadı. Mən onda günah görmədim. Çünki məsəl var deyərlər:



Şer

Əmirin, vəzirin və hökmdarın,
Səbəbsiz dolaşma ətrafında sən.
Dərban da, köpək də qəribi tutar.
Birisi yaxadan, biri ətəkdən.

Hökmdar mənim qapıda gözlədiyimi bilən kimi, dərhal məni içəri apartdırıb hörmətlə yuxarı başda yer göstərdi, lakin mən təvazökarlıqla aşağı başa keçib dedim:

Beyt

Nə olar qoy olum sənə bir bəndə,
Bəndələr səfində oturum mən də.

Dedi:

– Allah eləməsin, bu nə sözdür?

Beyt

Otursan gözlərim üzərində sən
Nazını çəkərəm ki, nazəninsən.

Xülasə, oturub hər tərəfdən danışdıq, nəhayət yoldaşların ağır yaşayışından söz açıb dedim.

Şer

Nə gördü bizdə ki, nemət verən beyük sultan,
Baxır qəzəblə bizə, dindirir məlamətlə.
Xuda uçün yaraşar lütfü mərhəmət daim,
Günah görəndə belə lütf edər kəramətlə.

Bu söz hökmdara çox xoş kəldi, dostlarımın maddi vəziyyətini

qabaqkı kimi bərpa etməyi, boş gecən günlərin də əmək haqqının verilməyini əmr etdi. Minnətdarlığımı bildirdim, vaxtını almağa cəsarət etdiyim üçün üzr istədim və təzim edərək çıxanda dedim:

Şer

Kəbə niyaz qibləsidir, ona görə əhali,
Ziyarətə gələr onu uzaq–uzaq yollardan
Sən də gərək çox dözəsən verdiyimiz zəhmətə,
Çünki barsız bir ağaca daş atmazlar heç zaman.

**18. Hekayət**

Bir şahzadəyə atasından çoxlu miras qaldı. O, əliaçıqlıq və səxavət göstərərək, əsirgəmədən qoşuna və camaata bəxşişlər verməyə başladı.

Beyt

İyləsən duymazsan ətrini udun,
Yananda ətrini duyarsan onun.
Böyüklük axtarsan, göstər səxavət,
Ki, toxum əkməsən almazsan nemət.

Bir gün nadan yoldaşlarından biri ona öyüd–nəsihət verib dedi:
–Keçmiş hökmdarlar bu qədər mal–dövləti səy, zəhmətlə toplayıb yaman gün üçün yığmışlar. Bilməlisən ki, qabaqda bir çox hadisələr gözlənir, arxada isə düşmənlər gizləiir. Bu qədər israf düzgün deyildir, çünki lazım olan vaxtda pula əl çatmaz.

Şer

Xəzinə bəxş etsən rəiyyətə sən,
Hər kəndə pay düşər bir düyü qədər.
Hər kəsdən bir arpa gümüş toplasan,
Payına hər gün bir xəzinə düşər.

Bu söz şahzadənin xoşuna gəlmədi, ona acıqlanıb dedi:



–Allah bu mal–dövləti ona görə mənə veribdir ki, həm özüm yeyəm, həm də başqalarına bağışlayam, nainki gözətçi olub qoruyam.

Beyt

Böyüklük istəsən xalqa bəxşiş ver,
Sən, toxum səpməsən nə bitirər yer?

Beyt

Qarun[32] belə qırx xəznədə verdi can,
Yaxşı adla yaşadı Nuşirəvan.

**19. Hekayət**

Nağıl edirlər ki, bir gün ədaləti Ənuşirəvan üçün ovlaqda kabab bişirirdilər, lakin duz yox idi. Duz üçün kəndə bir adam göndərmək lazım gəldi. Nuşirəvan ona dedi:
–Duzu zorla deyil, pulla al ki, kənd xaraba qalmasın.
Soruşdular:
–Azacıq duzla kənd neçə xaraba qalar?
Ənuşirəvan cavab verdi:
–Zülm dünyada əvvəlcə az idi, sonra hər gələn ona bir az artırdı, nəhayət, indiki həddə gəlib çatdı.

Şer

Şah rəiyyət bağından bir alma dərsə həmən,
Nökərləri çıxarar ağacları kökündən.
Beş yumurta alıb şah zülm eyləyən zamanda,
Qoşunu min toyuğu şişə çəkər bir anda.

**20. Hekayət**

Eşitmişəm ki, nadan bir vəzir sultanın xəzinəsini doldurmaq üçün camaatın var–dövlətini əlindən alarmış. Görünür o, ataların bu

sözündən xəbərsizmiş:

– Hər kim xalqa zülm edib böyük və əziz allaha asi olsa, allah da həmin xalqı onun üzərinə qaldırıb, kökünü yer üzündən kəsər.

Beyt

Atəşdən daha da bətər yandırar,
Məzlumun ürəkdən çəkdiyi ahlar.

Deyirlər heyvanların ən əzəmətlisi şir, ən alçağı eşşəkdir, lakin hamı təsdiq edər ki, yük daşıyan eşşək, adam öldürən şirdən yaxşıdır.

Şer

Eşşək ki, deyirlər çox natəmizdir,
Yük çəkir, bununçun xalqa əzizdir.
Zəhmətkeş öküzlə, yük çəkən eşşək,
Bədxah insanlardan yaxşıdır bişək.

Yenə nadan vəzirin nağılına qayıdaq. Təsadüfən sultan vəzirin bəzi yaramaz işlərindən xəbərdar oldu. Elə bilmə ki, qan yerdə qalar. Sultan vəziri cəzalandırıb cürbəcür əziyyətlərlə öldürtdü.

Şer

Soltanın istəyi yerinə yetməz,
Xalqının halına qalmasa əgər,
İstərsən ki allah səni ucaltsın,
Allahın xalqına mərhəmət göstər.

–Belə deyirlər ki, sitəmdidələrdən biri vəzirin başı üstünə gəlib, ona neçə cəza verildiyini müşahidə edib deyirdi:

Şer

Bəzi arxalanıb öz qol gücünə,
Xalqın var–yoxunu əlindən alar.
Lakin udulsa da sivri bir sümük,



Göbəkdə bənd alıb, qarnı parçalar.

**Beyt**

Xalqına zülm edən zalım dünyada,
Həmişə lənətlə salınar yada.

**21. Hekayət**

Nağıl edirlər ki, bir mərdümazar hərbçi, rəhmdil bir dərvişin başına daş vurdu. Dərviş intiqam ala bilmədiyi üçün daşı götürüb saxladı. Bir gün hökmdar haman hərbçiyə qəzəblənərək onu quyuya saldı. Dərviş quyunun başına gəlib saxladığı daşı onun başına çırpdı. Hərbçi soruşdu:

–Sən kimsən, məni niyə daşla vurursan?

Dərviş dedi:

–Mən haman adamam ki, bu daşı sən filan tarixdə mənim başıma vurmuşdun.

–İndiyə qədər bəs haradaydın?

–Xidmətdə olduğun zaman hiddətindən qorxurdum. İndi isə səni quyuda görüb, acığımı çıxmağa fürsət tapdım.

Şer

Hər əclafa olsa əgər bəxti yar,
Fazil adam sükut edər ixtiyar.
Yoxundursa iti dırnaq və pəncən,
Vəhşilərlə heç vuruşa girmə sən.
Hər kim polad qola dursa müqabil,
O, öz lətif qollarını əzər, bil.
Gözlə, fələk onu yıxan zamanda,
Dost kamınça əz başını bir anda.

**22. Hekayət**

Keçmiş hökmdarlardan biri elə bir dərdə düşdü ki, adını çəkməsək yaxşıdır. Bütün həkimlər belə nəticəyə gəldilər ki, bu dərdin dərmanı ancaq filan xasiyyətlərə malik adamın ödü ola bilər.

Hökmdar belə adamı tapmağı əmr etdi. Bir kəndli oğlunu tapdılar ki, həkimlərin dediyi xasiyyətlərin hamısı onda var idi. Hökmdar oğlanın atasını cağırtdırdı. Çoxlu mal və pul verib onları razı saldı. Qazı da şərən hökm verdi ki, hökmdarın sağlamlığını qorumaq üçün bir kəndlini öldürmək olar. Nəhayət cəllad hazır olub oğlanın başını kəsmək istədi. Oğlan gülümsəyərək başını göyə qaldırıb, nə isə dodaqaltı danışmağa başladı. Hökmdar oğlandan nə üçün güldüyünü soruşdu. Oğlan dedi:

–Ey hökmdar, övlad ata–anasına arxalanar, şikayətçi qazı yanına gedər, hökmdardan aman dilərlər. İndi ata–anam məni dünya malına satıb, cəllad əlinə verdi, qazı ölüm hökmünü yazdı, hökmdar isə öz səlamətliyini mənim ölümümdə gördü. Əziz və böyük allahdan başqa mənim heç bir pənahım yoxdur.

Beyt

Mən kimə eyləyim səndən şikayət,
Özün bax dərdimə, göstər ədalət.

Hökmdar oğlanın sözündən mütəəssir olub, gözü yaşardı, dedi:

–Bir günahsızın qanını tökməkdənsə, mənim həlak olmağım yaxşıdır.

Sonra oğlanı bağrına basıb, üz–kozündən öpdü, saysız–hesabsız bəxşiş verib azad etdi. Deyirlər ki, hökmdar haman həftə içərisində xəstəlikdən şəfa tapdı.

Şer

Nil çayının sahiliidə bir filban,
Əhaliyə söyləyirdi bir zaman:
«Ayağının altda nəsə qarınca,
Sən də osan fid ayağı altında».

**23. Hekayət**

Əmr Leysin[33] qullarından biri qaçmışdı, dalınca adam saldılar. Nəhayət, onu tapıb gətirdilər. Vəzirin ona qarşı ədavəti vardı. «Başqa qullar ibrət alıb, qaçmasınlar» – deyə o, qulu öldürmək üçün göstəriş verdi. Yazıq qul Əmr Leysə baş əyib dedi:



Beyt

Qəbuldur xoşuna gələn dərdü qəm,
Fərman səninkidir, aciz bəndənəm.

Sonra sözünə davam edib dedi:

–Lakin bu xanədanın çörəyi ilə böyüdüyümə görə, istəmirəm ki, nahaq qanım boynunuzda qalsın. İcazə verin mən bu vəziri öldürüm, siz də onun qanın almaq üçün məni öldürün. Beləliklə, tökdüyünüz qan nahaq olmasın.

Qulun sözü hökmdarın xoşuna gəldi, gülüb vəzirə dedi:

–Necə məsləhət görürsən? Vəzir dedi: .

–Ey böyük hökmdar, sizi and verirəm rəhmətlik atanızın qəb–rinə, bu həyasızı azad edin, yoxsa məni də bəlayə salar.

Şer

Sapandlı adamla vuruşsan əgər,
Başına daima sənin daş gələr.
Düşmənə bircə ox atsan əgər sən,
Canını hədəf tək oxlayar düşmən.

**24. Hekayət**

Zəvzən[34] padşahının alicənab və xeyirxah bir xacəsi vardı, zahirdə hamıya hörmət edər, arxada hamının xeyrinə danışardı. Bir gün təsadüfən onun hansı hərəkətisə şahın xoşuna gəlmədi, əmr elədi ki, malını müsadirə edib, özünə cəza versinlər. Lakin ona əzab verəsi olan şah məmurları xacənin əvvəlki yaxşılığını unutmamış, çox şeydə ona borclu olduqlarını yaddan çıxarmamışdılar. Ona görə zəmanət müddətində döyüb əziyyət verməyi, incidib məşəqqət etməyi rəva görmədilər. Xoş dindirib, mülayim rəftar etdilər.

Beyt

İstəsən düşmən ola sülhdə daim sən ilə.
Dalda da eyb desə, üzdə onu təhsin et.
Söz ki, axırda ağızdan çıxacaq əğyarın,
Sözün acı diləməzsən dilini şirin et.

O, şahın ittihamlarının bəzisini rədd edə bildi, lakin yerdə qalanları üçün həbsdə oturmalı oldu. Qonşu şahlardan birisi ona gizli məktub göndərdi ki, sizin ölkənin şahı sənin kimi böyük bir şəxsiyyətin qədrini bilməyib hörmətsizlik etdi, bu bizə çox ağır gəldi. Əgər siz alicənabın (allah aqabətinizi xeyr etsin) lütf edib bizim tərəflərə gəlməyə rəyi olsa, xatiri hər nə istəsə yerinə yetiriləcəkdir. Bizim ölkənin əyan və əşrafı cavabınızı gözləyir və sizi görməyi qəlbdən arzu edirlər.

Xacə məktubu alcaq qorxuya düşdü, aqibəti düşündü və dərhal elə bir cavab yazdı ki, ələ keçsə ziyanı dəyməsin.

Yaxın adamlardan biri bundan xəbər tutub şaha dedi ki, həbs buyurduğun filan adam qonşu şahlarla yazışır.

Şah qəzəblənib məktubu ələ keçirməyi əmr etdi. Qasidi tutub məktubu oxudular. Yazılmışdı: «Ali zatınızın bizə verdiyi qiymət layiq olduğumuzdan çoxdur, buyurduqları təklifə gəldikdə isə, onu qəbul etmək bəndənizə müyəssər olmayacaqdır, çünki, mən bu xanədanın nemətilə tərbiyə almışam, balaca bir məzəmmət üstündə öz nemət sahibinə vəfasızlıq etmək olmaz, necə ki, deyiblər:

Beyt

Haqqında kərəm etsə sənin əhli–nəcabət,
Bir ömr səni incidə məzur hesab et.

Xacənin haqşünaslığı şahın xoşuna, gəldi, ənam verdi, xələt bağışladı, üzr istəyib dedi: «Səhv etmişəm, nahaq səni incitmişəm!»

Xacə dedi: – Ey yer üzünün şahı, mən burada sizdə bir səhv görmürəm, qəzanın əmri belə imiş, gərək mənim başıma bu iş gələymiş yaxşı ki, bu sizin əlinizlə oldu, çünki sizin mənim boynumda haqqınız vardır.

Şer



Xalqdan bilmə əgər zəhmətə düşdünsə bir az,
Çünki xalqdan nə əziyyət, nə fərağət olmaz.
Düşməni, dostu xilafda yaşadan allahdır,
Onların qəlbinə hakrm də haman allahdır,
Doğrudur ki, hədəfə atsa kaman hər tiri,
Bilik əhli, ox atanda görəcək təqsiri.

**25. Hekayət**

Bir əcəm şahı haqqında eşitmişəm ki, öz yaxın adamlarına belə deyirmiş:

– Filankəsin maaşını ikiqat artırın, çünki o işə yanandır, əmrə baxandır; başqaları isə eyş–işrətə alüdə olub xidmət göstərməkdə kanallıq edirlər. Ariflərdən biri bunu eşitdi, dərindən bir ah çəkdi. Dedilər: «Nə oldu?»

Dedi: – Bəndələrin allah dərgahındakı mənzələsi də belədir.

Şer

İki səhər gedərsə şah yanına bir nəfər,
Üçüncü gün yenə də şahdan mərhəmət görər.
Ümid vardır dərgandan qayıtmazlar naümid,
Allahına ixlasla ibadət eyləyənlər.

Şer

Böyüklük fərmanı qəbulda olar,
Fərmanı tərk edən çox tez qovular.
Hər bir kəs düzlüyə eyləsə adət,
Tapar xidmətində böyük səadət.

**26. Hekayət**

Nağıl edirlər ki, zalım bir hakim zorla yoxsulların odununu ucuz qiymətə alıb, güclə varlılara baha qiymətə satarmış. Ariflərdən biri onun haqqında belə demişdir:

Beyt

İlansanmı, kimi görsən tez çalırsan onu sən,
Ya bayquşsan harda olsan dağıdırsan təməldən?!

Şer

Əgər gücün çatırsa da bizlərə,
Çata bilməz qadir, böyük allaha.
Yer əhlinə sən belə zor göstərmə.
Ta köylərə yüksəlməsin bəd dua.

Hakim bunu eşitdikdə qəzəblənib haman adamı cəzalandırdı. Bir gecə mətbəxdən qığılcım keçib odun anbarına düşdü. Hakimin bütün var–dövləti yandı. Onun rahat otağı kül yatağına döndü. Təsadüfən həmin şəxs oradan keçirdi. Gördü ki, hakim yaxın adamlarına deyir:

− Bilmirəm bu od mənim sarayıma haradan düşdü? Arif adam dedi:

–Yoxsulların ürəyindən yüksələn ahın odundan.

Şer

Yaralı ürəkdən sən qorx hər zaman,
Ki, yara nəhayət olacaq əyan.
Toxunma ürəyə, ona əl vurma,
Unutma, bir ahla dağılar cahan..

Deyirlər ki, Keyxosrovun[35] tacında yazılmışdı:

Şer

Uzun illər, ömrlər, gəlib gecər dünyadan,
Tökülər üstümüzə torpağı çox ellərin.
Babalardan bizlərə qalan bağlar, binalar,
Gecəcəkdir əlinə gələcək nəsillərin.



**27. Hekayət**

Bir adam güləşməkdə şöhrət tapmışdı. O, üç yüz altmış fənd bilir, gündə bir fəndlə güləşirdi. Şagirdlərindən birinə hüsn–rəğbət bəslədiyinə görə ona üç yüz əlli doqquz fənd eyrətdi. Ancaq bir fəndi cürbəcür bəhanələrlə geri salır, öyrətmirdi. Xülasə, oğlan gücdə, ustalıqda elə məşhur oldu ki, onun qabağında heç kim dayana bilmədi. Hətta iş o yerə çatdı ki, o, bir gün hökmdar hüzurunda lovğalanaraq dedi:

– Ustam ona görə məndən üstündür ki, həm böyük, həm də mürəbbimdir. Yoxsa mən gücdə ondan əskik deyiləm, ustalıqda da ona bərabərəm.

Bu söz hökmdarın xoşuna gəlmədi. Əmr etdi, usta ilə şakird güləşsinlər. Hündür bir yer düzəltdilər, dövlət başçıları, saray xadimləri və ölkə pəhlavanları toplandılar. Oğlan qızmış bir fil kimi elə bir heybətlə meydana çıxdı ki, qabağında qurğuşun dağ olsaydı yerindən qopardı. Usta başa düşdü ki, şagirdi gücdə ondan üstündür. Ona görə gizli saxladığı fəndlə şagirdi ilə güləşməyə başladı. Oğlan ona girişə bilməyib hirsləndi. Usta onu başı üstə qaldırıb yerə vurdu. Camaat içərisində hay–küy qopdu. Hökmdar ustaya xələt, bəxşiş verməyi əmr elədi. Sonra oğlana acıqlanıb danladı ki, öz ustadına vəfasız çıxdın və etdiyin iddianı da başa çatdıra bilmədin.

Oğlan dedi:

–Ey hökmdar, o, pəhləvanlıqda mənə üstün gələ bilməzdi, bəlkə həyatı boyu məndən gizlətdiyi fənddən istifadə edib qələbə çaldı.

Hökmdar dedi:

–Deməк, həmin fəndi belə bir gün üçün gizlədibmiş, zirək adamlar demişlər: «Dostu o qədər gücləndirmə ki, düşmənçilik fikrinə düşdükdə bir şey edə bilsin!». Eşitməmisənmi öz şagirdindən cəfa görmüş bir mürəbbi nə deyibdir?

Şer

Ya vəfa olmamış özü dünyada,
Ya onu heç kəsə etmir zəmanə.
Kimə öyrətdimsə ox atmağı mən,
Axırda qəlbimi etdi nişanə.

**28. Hekayət**

Tərki–dünya bir dərviş səhrada tənha bir guşədə oturmuşdu. Bir padşahın yolu onun yanından düşdü. Qənaət mülkündə əyləşən dərviş əsla ona etina etmədi. Böyüklər adətincö hökmdar bu etinasızlıqdan hiddətlənib dedi:

–Bu cındır keyinən tayfa eynən heyvan kimi şeydir, nə ünsiyyət bilir, nə insaniyyət.

Vəzir dərvişə yaxınlaşıb soruşdu:

–Ey qoca, dünya hökmdarı sənin yanından keçir, nə üçün baş əyib nəzakət qaydalarını yerinə yetirmirsən?

Dərviş dedi:

–Hökmdara de ki, xidməti o adamdan umsun ki, onun şahdan bir gözətləməsi olsun. Onu da bilməlisən ki, hökmdar rəiyyəti qorumaq üçündür, nəinki rəiyyət əl bağlayıb, onun qabağında qurumaq üçün.

Şer

Padşah yoxsulun pasibanıdır,
Nə qədər olsa da güclü hökmran.
Qoyunlar çobanın malı deyildir,
Qoyuna baxmaqçın qoyulur çoban.

Şer

Birisi olmuşdur bu gün namdar
Başqası döyüşdə edir ahü zar.
Sən bir an səbr eylə ta ki, bu torpaq,
Udaraq onları etsin tar–mar.
O zaman fərqlər qalxar aradan,
Bilinməz kim quldur, kimdir hökmdar,
Kim açsa ölünün qəbrini bilməz,
Bu yatan fəqirdir, ya da bir kübar.

Hökmdar dərvişin doğru sözünü bəyənib dedi:

–Məndən bir şey tələb et!

Dedi:

–Ey hökmdar, səndən tələbim budur ki, bundan artıq mənə



əziyyət verməyəsən!

Hökmdar dedi:

–Mənə bir nəsihət ver! Dedi:

Şer

Qədrini bil əldə var ikən nemət.
Ki, əl–əl dolanır bu mal, bu dövlət

**29. Hekayət**

Bir vəzir Zünnuni Misrinin[36] yanına gedərək dedi: – Mənə bir xeyir–dua verin, gecə–gündüz şah xidmətində qulluq edirəm, buna baxmayaraq əziyyət verməyəcəyindən arxayın deyiləm.

Zünnun ağlayıb dedi: – Sən sultandan qorxduğun qədər mən allahdan qorxsaydım, onun ən sadiq adamları mövqeyinə qalxmış olardım.

Şer

Rahatlıq, əziyyət, ümid və qorxu,
Olmasa yoxsulun nə dərdi vardı?!
Allahdan çəkinib qorxsaydı vəzir,
Şahdan çox hörmətə layiq olardı.

**30. Hekayət**

Bir padşah günahsız bir adamın öldürülməsini əmr etdi, günahsız dedi:

– Ey hökmdar, mənə qəzəblənib özünə ziyan vurma, çünki cəza bir anda qurtarar, qanım isə əbədi olaraq sənin boynunda qalar.

Şer

Acılıq, şirinlik və yaxşı, yaman,
Səhrada külək tək keçdi durmadan.
Sitəmkar sandı ki, zülm etdi bizə,
Biz dözdük, günaha batdı o nadan,

Hökmdar onun nəsihətini bəyənib, ölümündən vaz keçdi.



**31. Hekayət**

Bir dəfə Nuşirəvanla vəzirləri mühüm bir məsələni müzakirə edirdilər və hərəsi öz fikrini deyirdi. Şah da bir fikir dedi. Bozorcmehr də şahın fikrinə qoşuldu. Gizlində Bozorcmehrə dedilər:

–Şahın fikrində nə məziyyət gördün ki, onu bu qədər ağıllı adamların sözündən üstün tutdun?

Dedi:

– İşin axırı məlum deyil, heç kəs də bilmir ki, kimin fikri doğru çıxacaq, kiminki yalan. Ona görə şahın rəyinə qoşuldum ki, düz çıxmasa tərəfini saxladığım üçün qəzəbindən azad olam.

Şer

Kim şahın sözündə çıxartsa yalan,
Yazar öz qətlinə əlilə fərman.
Gündüzə gecədir desə şah əgər,
Kərəkdir desinlər budur ay, ülkər.

**32. Hekayət**

Bir fırıldaqçı saçlarını dərviş kimi hörərək həccdən gələnlərə qoşulub bir şəhərə daxil oldu. O, hacılarla birlikdə saraya gedib yazdığı bir qəsidəni hökmdara təqdim etdi. Hökmdar başqa şairlər kimi onu da qəbul etdi, hörmət göstərib, çoxlu bəxşiş verdi. Təsadüfən hökmdarın həmən il dəniz səfərindən qayıtmış yaxın adamlarından biri hiyləgər dərvişi görüb dedi:

–Mən bu adamı qurban bayramı günü Bəsrədə[37] görmüşəm. Məlum oldu ki, o hacı deyildir.

Başqa birisi dedi:

–Onun atası Mələtiyyə[38] şəhəri xristianlarındandır, bəs bu cənab necə seyid ola bilər?"

Oxuduğu şeri də Ənvərinin[39] divanında tapdılar. Hökmdar onu bu qədər yalan danışdığına görə döyüb qovmağı əmr etdi. O isə yalvarıb dedi:

–Böyük hökmdar, icazə ver bir söz də deyim, doğru olmasa, nə cəza versəniz layiqəm.

Hökmdar dedi:

–Nə söz deyəcəksən? Dedi:

Şer

Sənə qatıq versə bir qərib əgər,
İki qab su olar, bir çömçə ayran.
Düzünü istəsən, ərz edim sizə,
Dünya görmüşlər də çox deyər yalan.

Hökmdarı gülmək tutub dedi:
–Ömründə bundan doğru söz deməmisən. Sonra əmr etdi hər nə istəyirsə ona verib xoşluqla yola salsınlar.

**33. Hekayət**

Nağıl edirlər ki, öz tabelərinə rəhm edən və yoldaşlarına xeyirxahlıq göstərən bir vəzir var idi. Təsadüfən bir gün hökmdarın qəzəbinə məruz qaldı. Dostları onu qurtarmağa çalışdılar, cəza məmurları mülayimliklə rəftar etdilər, mənsəb sahibləri isə hər yerdə onun yaxşı xasiyyətlərindən danışdılar. Nəhayət hökmdar onun təqsirindən keçdi. Arif bir şəxs bu hadisədən xəbərdar olub dedi:

Şer

Dostların qəlbini qazanmaq üçün,
Ata bostanını satsan yaxşıdır.
Xeyirxah insanın işi uğrunda,
Var–yoxun sonuna çatsan yaxşıdır.
Hətta pislərə də yaxşılıq elə,
İtə də bir sümük atsan yaxşıdır.

**34. Hekayət**

Harunərrəşidin oğlanlarından biri hirslənmiş halda atasının yanına gəlib dedi ki, filan sərhənkin oğlu anamı söydü. Harun dövlət başçılarından soruşdu:
–Belə adamın cəzası nədir?
Biri öldürməyi, dikəri dilini kəsməyi, üçüncüsü isə qovmağı



məsləhət gördü. Harun isə oğduna müraciət edib dedi:
–Oğlum, mərdlik odur ki, bağışlayasan. Bağışlaya bilməsən, sən də onun anasını söy, lakin elə etmə ki, intiqam həddini aşsın, çünki belə olduqda biz müttəhim olarıq, o, müddəi.

Şer

O adam, mərd deyil aqil yanında,
Ki, qızmış fillərə oxuya meydan.
Bəli, mərd odur ki, düzlüyü sevə,
Acıqlı zamanda deməyə hədyan.

Şer

Bir nadan, alimə eyib tutanda,
O dözüb dedi: ey nöqsan göstərən!
Çalışıb məndə çox nöqsan axtarma,
Mən qədər bilməzsən nöqsanımı sən.

**35. Hekayət**

Bir necə böyük şəxslərlə gəmidə oturmuşduq ki, birdən arxadan gələn bir ğayığın çevrildiyini gördük. İçindəki iki qardaş burulğana düşdü. Böyüklərdən biri gəmiçiyə dedi:
–Onların hər ikisini xilas et, hərəsi üçün sənə əlli dinar verərəm. Gəmiçi dərhal suya atılıb qardaşlardan birini xilas etdi. O biri isə boğuldu.
Mən dedim:
O biri qardaşın əcəli çatmışdı, buna görə də gəmiçi onu tuta bilməyib, bunu xilas etdi. Gəmiçi güldü və dedi:
–Orası elədir, ancaq birincini qurtarmağa mən özüm artıq səy göstərdim, çünki bir dəfə biyabanda piyada qaldığım vaxt o məni dəvəyə mindirib xilas etmişdi, o biri qardaşdan isə uşaqlıqda qamçı yemişəm.
Dedim:
–Allah düzgün buyurubdur: «Yaxşılıq etsən də özünə qayıdar, pislik etsən də».

Şer

Bacardıqca heç bir qəlbə toxunma,
Ki, bu yolda, unutma, var çox tikan,
Yoxsulların hayına qal, sənin də,
Başqasına işin düşər bir zaman.

**36. Hekayət**

İki qardaş var idi, biri şah sarayında xidmət edər, o, birisi isə öz zəhmətilə çörək yeyərdi. Bir gün varlı qardaş yoxsul qardaşa

–Nə üçün şaha qulluq etmirsən ki, canını əziyyətdən qurtarasan?

Qardaşı dedi:

–Bəs sən nə üçün işləmirsən ki, qulluq fəlakətindən xilas olasan? Ağıllı adamlar demişlər ki, kəmərə qızıl qılınc bağlayıb qul kimi durmaqdansa, öz yavan çörəyini yeyib evdə oturmaq yaxşıdır.

Beyt

İsti, qaynar əhəngi sən əllərinlə yoğursan,
Xoşdur əli döşə qoyub şah önündə durmaqdan

Şer

Qiymətli ömrümüz buna sərf oldu,
Ki, yayda nə yeyim, qışda nə geyim?
Ey qarın, bir parça çörəyə döz ki,
Qulluqda ikiqat olmasın belim!

**37. Hekayət**

Bir adam ədalətli Ənuşirəvanın yanına gedib, xoş bir xəbər apardı:

–Deyirlər ki, allah sənin filan düşmənini aradan götürdü: Ənuşirəvan cavab verdi: – Məni öz yerimdə saxlayacaqmı?

Şer



Düşmən ölümünə olmaram dilşad.
Bizə də əbədi deyildir həyat.

### 38. Hekayət

Bir gün Kəsranın[40] hüzurunda bir necə alim yığışıb məsləhətləşdilər. Onların başçısı Bozorcmehr də orada idi. Lakin susur, bir kəlmə də danışmırdı. Sükutunun səbəbini soruşduqda o belə cavab verdi:

–Həkim yalnız xəstəyə dərman verər. Görürəm siz sağlam məsləhət verirsiniz, odur ki, mənim danışmağıma ehtiyac yoxdur. Sözü təkrar etmək ağıllı adamlara yaraşmaz.

Şer

Əgər iş səs–küysüz düzəlirsə, mən,
Qaçaram dil açıb bir söz deməkdən.
Korun qarşısında görsəm quyu var,
Bu zaman dinməsəm, çox günah olar.

### 39. Hekayət

Harunərrəşid[41] Misir ölkəsini aldıqdan sonra demişdi:

–Misirdə allahlıq iddiasında olan bu tüğyançıların acığına bu ölkəni qullarımdan ən alçağına tapşıracağam. Onun həddən artıq yaramaz bir zəncisi var imiş. Harun Misrin hökmdarlığını həmin zənciyə tapşırdı. Deyirlər ki, zənci o qədər ağılsız imiş ki, bir gün Misir əkinçiləri onun yanına şikayətə gəlib, Nilin ətrafında əkdikləri pambığın vaxtsız yağmurdan tələf olduğunu söylədikdə, o demişdi:

–Yun əkəydiniz..

Şer

Biliklə artsaydı insanın varı,
Acından ölərdi aləmdə nadan.
Qanmaza o qədər dövlət çatır ki,
Qalır bu əmələ yüz alim heyran.

Şer

Biliklə tapılmaz bəxtü səadət,



Göylərin əmrilə verilir qismət.
Dünyada hesabsız, bədbəxt, yazıq var,
Alçaqlar hörmətli, aqil isə xar.
Kimyagər evdə ölür acından,
Tapır xərabədə xəzinə nadan.

### 40. Hekayət

Şahlardan birinə bir çinli kənizi gətirdilər; məst halda ona yaxınlıq etmək istədi. Qız mane olub müqavimət göstərməyə başladı. Şah qəzəblənib onu qara bir qula bağışladı. Qulun üst dodağı burun pərələrini aşır, alt dodağı döşünə düşürdü. Elə bədheykəl idi ki, Səxr cinni[42] onu görsəydi uzaqdan qaçardı, qoltuğunun altında da çox üfunətli bir iy vardı.

Beyt

Əbədi tapmışdı dünyada ikmal
Onda eybəcərlik, Yusifdə camal.

Şer

Belə çirkin yaranıbmı, görəsən, bir insan,
Onu təsvirə ola dildə, qələmdə imkan.
Qucağı, üzdən iraq, bir qatı murdardır ki,
Onu mordad[43] günəşi pak edə bilməz bir an.

Deyirlər ki, bu zaman qara qulun şəhvəti çoşmuş, gözü qızmış, nəfsini saxlaya bilməyib qızın bəkarətini almışdı. Sabahısı gün şah qızı axtardı, tapa bilmədi. Əhvalatı danışdılar, qan bışına vurdu, əmr etdi qul ilə qızı bir–birinə bağlayıb qalanın kəlləsindən dərənin dibinə atsınlar.

Xeyirxah vəzirlərdən biri baş əyib təzim etdi və dedi:

–Şahın ömrü uzun, dövləti əbədi olsun, burada yazıq qulun günahı yoxdur, onun da başqa qullar kimi şahdan mərhəmət gözləməyə haqqı vardır.

Dedi: – Bir gecə səbr etsəydi dünya dağılmazdı ki, mən ona kənizin qiymətindən daha çox dövlət verərdim.

Dedi: – Ey yer üzünün allahı, düz buyurdunuz, lakin:



Şer

Ciyəri təşnə olan çəşməyə çatdıqda məyər,
Çəkinərmi dəli fildən, buna de kim inanar:
Boş otaq, süfrə dolu, mədəsi boş bir dinsiz.
Ramazandan[44] çəkinib süfrədə heç ac oturar?!

Bu lətifə şahın xoşuna gəldi. Dedi: – Yaxşı, qulu sənə bağışladım, bəs kənizi neyləyim?

Dedi: – Kənizi də qula bağışla ki, onun artığı özündən başqa heç kəsə layiq deyil.

Şer

Pis yerə gedəndən sənə dost olmaz,
Dostunu yaxşı seç və yaxşı tanı.
Təşnənin ürəyi götürməz içsin
Üfunət ağızdan artıq qalanı.

**41. Hekayət**

Rumlu İskəndərdən[45] soruşdular:

–Qərbdən Şərqə qədər uzanan bu ölkələri necə tutdun? Halbuki keçmiş hökmdarların ömrü, xəzinəsi, mal–dövləti səndən artıq olmuş, lakin sənin qədər fəthlər edə bilməmişlər.

İskəndər dedi:

–Səbəbi budur ki, hər ölkəni aldıqda camaatını incitmədim, şahlarına hörmət edib, adlarını ehtiramla çəkdim.

Beyt

Onu böyük saymaz aqil olanlar,
Ki, böyük kəsləri pisliklə anar.

Şer

Keçici hər bir şey, heç olur şəksiz,
Təxt ilə bəxt və əmrlə kirdar.
Pisləmə köçənin yaxşı adını,

Ta sənin öz adın qalsın paydar.



## II FƏSİL

## DƏRVİŞLƏRİN ƏXLAQI HAQQINDA

### 1. Hekayət

Yüksək mənsəbli bir şəxs zahiddən soruşdu:
–Adamlar filan abidin dalınca pis danışırlar, sən onun haqqında nə deyə bilərsən?
Dedi:
–Zahirində eyib görmürəm, batininə isə bələd deyiləm.

Şer

Hörmət et, hər zaman, yaxşı adam bil,
Hər kimi çox sadə geyinmiş görsən.
Batini dərk etmək bir müşkül işdir.
Darğa tək hər evə daxil olma sən.

### 2. Hekayət

Gördüm bir dərviş üzünü Kəbənin[46] astanasına sürtür və hey belə deyir: «Ey kərim allah, rəhim allah, sən özün bilirsən ki, zalim və cahillərdən nə xətalar baş verə bilər».

Qitə

Xidmətində müqəssirəm əfv et.
Çünki yoxdur ümid taətdən,
Tövbə eylər günah üçün asi,
Arif üzr istəyər ibadətdən.

Abidlər dualarının icrətini, tacirlər mallarının qiymətini istərlər. Mən isə nə dua etmişəm, nə mal götirmişəm, baş götürüb dərganına dilənməyə gəlmişəm. Vəziyyətimə görə yox, ləyaqətimə görə mənimlə rəftar et.

Şer

Kəbənin önündə bir yolçu gördüm.
Ağlaya–ağlaya deyirdi haman:
«Demirəm qəbul et itaətimi,
Lütf edib keç mənim günahlarımdan»

Beyt

Öldürsən ya bağışlasan mən dönmərəm astanandan,
Üzü yola bir qulunam, əmrin nədir, nədir fərman?

**3. Hekayət**

(Bir dəfə) gördülər ki, Əbdülqadir Gilani[47] (Allah ona rəhmət eləsin) üzünü Kəbə mehrabının xırda daşlarına sürtüb belə deyir: «İlahi, məni bağışla, əzab–əziyyət verəcəksənsə, qiyamət günü kor elə ki, bağışlananları görüb utanmayım».

Şer

Hər səhər küləyi əsən zamanda,
Torpağa üz sürtüb yalvarıram mən.
«Ey səni heç zaman unutmadığım,
Heç məni yadına salırsanmı sən?..»

**4. Hekayət**

Bir gün zahidin evinə oğru gəldi. Nə qədər axtardısa bir şey tada bilməyib gədərləndi. Bunu görən zahid, altındakı palazı çəkib oğrunun yolu üstə atdı ki, əliboş qayıtmasın.

Şer

Eşitdim ki, allah adamı bir an,
Düşmən qəlbini də sıxmaz heç zaman.
Belə bir məqamə çata bilməzsən,
Sən ki dostlarınla hey vuruşursan.



**Tərbiyət.** Sədaqət əhlinin səmimiyyəti üzdə də, dalda da eyni olar, naəhl adamlar isə üzdə sənə qurban olar, dalda isə eyib tutar.

Beyt

Zahirdə bir yazıq qoyuna oxşar.
Arxada sanki bir quduz canavar

Beyt

Hər kim sənə özgənin eybini dedi, bişək
Sənin də hər eybini başqasına deyəcək.

**5. Hekayət**

Bir necə səyyah yoldaş olub, səyahətə çıxmışdı. Onlar qabaqlarına gələn bütün əziyyətlərə birgə qatlaşır, mənzillərdə birgə rahatlaşırdılar. Mən də onlarla qonşu olmaq istədim, razı olmadılar. Dedim:

–Miskinlərin söhbətindən üz döndərib, onları öz söhbətinin ləzzətindən məhrum etmək kərəm sahiblərinə yaraşmaz. Mən isə öz nəfəsimdə elə bir təsir və qüdrət bilirəm ki, adamların xidmətində ürək sıxan daş deyil, könül acan yoldaş ola bilərəm.

Beyt

Gedərəm piyada yanınızla mən,
Olum yəhər tutan, üzəngi çəkən.

Onlardan biri dedi:

– Sözümüzdən incimə, çünki bu günlərdə bir oğru özünü dərviş qiyafəsinə salıb yanımıza gəldi.

Beyt

İnsanın qəlbini göstərməz paltar,
Yazan özü bilər kağızda nə var.

Dərvişlər saf ürəkli olduqlarından heç nədən şübhələnməyib onu yoldaşlığa qəbul etdilər.

Şer

Arifin geyimi köhnə olsa da,
Ona xəlqiliyi bəsdir dünyada.
Nə geysən özün bil, yaxşı ol ancaq,
Ya tac qoy, ya da tut çiynində bayraq,
Zahid atmalıdır eyşi–işrəti
Nə təkcə paltarı, varı, dövləti,
Döyüşdə mərdanə olmağı öyrən,
Lakin müxənnəsə qarşı durma sən.

Bir gün axşamacan yol gedib, gecəni bir qalanın yanında qalmalı olduq. Biz yuxuda ikən o uğursuz oğru, yoldaşının qumqumasını götürüb, həyətə çıxmaq bəhanəsi ilə oğurluğa getmişdi.

Beyt

Möminə bax, xirqə geyib necə vüqarla gedir.
Kəbəninsə örtüyünü eşşəyinə çul edir.

O, yoldaşlarının gözündən yayınıb qalanın bürcündən içəri girmiş, bir sandıq cavahir oğurlamış, gecə ikən oradan qaçıb uzaqlaşmış, biz isə heç şeydən xəbərimiz olmadan, yatıb yuxuya qalmışdıq. Səhər açılan kimi qala gözətçiləri gəlib hamımızı qalaya apardılar, döydülər və həbsa saldılar. O gündən bəri yadlarla dostluğu tərk edib, başqalarından kənar gəzməyi qərara admışıq. Məsəl var deyərlər: tək başım dinc başım. .

Şer

Tayfadan bir qanmaz çıxarsa, əlbət,
Böyük də, kiçik də çəkər xəcalət.
Eşitməmisənmi bir məsəl də var:
«Bir dana naxırın adını korlar.»



Dərvişin bu söhbətini dinlədikdən sonra dedim:

–Allahın izzət və calalına şükür olsun zahirən dərvişlərdən ayrı düşüb tək qalsam da, onların verdiyi bu öyüd mənim kimi adamlar üçün ömür boyu bəsdir.

Şer

Məclisdə bir nəfər nanəcib olsa,
Bütün məclis əhli incik görünər.
Doldursan gülabla bir hovuzu sən.
Bircə it düşərsə, çirkaba dönər

**6. Hekayət**

Bir zahid bir padşaha qonaq idi. «Hökmdarın yanında hörmətim artsın» – deyə o, süfrə başında əyləşərkən adətindən az yedi, ibadətə başladıqda isə namazı həddən artıq uzatdı.

Beyt

Kəbəyə çatmazsan ərəb, ayıq ol,
Türküstan yoludur bu getdiyin yol.

Elə ki, evinə qayıdıb gəldi, yemək istədi. Onun ağıllı bir oğlu var idi, atasından soruşdu:

–Ata, nə üçün hökmdar hüzurunda doyunca yemədin? Zahid dedi:

–Hökmdar hüzurunda karlı bir şey yeyə bilmədim. Oğlu dedi:

–Elə isə namazını da təzələ, çünki karlı namaz da qıla bilmədin.

Şer

Ey məğrur, ey əli hünər bilməyən.
Eyiblə, nöqsanla öyünürsən hey...
Pis günə düşərsən, işin əyəndə,
Belə qəlp puluna verməzlər bir şey.

**7. Hekayət**

Yadımdadır, uşaqlıqda gecələr ibadətlə məşğul olur, dindarlığa maraq göstərirdim. Bir gecə atamla birlikdə səhərə qədər yatmayaraq, quran oxuyurduq. Ətrafımızda isə hamı yatmışdı. Atamdan soruşdum:

–Bunların biri də başını qaldırmır ki, heç olmasa iki rükət namaz qılsın, onlar elə qəflət yuxusuna gediblər ki, sanki yatmamışlar, ölmüşlər.

Atam dedi:

–Ey əziz oğlum, xalqın qeybətini etməkdənsə, yatsaydın daha yaxşı olardı.

Şer

Müddəi özündən qeyrisin görməz,
Çünki xudpəsəndlik tutmuş gözünü
Allahı görməyi bacarsa hər kəs,
Hamıdan zavallı görər özünü.

**8. Hekayət**

Böyük adamlardan birini məclisdə tərifləyir və yaxşı sifətlərindən uzun–uzadı danışırdılar. Nəhayət o, başını qaldırıb Dedi:

– Mən özüm bilirəm ki, mən kiməm.

Beyt

Ey mənə hey tərif deyib incidən,
Kaş xəbər tutaydın bu batinimdən.

Şer

Bütün aləm mənə baxıb zahirimi xoşlayır.
Bu natəmiz batinimsə məni edir xəcalət.
Xalq heyrandır min rəng ilə gəzən tavus quşuna.
Tavus isə ayağına baxıb çəkir xəcalət.

**9. Hekayət**



Ərəb ölkələrində öz kəramətilə şöhrət tapmış bir Livan şeyxi bir gün Dəməşq məscidində daş hovuz kənarında dəstəmaz alarkən ayağı sürüşüb hovuza düşdü. Çox çətinliklə oradan çıxa bildi. Namaz qurtardıqdan sonra əshabələrindən biri dedi:

–Bir şey mənə qaranlıqdır, icazə versəydiniz soruşardım.

Dedi: – O nədir?

Dedi: – Şeyxim, yadımdadır deyirdiniz ki, siz Məğrib dənizinin[48] üzərində yeriyir, heç ayağınız da islanmırmış, indi nə oldu ki, siz az qala balaca bir hovuzda boğulmuşdunuz?

Şeyx bir müddət fikrə daldı, sonra başını qaldırıb dedi:

–Eşitməmisənmi ki, peyğəmbəri–aləm (Məhəmməd) səlləllahi əleyh vəsəlləm demişdir: «Mən bəzən allaha o qədər yaxın oluram ki, heç mələklər və nəbilər də bizə yaxınlaşmağa cürət etmirlər». Lakin o deməmişdir ki, həmişə belə olur.

Bildiyin kimi, bəzən o Cəbrail və Mikaili[49] yanına buraxmazdı, bəzən isə Həfsə və Zeynəbi[50] yanından buraxmazdı.

Şeyxlər[51] demişlər ki, müqəddəs adamların haqqı dərk etməsi zühur ilə qeyb arasındadır. O gan görünər, gan yox olar.

Beyt

İşvəylə üz göstərib, qaçıb uzaq durursan,
Bazarı qızışdırıb, bizə də od vurursan

Şer

Haçan ki, sevgilim keçir fikrimdən,
O zaman yolumu itirirəm mən,
Eşqinin oduyla yandığım zaman,
Lütfüylə söndürür bu odu haman.

Şer

Birisi, soruşdu qoca Yəqubdan.
Ey qəlbi nur saçan ağıllı insan.
Bir köynək iyini duydun Misirdən.
Kənanda quyunu görmədin nədən[52]

Dedi ki, halımız bir kəhkəşandır.
O gan əyandırsa, gan da nihandır.
Edərəm gan yüksək səmayə pərvaz.
Gah öz önümü də görmərəm bir az
Dərviş qalsa əgər durğun halda bil.
Hər iki aləmdə o salmaz mənzil.

**10. Hekayət**

Vaxtilə Bəlbək[53] məscidində bir dəstə cahil, korafəhim adamlara moizə edirdim. Hələ zahiri aləmin bəhsini qurtarıb, batini adəmə keçməmişdim ki, taqətdən düşdüyümü hiss etdim; nə qədər danışırdımsa göz yaş odunu yandıra bimədiyi kimi, mənim də sözlərim onlara təsir etmirdi. Xülasə, belə heyvanların tərbiyəsi üçün çalışdığıma təəssüflənir və sanki korlar məhəlləsində güzgü gəzdirirdim. Lakin artıq məna xəzinəsinin qapıları açılmış, söz, mirvariləri silsiləsi düzülməyə başlamışdı. «Və nəhnu əqrəbu ileyhi min həblil vərid»[54] ayəsini izah edib deyirdim:

Şer

Dost mənə məndən də yaxında ikən.
Bəs niyə mən onun fərağındayam?!
Dərdimi mən kimə, necə söyləyim.
Ki yar yanımda, mən sorağındayam

Mən bu sözün badəsi ilə məst olub sanki axırıncı qədəhi əlimdə tutmuşdum ki, bu zaman kənardan gecənlərdən biri son sözümün təsirindən elə bir nərə çəkdi ki, bütün məclis cuşə gəldi, elə bil yatmışlar huşə gəldi. Öz–özümə dedim: Aman allah! Necə oldu ki, uzaqdakı gözüaçıqlar yaxınlaşdı, yaxındakı korlar isə uzaqlaşdılar.

Şer

Sözü əgər anlamırsa dinləyən,
Söz deyənin təbi artmaz dünyada.
Acıq, geniş, təmiz bir meydan gərək.
Ta natiq də at çapa, top oynada.



**11. Hekayət**

Bir gecə Məkkə səhrasında yuxusuzluqdan ayaq atmağa halım qalmamışdı, başımı yerə qoyub dəvəçiyə dedim: sən məndən əlini üz!

Şer

Necə yol yerisin yazıq piyadə,
Ki dəvə yorulub ahü vay edər.
Bir kök arıqlayıb çöpə dönüncə,
Arıq çoxdan ölüb dünyadan gedər.

Dedi. – Ay qardaş, hərəm qarşıdadır, hərami dalda, ayaq atsan sağ qalacaqsan, yıxılıb yatsan həlak olacaqsan.

Beyt

Səhrada kol altında yatmaq xoş olsa da, sən
Köç gecəsi kərəkdir canından əl çəkəsən.

**12. Hekayət**

Bir dəniz kənarında bir zahid gördüm, onu pələng yaralamışdı və heç bir dərmanla sağalmırdı. Çoxdan idi ki, yara ona əziyyət verir, o isə hey allaha şükür edirdi. Soruşdular: – Bəs şükür nə üçündür?

Dedi: – Şükür edirəm, yaxşı ki, xəstəliyə yatmışam, günaha batmamışam.

Şer

Gər mənim qətlimə fərman verə ol yari–əziz,
Sən güman etmə çəkəm mən bu yazıq can qəmini
Deyərəm ki, nə günah etdim o yar incidi ah,
Çəgərəm mən belə bir hissilə canan qəmini.

**13. Hekayət**

Bir dərvişə böyük ehtiyac üz verdi. Sadiq dostunun kilimini

oğurladı. Qazı əlini kəsməyi əmr etdi. Kilim sahibi rəhmə kəlib dedi: – Mən malımı ona halal edirəm. Qazı dedi: – Sənin halal etməyinlə şəriət qanununu poza bilmərəm. Kilim sahibi dedi: – Doğru buyurursunuz, lakin yoxsul malı vəqf[55] malıdır, vəqf malını oğurlayanın isə əlini kəsməzlər.

Qazı oğrunu bağışlayıb danlamağa başladı və dedi: – Başına yer qəhət idi ki, gedib belə bir dostunun evini yardın?

Dedi: – Qazı sağ olsun, eşitməmisən ki, deyiblər:

«Dost evini sil–süpür et, düşmən qapısına getmə?!»

Beyt

Ruhdan düşmə, üz verərsə sənə çətinlik günü
Soy düşmənin dərisini, dostunsa al kürkünü.

**14. Hekayət**

Bir hökmdar bir zahidi görüb soruşdu: –Bizi heç yada salırsanmı?

Dedi:

– Bəli, allahı unudanda.

Beyt

Kimi allah qovarsa, onu sərkərdan edər,
Kimə olsa rəğbəti, salşaz onu dərbədər.

**15. Hekayət**

Əməli saleh adamlardan biri yuxuda gördü ki, padşah cənnətdədir, zahid cəhənnnəmdə. Soruşdu ki, bunun belə yüksəlməsinin və onun belə alçalmasının səbəbi nədir? Camaat bunun əksini gözləyirdi. Nida gəldi ki, bu padşah yoxsullara yaxşılıq etdiyi üçün cənnətdə, o zahid şahlara yaxınlıq etdiyi üçün cəhənnəmdədir.

Şer

Nəyinə lazımdır bəzəkli paltar



Yaxşıdır özünü pis işdən qurtar.
Dəri papaq qoyub çox qaldırma boy.
Dərvişsifət olub sadə papaq qoy.

**16. Hekayət**

Hicaz karvanı Küfədən[56] kecərkən ayaqyalın, baş açıq, çılpaq piyadə bir yoxsul bizə qoşuldu. O, yorğun bir halda gedir və deyirdi:

Şer

Nə dəvəyə minmişəm, nə dəvə tək yüküm var
Nə ağaya bir qulam, nə də qula şəhriyar.
Qəmim yoxdur dünyada bilmərəm qorxu nədir,
Asudəyəm, dərdu qəm ruhuma biganədir.

Dəvəyə minmişlərdən biri ona dedi:

–Ey dərviş hara gedirsən; qayıt yol çətindir, ölərsən. Dərviş qulaq asmayaraq yoluna davam etdi. Karvanımız Nəxleyi–Məhmuda[57] yetişəndə həmin dəvəyə minmiş adamın əcəli çatdı.

Dərviş onun başı üstə gəlib dedi:

– Mən piyadə ölmədim, sən isə dəvə üstündə həlak oldun!

Beyt

Ağladı bütün gecə bir adam xəstə üstə,
Ağlayan gündüz öldü, sağaldı, durdu xəstə.

Şer

Çox olmuş qaçan at yollarda batmış.
Çolaq eşşək isə mənzilə çatmış.
Çox sağlam ağlayıb qəbrə kömüldü.
Yaralı ölmədi, sağaldı, güldü.

**17. Hekayət**

Nağıl edirlər ki, şah bir abidi yanına çağırmışdı. Abid fikirləşdi:

«Bir az dərman atıb zəifləyim, bəlkə çox ibadət etdiyim zahirimdən məlum ola, mənə olan etiqadları bir qədər də arta». Deyirlər dərman öldürücü zəhər imiş, atmağı ilə ölməyi bir oldu.

Şer

Püstə kimi məğz hesab eylədiyim,
Soğan kimi pərdəliymiş o yaramaz.
Çox zahidi gördüm xalqa üz tutaraq
Qibləsinə dal çevirib qılır namaz.

**Beyt**

Allahını salanda hər bir bəndəsi yada,
Lazımdır ki, başqa şey tanımasın dünyada.



**18. Hekayət**

Yunan ölkəsində yol kəsənlər bir karvanı çapıb, çoxlu qənimət ələ gətirdilər. Tacirlər nə qədər ağlayıb, sızlayıb, allaha–peyğəmbərə and verdilərsə, bir faydası olmadı.

Beyt

Oldusa bir qəddar oğru kamiran,
Qəm yeməz, ağlasa bütün karivan

Həkim Loğman da həmin karvanda idi. Karvandakılardan biri ondan xahiş edib dedi:
– Oğrulara öyüd, nəsihət ver, moizə oxu, bəlkə mallarımızın bir hissəsi əlimizdə qala. Heyifdir bu qədər mal tələf ola.
Loğman dedi: – Heyif hikmətli sözdür ki, onlara deyilə

Şer

Pas yemiş dəmirdən mümkün deyildir,
Silməklə yenidən saf dəmir almaq.
Daş qəlbə kar etməz öyüd–nəsihət,
Dəmir mıxı olmaz qayaya çalmaq.

Şer

Şad günündə sınıq qəlbləri güldür,
Zorla könül qırmaq yamandır bilsən,
Sayil nə istəsə, xoşluq ilə ver,
Yoxsa zalim alar zorla əlindən.

**19. Hekayət**

Görkəmli alim, böyük şeyx mərhum Əbülfərəc ibn Cövzi[58] mənə məclisində iştirak etməyi mən edərdi. Lakin başımda gənclik havası, qəlbimdə eyş–işrət həvəsi olduğundan qoca ustadın dediyinə qulaq asmır, musiqi məclislərinə getməkdən həzz alırdım. Şeyxin verdiyi öyüd–nəsihəti xatırladıqda isə öz–özümə deyir:

Beyt

Qazi bizlə otursa, eyləyər rəqsə həvəs,
Darğa içsə mey özü, məsti müqəssir etməz.

Yenə bir axşam bir kef məclisinə yetişdim, orada elə bir ki,

Beyt

Qırır qəlbin tellərini mizrab ilə nəki var,
Səsi mərhum atasının səsi kimi xırıldap.

Məclisdəkilər onun səsini eşitdikdə gah öz qulaqlarını tuturdular, gah «sus!» – deyə barmaqlarını dodaqlarına qoyurdular.

Beyt

Sevərlər səs ilə hər xanəndəni,
Sən sussan daha çox sevərlər səni

Beyt

Səsin razı salmaz heç bir adamı
Susduqda sevinib şadlanar hamı.

Şer

Elə ki, səsləndi o bərbət yenə,
Dedim kəndxudaya: «allah eşqinə,
Ya tök qulağıma civə kar olum,
Ya aç bu qapını tez kənar olum.»

Xülasə, dostların xatirinə bütün kecəni bu qayda ilə səhər eylədim.

Şer



Müəzzin qışqırır yersiz, mövqesiz,
Bilməyir nə qədər keçib gecədən.
Soruş göslərimdən uzun gecəni,
Çünki bircə an da yatmamışam mən.

Dan yeri sökülərkən qurşağımdan bir dinar çıxarıb, başımdakı çalmanı açdım və onları xanəndəyə bağışladım, sonra qucaqlayıb minnətdarlıq elədim. Dostlar mənim ona qarşı göstərdiyim bu ehtiramı adətdən xaric bilib, ağılsızlığıma yozdular. Dostlarımdan biri diliuzunluq edib məni danlamağa başladı ki, ovcunda bir gümüş, dəfində bir qruş görməyən xanəndəyə şeyxlik paltarını bağışlamaqda ağıllı iş görmədin.

Şer

Bu məclisdən uzaq olsun, var idi bir nəğməxan,
Ki, bir yerə iki dəfə cağrılmazdı heç zaman.
Rast oxumaq istər ikən məlum oldu hünəri,
Eşidənin bədənində biz–biz oldu tükləri.
Saray quşu qorxusundan eyvandan uçdu getdi,
Boğazını yırtdı özü, bizi yarımcan etdi.

Dedim:

– Məncə ağzını yumub, etiraz etməsən, daha yaxşıdır. Çünki bu adamın kəraməti mənə aydın oldu.

Dostum dedi:

– Elə isə nə üçün səbəbini mənə demirsən ki, mən də ona hörmət edib, zarafatla dediyim sözün üzrünü istəyim?

Dedim: – Səbəbi budur ki, hörmətli şeyxim mənə çoxlu öyüd–nəsihət verər, musiqi məclisində iştirak etməyimi qadağan edərdi. Mən isə qulaq asmazdım. Bu axşam isə mənə böyük bir səadət üz verdi, uğurlu taleyim gətirib məni bu evə çıxartdı. Burada həmin xanəndənin səsini eşitdikdə tövbə etdim ki, nə qədər bir də belə məclislərdə iştirak etməyim.

Şer

Gözəl ağız, şirin dodaq, xoş boğazdan gələn səs

Nəğmə desə, deməsə də, sevər onu hər bir kəs.
Amma Üşşaq, İsfahan və hicaz kimi müqamlar.
Çirkin, kobud bir ağızdan çıxsa heç kim dinləməz

**Hikmət.** Loğmandan soruşdular:
– Ədəbi kimdən öyrəndin,
–Ədəbsizlərdən. Onlarda gördüyüm xoşuma gəlməyən hərəkətləri təkrar etmədim.

Zarafatyana da deyilsə bir söz,
Ağıllı o sözdən götürər ibrət.
Əkər anlamaza yüz hikmət desən,
Oyüncaq görünər ona bu hikmət.

**20. Hekayət**

Yadımdadır, bir dəfə bütün gecəni karvanla yol getmiş, səhərə yaxın bir meşənin kənarında yatmışdıq. Bir dəli aşiq də bizimlə idi.
Birdən nərə çəkib yerindən qalxdı. baş götürüb səhraya qaçdı, səhərə qədər bir an da belə aram olmadı. Gündüz ondan soruşdum: – O nə hal idi?
Cavab verdi: – Gördüm ağacdakı bülbüllər naləyə gəlmiş, dağdakı kəkliklər, göldəki qurbağalar, meşədəki heyvanlar səs–səsə vermişlər. Dedim insafdan deyil ki, hamı vird edib, zikr oxusun, məni isə qəflət yuxusu aparsın.

Şer

Dünən sübhə yaxın inlərdi bir quş,
Naləsi alırdı məndən əql, huş.
Səmimi dostlardan birisi demə –
Mənim halətimdə xəbərdar olmuş.
Demiş ki, heç güman etməzdim buna,
Səni bir quş səsi eyləsin mədhuş.
Dedim ki, adamlıq şərti deyildir,
Quş razü niyazda, mən isə xamüş

**21. Hekayət**



Vaxtilə hicaz səfərinə çıxıxmışdım. Arif cavanlardan neçəsi də mənimlə idilər. Onlar bəzən astadan zümzümə edib, hikmətamiz şerlər oxuyurdular.
Dərvişlərdən xoşu gəlməyən, onların mənəvi aləmlərindən xəbərdar olmayan və hənəfi[59] məsləkinə mənsub bir zahid də bizimlə həmsəfər idi. Bəni–hilal[60] tayfasına çatdıqda bir qarasifət ərəb uşağı rastımıza gəldi. O elə bir avazla oxudu ki, uçan quşlar göydən yerə endilər. Birdən gördüm zahidin dəvəsi də oynamağa başladı. Zahidi yerə vurub biyabana doğru baş aldı. Zahidə dedim:
– Ey şeyx, bu necə işdir ki, xanəndənin səsi heyvanı oyadır, lakin səndə heç bir təsir oyatmır?

Şer

Heç bildin nə dedi səhər bülbülü?!
Dedi: «Ey eşqdən xəbərsiz insan,
Dəvə də rəqs edir ərəb şerilə,
Sənin zövqün yoxsa, pissən heyvandan».

Şer

Onun zikrində hər bir şey gəlir vəcdə, edir tüğyan
Bunu dərk eyləyər ancaq ürəklə dinləyən insan
Güman etmə gülə bülbül oxur nəğmə, olub mayil,
Onun tərifinə bax ki, tikanlar da açıbdır dil.

**22. Hekayət**

Bir padşahın ömrü sona çatırdı, lakin taxtında əyləşəcək varisi yox idi. Vəsiyyət etdi ki, səhər tezdən şəhər darvazasından kim ilk daxil olsa, şahlıq tacını onun başına qoyub, ölkənin işlərini ona tapşırsınlar. Təsadüfən darvazadan ilk girən bir dilənçi oldu. O, bütün ömrünü tikə–tikə çörək yığmaq, cındır paltarına yamaq üstündən yamaq vurmaqla keçirmişdi. Dövlət xadimləri və ölkənin mötəbər adamları şahın vəsiyyətini yerinə yetirdilər. Qala və xəzinənin bütün açarlarını dilənçiyə verdilər və o bir neçə müddət padşahlıq etdi. Necə deyərlər: loğmaya həsrət qalan, halva yedi bol, kalan.

Lakin çox çəkmədi ki, dövlət xadimlərindən bir neçəsi ona itaət etməkdən boyun qaçırdılar, qonşu hökmdarlar isə düşmənçiliyə başlayıb, hər tərəfdən ölkənin üstünə qoşun çəkdilər. Nəhayət camaatla qoşun birləşib üsyan etdi. Ölkənin bəzi şəhfrləri hökmdarın əlindən getdi.

Bu hadisələr yeni padişahı həddən artıq kədərləndirdi. Elə bu zaman keçmiş dilənçilik dövrü yoldaşlarından biri səfərdən qayıtdı, dostunun çox yüksək bir mərtəbəyə çatdığını görcək dedi:

- Şükür olsun allahın izzət və çalalına ki, nəhayət sənin qızıl külün tikandan xilas oldu, yoxsulluq tikanı isə ayağından çıxdı. Yüksək taleyin, böyük səadətin yar olub, səni belə bir mənsəbə çatdırdı. Deməli, bütün çətinlik və əziyyətin axırda belə rahatlıq və asudəliyi də varmış.

Beyt

Çiçək gah açıqdır, kah da pünhandır,
Ağac gah keyimli, kah da üryandır.

–Ey əziz dostum. sən gördüyün günlər çörəyin dərdini çəkir, indi isə dünyanın qəmini yeməli oluram.

Şer

Var–dövlət olmasa dərd çəkər insan,
Olanda, rahatlıq yox olur ondan.
Xülasə, belədir bu qoca dünya
Əzabdır olsa da, ya olmasa da.

Şer

Dövlətli olmağı istəsən bil ki,
Ancaq qənaətdir səfalı dövlət.
Dövlətli pul töksə ətəyinə, sən,
Onun səvabından götürmə minnət.
Atalar söyləmiş:Yoxsulun səbri
Varlı bəxşişindən yaxşıdır əlbət!



Beyt

Bəhram[61] əgər gur ovlayıb görünsə də qəhrəman
O, zəifdir bir çəgirtkə sürüyən qarıncadan.

**23. Hekayət**

Bir şəxsin dövlət xadimləri içərisində bir dostu var idi, çoxdan bəri onunla görüşə bilmirdi. Birisi soruşdu:

–Çoxdandır dostunla görüşmürsən?

Dedi:

–Görüşmək arzusunda da deyiləm.

Təsadüfən dostunun yaxın adamlarından biri orada idi, bu sözü eşitcək soruşdu:

–Dostunun günahı nədir ki, onunla görüşməyi arzulamırsan?

Dedi:

–Dostumun günahı yoxdr, lakin dövlət xadiminin yalnız vəzifədən azad edildikdən sonra görmək olar. Mən isə öz rahatlığım üçün onun vəziyyətə düşməsinə razı deyiləm.

Qitə

Böyüyər, qarışar başım işlərə,
Çıxar xatirinən dostlar, tanışlar.
Elə ki, rütbədən salınar yerə,
Gələr dosta açar nə ki dərdi var.

**24. Hekayət**

Nağıl edirlər ki, bir abid hər axşam 10 batman ağırlığında xörək yeyib səhərə qədər Quran oxuyarmış. Böyüklərdən biri bunu eşidib demişdir:

–Gündə yarım çörək yeyib yatsa idi, ariflərin nəzərində daha yaxşı olardı.

Şer

Qarnını doldurma yeməklə ta ki,
Özündə görəsən mərifət nuru.
Başın boşdur, çünki doludur qarnın,
Qarnı dolmuşların olmaz şüuru.

**25. Hekayət**

Bir yoldan azmışın qarşısına haqq nuru səpələndi, əyrilikdən əl çəkib doğru yola gəldi, dərvişlərə qoşuldu, onların söhbətinin gücündən; nəfəsinin təsirindən pis adətləri unutdu, yaxşı xasiyyətlərə sahib oldu, əyyaşlıqdan əl çəkdi. Lakin ağzıgöyçək adamlar dili uzunluq edərək onun haqqında şayiyə yaymağa başladılar ki, əvvəldə olduğu kimidir, pəhriz saxladığına, ibadət etdiyinə də etibar yoxdur.

Beyt

Qurtarasan üzrlə allahın əzabından,
Xalqın dilindən ancaq qurtarmazsan bircə an.

Nəhayət dedi–qoduya davam gətirməyib təriqət başçısının yanına şikayətə getdi. Mürşüdləri dedi:

Getmək üçün bundan daha gözəl nə ola bilər ki, sən təsəvvür etdiyindən daha yaxşısan.

Beyt

Çox demə ki, paxıl adamlar mənə
Eyib axtarırlar hey axşam, səhər.
Gah tökmək istərlər qanımı mənim,
Gah da «pisdir» – deyib yayırlar xəbər.
Yaxşı ol, qoy «pisdir» desinlər sənə,
Nə ki pis olasan «yaxşı» desinlər.

Lakin fikir çəkib qəm yemək, həqiqətdə qüsurlu olub zahirdə nöqsansız hesab edilən mənim kimi adamlara lazımdır:

Beyt

Onlar tərif edən kimi olsaydım,
Yaxşılığa çəkilərdi bil adım.

Beyt



Yaxın qonşum bilə bilməz mənim heç bir əsrarımı,
Lakin yalnız allah bilir bütün gizli-aşkarımı.

Şer

Qapımızı xalq üzünə bağladıq,
Bilməyələr ta bizdə nə eyib var.
Nə fayda bu qapını bağlamaqdan
Ki hər sirri allah bilir aşikar.

**26. Hekayət**

Bir gün şeyxlərdən birinin yanına gedib şikayətləndim ki, filankəs mənim pisliyimə danışır.

Dedi:

– Sən yaxşılığına danış, utandır!

Şer

Sən yaxşı işlər gör, ta ki pis gözlər,
Nə qədər axtarsa tapmasın nöqsan,
Əgər düz çıxarsa bərbətin səsi,
Çalğıçı qulağın burmaz heç zaman.

**27. Hekayət**

Şam[62] şeyxlərindən birindən soruşdular ki, sufiliyin mahiyyəti nədən ibarətdir?

Dedi: – Əvvəllər dünyada bir qrup adamlara deyirdilər ki, zahi–rən dağınıq idilər, daxilən mütəşəkkil; indi isə elə adamlara de–yirlər ki, zahirdə mütəşəkkildirlər, daxildə dağınıq.

Qitə

Hər saat ürəyin bir yerdə olsa,
Təklikdə görməzsən rahatlıq, səfa.
Varsa çox dövlətin, əkinin, rütbən,
Qəlbin allahlasa, xəlvətnişinsən.

**28. Hekayət**

Əbu Hüreyrə[63] (allah ondan razı olsun)hər gün Məhəmməd peyğəmbərin yanına gələrmiş və həmişə də peyğəmbər ona deyərmiş:

«Ya əba Hüreyrə, zurni ğibbən təzdid hübbən», yəni: Ya Əbu Hüreyrə, hər gün gəlmə ki, məhəbbətimiz çox olsun.

Bir arifə dedilər: – Günəşin bu qədər gözəl olmasına baxma–yaraq, birinin ona vurulduğunu və ya dost olduğunu indiyə qədər eşitməmişik.

Dedi: – Çünki hər gün görürsünüz. Birçə qışda, o az görünür, çox sevilir.



Şer

Xalq ilə görüşmək eyib deyildir,
Lakin o qədər ki, deməsinlər «bəs».
Əkər sən özünü məlamət etsən,
Töhmət eşitməzsən heç kəsdən əbəs.

**29. Hekayət**

Böyüklərdən birinin qarnında yel vardı. Birdən burulmağa başlayıb dışarı çıxmaq istədi. O, nə qədər əlləşdisə, özünü saxlaya bilmədi. Axırda naqafıl yel səslə dışarı çıxdı.

Dedi: – Dostlar, qəsdən etmədiyim üçün günahı mənə yetişməz, lakin mənə böyük bir rahatlıq nəsib oldu, siz də kəramətiniz xatirinə bunu üzürlü hesab edmn.

Şer

Ey aqil, qarındır yelə bir zindan,
Yeli bənddə qoymaz şüuru olan.
Qarında yel olsa saxlama zinhar,
Çünki o ürəyə ağır yük olar.

Beyt

Can sıxıcı həriflə bir məclisdə oturma,
O rədd olmaq istəsə sən heç üstünü vurma.

**30. Hekayət**

Dəməşq dostlarımın söhbətindən yorulduğuma görə, baş alıb Beytül-müqəddəs[64] çölünə getmişdim. Orada heyvanlarla ünsiyyət tapıb yaşamaqda idim ki, firəngilərə əsir düşdüm. Onlar məni Trablis[65] xəndəyində yəhudilərlə birlikdə torpaq işində işləməyə məcbur etdilər. Keçmişdə tanış olduğum hələb başçılarından biri kecərkən məni tanıyıb dedi:

– Bu nə haldır?

Dedim:

Şer

Qaçırdım bu xalqdan dağa–daşa mən,
Allahla birləşmək istərdim həmən.
İnbi gör nə yazıq hala düşdüm ki,
Namərdlə tutmuşam töylədə məskən.

Beyt

Dostlar ilə məhbus olmaq yaxşıdır, bir zindanda,
Nə ki, düşmən sənin ilə ömür sürə bostanda.

Mənə çox yazığı gəldi, on dinar verib əsirlikdən azad etdi və özü ilə Hələb şəhərinə apardı. Orada qızını mənə verib, yüz dinar mehrlə kəbinini kəsdirdi.

Demə bu qız bədxasiyyət, həyasız və dikbaş imiş. Bir müddət keçdi. Qız diliuzunluğu ilə günümu qara etməyə başladı.

Şer

Yaxşı kişi, pis arvadla həyat sürərsə bahəm.
Bu dünya da olar ona bir dözülməz çəhənnəm.
Pis arvadın əllərindən dadü fəryad, əlaman,
Allah! Bizi xilas eylə bu çəhənnəm odundan

Axırda bir gün o tənə ilə üzümə qabarıb dedi:

–Sən o adam deyilsən ki, atam səni pul ilə firənglərin əsirliyindən azad etmişdir?

Dedim:

–Bəli, mən haman adamam ki, atan məni on dinara firənglərin əlindən satın alıb, yüz dinara sənin çəngində əsir etdi.

Şer

Eşitdim ki, bir pəhləvan zavallı bir qoyunu
Xilas etdi bir yırtıcı canavarın əlindən.



Axşam çağı boğazına biçaq qoydu yazığın,
Dilə gəldi o qoyunun ruhu dedi: «Aman sən
Əgər məni canavardan qurtardınsa, nəhayət,
Əsil qurdum özün oldun, öldürdün uf demədən»

**31. Hekayət**

Padşahlardan biri oğul–uşağı çox olan bir abiddən soruşdu:

–Əziz vaxtını necə keçirirsən?

Dedi: –Gecə səhərə qədər münacat verirəm, səhərlər ehtiyacım üçün dua edirəm, bütün günü xərclik üçün əlləşirəm. Şah abidin nə demək istədiyini başa düşdü, əmr verdi ona maaş təyin etsinlər, ailə yükünü onun üzərindən götürüb əhli–əyalın təmin etsinlər.

Şer

Ey ailə zəncirinə bağlı qalan binəva,
Rahatlıq və asudəlik xəyal etmə bir daha.
Övlad, çörək, paltar qəmi, dolanacaq kədəri,
Sənə imkan verməyəçək seyr edəsən göyləri.
Hər gün səhər əhd edirəm, mən verirəm iltizam,
Ki, rəbbimlə razu niyaz edəcəyam bu axşam.
Gecə olcaq mən hər şeyi unuduram nə ki var,
Dərd götürür ki, bəs sabah nə yeyəcək balalar?!

**32. Hekayət**

Şam abidlərindən biri meşədə yaşayır və ağac yarpağı ilə dolanırdı. Bir padşah onun görüşünə gedib dedi:

–Məsləhət görsəniz sizdən ötrü şəhərdə bir saray tikdirərəm. Orada həm siz asudə ibadət edərsiniz, həm də camaat sizin hikmətamiz sözlərinizdən faydalanar, pak əməllərinizi görüb ədəb öyrənərlər.

Zahid hökmdarın təklifini rədd etdi. Vəzirlərdən biri ona dedi:

–Hökmdarın dediyi söz hörmətinə, yaxşı olar ki, şəhərə gəlib bir neçə gün vəziyyəti öyrənəsiniz. Əgər yad adamlar vaxtınızı alıb, söhbətlərilə sizi narahat etsələr, yenə qayıda bilərsiniz.

Nağıl edirlər ki, zahid şəhərə gəldi. Hökmdarın öz xüsusi bağ və sarayında onun üçün çox səfalı və ürək açan bir yer verdilər.

Şer

Gözəllər hüsnünə bənzər bu gülşəndə qızıl güllər,
Nigapın zülfü tək xoşdur bu yerdə türfə sünbüllər
Qışın bərk şaxtası keçmiş, soyuqdan qalmamış qorxu,
Açıb sanki ağız tifli–gülüstan gözləyir qayğu.

Beyt

Yaşıl donlu budaqlarda düzülmüş nar gülü od tək,
Əcəbdir yarpaq üstündə belə qan rəngli od görmək!

Hökmdar dərhal göyçək bir kəniz də onun yanına göndərdi.

Şer

Abidlər aldadan ay üzlü canan,
Huri tək gözəldir, tavus tək əlvan.
Onun çəmalını mömin də görsə,
Bilməz harda qaldı din ilə iman.

Şah onun ardınca yaraşıqlı, gözəl bir qulam da zahidə bağışladı.

Şer

Xalq ölür ətəşdən suçu yanında,
Suçu görərsə də bir damcı qıymaz.
Gözlərim doymayır səndən, necə ki,
İstisqa içərsə fəratı doymaz.

Zahid ləzzətli xörəklər yeyib, təmiz paltarlar geydi, dadlı meyvələrin, şirələrin ətrindən məst olub, gözəl kənizin və qulamın gül camalından zövq almağa başladı.

Ağıllı adamlar demişlər:

–Gözəllərin zülfü ağlı əsir edən bir kəmənd, zirək quşu tora salan bir bənddir.



Beyt

Imanımı, qəlbimi yar yolunda qoymuşam,
Sanki çox bildiyimdən tora düşən bir quşam.

Nəhayət bütün bu xoşbəçtliklər zahidi zavala gətirdi.

Şer

Mürşid də, mürid[66] də, qoça, çavan da
Xülasə hər kəs ki, qoca cahanda
Bu alçaq dünyaya bir həvəs saldı,
Milçək kimi bala yapışıb qaldı.

Hökmdar ikinci dəfə onu görməyə gəldikdə gördü ki, zahidin əvvəlki solğun rənki dəyişmiş, ətə–qana dolub qıp–qırmızı qızarmışdır. İpək yastığa söykənmiş, mələk kimi gözəl qulam onun başı üzərində tavus qanatı kimi bir çətir açmışdır. Xülasə, hökmdar, zahidin səhhətinin sağalmağından sevindiyini bildirib, hər tərəfdən söhbət açdı. Axırda söhbətinə yekun vuraraq dedi:

–Mən iki cür adama məhəbbət bəsləyirəm: bir alimə, bir də zahidə. Dünyada mənim kimi onları sevən yoxdur.

Orada olan dünyagörmüş ağıllı bir vəzir dedi:

–Ey hökmdar, məhəbbətin şərti budur ki, bacardıqca hər ikisinə yaxşılıq edəsən: alimlərə qızıl verəsən ki, daha artıq elm qazansınlar, zahidlərə bir şey verməyəsən ki, zahid olaraq qalsınlar.

Şer

Gönül alan gözəl üzlü gözələ,
Üzük, sırğa, bəzək, düzək nə lazım?!
Xoş əxlaqlı, xoş məcazlı zahidə,
Qapı–qapı pay diləmək nə lazım?!...

**33. Hekayət**

Bu sözün qüvvəsi, bir padşaha böyük bir məsələ üz vermişdi. Əhd etdi ki, əkər məsələ onun istədiyi kimi həll olsa, zahidlərə çoxlu

pul bağışlasın. İş o istədiyi kimi də həll olundu. Hökmdarın ürəyi sakitləşdi, sonra öz əhdini yerinə yetirmək qərarına gəldi. Xüsusi qullarından birinə bir kisə qızıl pul verdi ki, aparıb zahidlərə paylasın.

Deyirlər ki, qul çox ağıllı və zəkalı idi, bütün günü şəhərdə gəzib, axşam olduqda şahın hüzuruna qayıtdı, qızıl kisəsini öpüb qarşısına qoydu və dedi:

–Nə qədər axtardımsa, bir zahid tapa bilmədim.

Padşah bundan hirslənib dedi:

–Mənim bildiyimə görə ölkədə 400 zahid vardır. Qul cavab verdi:

–Ey böyük hökmdar, əsl zahid almaz, alan isə zahid olmaz. Hökmdar güldü və nədimlərinə dedi:

– Nə qədər möminlərə rəğbət, bu arsıza ədavət bəsləsəm də, onun haqq olduğunu etiraf etmək lazımdır.

Şer

Bir zahid alarsa dirəmlə dinar,
Ondan daha mömin bir zahid axtar.
Bir zahid göz tiksə özgə malına
Yaxşıdır heç zahid demə sən ona...

**34. Hekayət**

Etibarlı alimlərin birindən soruşdular: – Necə bilirsiniz, vəqf çörəyi halaldır, ya yox?

Dedi: – Cəmiyyət üçün alırlarsa, halaldır, mənimsəmək üçün cəm olurlarsa haram.

Beyt

İbadətçin çörək lazımdır, əlbət,
Çörək üçün etməmişlər ibadət.

**35. Hekayət**

Bir dərviş gəlib bir yerə çıxdı ki, oranın yeyəsi əliaçıq, qəlbi



geniş bir adam idi. Zövq əhli, fəzilət sahibləri onun evinə toplanır, dərin hikmətlər zərif lətafələr söyləyirdilər. Dərviş ac-yalavac uzaq yoldan gəlmiş, dilinə bir şey dəyməmişdi. Zarafatyana biri dedi: – Sən də bir söz de!

Dedi: – Mən başqaları kimi gözəl danışmağı bilmirəm, savadım da o qədər çox deyil, ançaq bir beyt ilə sözümü qurtaracağam.

Hamısı maraqlanıb dedi: – Söylə!

Dedi:

Beyt

Mən bir acam önümdə də süfrə dolu xoş təam,
Sanki arvad hamamının önündə bir subayam.

Dostlar onun çox ac olduğunu başa düşüb süfrə açdılar. Ev yiyəsi dedi: - Əzizim, bir az gözlə, xidmətçilər sənə döyülmüş ət hazırlasınlar. Dərviş başını qaldırıb küldü və edi:

Beyt

Döyülmüşə, döyülmüş ət nə gərək?!
Ac olana küftədir hər duz-çörək.

**36. Hekayət**

Bir mürid öz mürşüdünə dedi:

–Adamların əlindən zara gəlmişəm, O qədər görüşümə gəlirlər ki, vaxtımı alır, narahatlığıma səbəb olurlar. Onlardan xilas olmaq üçün mənə bir yol göstər.

Dedi:

–Yoxsullara borc ver, varlılardan borc istə. Bir daha ətrafına dolanmazlar.

Beyt

Əgər islam ləşkərində gəda düşsə önə tək,
İstəməsin bir pay deyə, kafir qaçar Çinədək.

**37. Hekayət**

Fiqh elmini[67] öyrənən bir tələbə atasına dedi:

–Vaizlərin bu gurultulu və bəzəkli sözləri əsla mənə təsir etmir, çünki onların sözləri əməllərilə düz gəlmir.

Şer

O, hamıya bu dünyanı at deyir,
Özü isə qızıl-gümüş cəm edir.



Hər alim ki, əməl etməz sözünə,
Heç vaxt onun inanmazlar özünə.
Alim odur pislik etməz heç kəsə,
Əməl edər özü, xalqa nə desə.

Beyt

Bir adam ki, hər zaman öz xeyrini axtara,
Özü yolu azmışdır, o hara, rəhbər hara?!

Atası dedi:

–Ey oğul, belə bir səhv mülahizəyə əsaslanıb xeyirxah adamların tərbiyəsindən üz çevirmək, alimləri azğınlıqda taqsırlandıraraq, məsum alim axtarıram – deyə elm öyrənməkdən məhrum olmaq düzgün iş deyildir. Bu, palçığa batmış korun məsəlinə bənzəyir. Nağıl edirlər ki, bir kor gecə qaranlıqda kedərkən palçığa batmışdı. O, çığırıb deyirdi:

–Ey müsəlmanlar, heç olmazsa mənim yolumun üstünə bir çıraq tutun.

Hazırcavab bir qadın korun sözünü eşidib dedi:

–Sən ki, çırağı görmürsən, çıraqla nə görəcəksən?

Həmçinin, moizə məclisi bəzzaz dükanı kimidir: orada pul verməsən, mal ala bilməzsən; buraya rəğbət bəsləməsən, səadət əldə edə bilməzsən.

Qitə

Alim hər nə söyləyərsə, canla-başla qulaq as,
Nəsihətçin onun dili bir söz tutana qədər.
O müddəi düz deməmiş, yanılmışdır sözündə,
«Bir yatmışı başqa yatmış necə oyada bilər?»[68]
Mərd odur ki, deyiləni yaxşı yadda saxlasın,
Daş üstündə ğazılsa da öyüd, nəsihət əgər!

Şer

Xanəqahdan[69] mədrəsəyə gələrək,
Bir sahibdil atdı əhli-təriqi.
Dedim : «fərqi nədir alim, abidin

Ki alimi tutub, atdın rəfiqa?»
Dedi: «O, öz kilimini qoruyur,
Bu çalışır xilas etsin ğəriqi»*

**38. Hekayət**

Bir sərxoş gənc yol kənarında yatmış, özündən bixəbər yerə sərilib qalmışdı. Bir abid oradan keçərkən bu iyrənc mənzərəyə nəzər saldı. Gənc məstlik yuxusundan baş qaldıraraq bu ayəni oxudu: – Mömin adamlar iyrənc şeylərin yanından keçərkən, kəramət edib onu görməməzliyə vurarlar...

Şer

Günahkar görəndə eybini açma,
Daima səbirli, mərdanə ol sən.
Bir nöqsan görsən də mənim işimdə,
Olmazmı lütfünlə onu örtəsən?

Şer

Hər günah edəndən sən üz döndərmə,
Ona əfv edənlər kimi sal nəzər,
Mən əgər cavanmərd deyiləm işdə.
Sən mərd ol, kəramlə bir qayğu göstər.

**39. Hekayət**

Bir dəstə əyyaş bir dərvişlə sözə gəldilər, ağızlarına gələn nalayiq söyüşlər söyüb onu əzişdirdilər. Dərviş şikayət üçün mürşüdün yanına getdi, başına gələni nəql etdi.

Dedi: – Ey oğul dərviş xirqəsi razılıq, dözümlük libasıdır, onu geyən hər zülmə qatlaşmalıdır, əks halda dərvişliyi tərk edib xirqəni çıxartmalıdır.

Beyt

* ьяриг – Суда боьулан



Ümman bir daş ilə heç dalğalanmaz,
Arif inciyərsə, dayazdır-dayaz.

Şer

Bir zərər dəyərsə sənə səbr elə,
Əfv ilə günahdan təmizlənərsən;
İndi ki, hər şeyin sonu torpaqdır,
Torpaq tək sakit qal, elə indidən.

**40. Mənzum hekayət**

Sənə bir hekayət söyləyim dinlə,
Bağdadda deyişdi bayraq pərdəylə
Bayraq öz alından edib şikayət
Pərdəyə acıqla dedi nəhayət
«Bizki, hər ikimiz mərdü mərdana,
Xidmət eləyirik eyni sultana.
Neçün dincəlmirəm xidmətdə bir -an,
Səfərdə puç olur ömrüm hər zaman.
Sən isə bilmirsən əziyyət, hasar,
Nə səhra görürsən, nə toz, nə qubar,
Belə ağır ikən mənim xidmətim,
Bəs neçün sən qədər yoxdur hörmətim?
Sən gözəl bəndələr qucağındasan,
Səninlə əl verir hər nazlı canan.
Mən isə gəzirəm hey əldən-ələ.
Çöllərdə sərkərdan qalmışam hələ»
Dedi: «Mənim başım asitandadır.
Lakin sənin başın asimandadır.
Kim biça boynunu dik tutsa hər an,
Gəzər boyunlarda belə sərkərdan».

**41. Hekayət**

Ariflərdən biri bir pəhlivanı hirslənmiş və ağzı köpüklənmiş görüb soruşdu:

–Buna nə olubdur?

Dedilər:

–Filan adam onu söyübdür.

Arif adam dedi:

–Bu necə işdir ki, bu yaramaz min batmanlıq daşı götürə bilir, lakin bircə sözü götürə bilmir?

Şer

Sən, gücündən dəm vurub, demə «cavanmərdəm mən»
Mərdlik deyil nəfsinə qul olub aciz durmaq.
Hünərin var şirin et bir ağızı, yoxsa ki,
Cavanmərdlik deyildir ağıza zərbə vurmaq.

Şer

Birisi filə də qalib gəlirsə,
O, hələ qəhrəman cavan deyildir.
Torpaqdan yoğrulmuş insanın zatı,
Təmkini olmasa, insan deyildir.

**42. Hekayət**

Bir böyük adamdan Səfa qardaşlarının[70] xasiyyətlərini soruşdum. Dedi:

–Ən azı odur ki, dostlarının xeyrini öz şəxsi mənafelərindən üstün tutarlar.

Alimlər deyiblər: «Yalnız öz hayına qalan qardaş, nə qardaşdır, nə yoldaş».

Beyt

Yol yoldaşı tələsərsə, qoy o getsin, sən dincəl,
Sənlə dostluq etməyənə, sən də ürək vermə, gəl.

Beyt

Dəyanət görməsən əgər qohumdan,
Qısırlıq yaxşıdır belə doğumdan.



Yadımdadır, müddəilərdən birisi mənim bu beytimə etiraz edib dedi ki, allah öz müqəddəs kitabında rəhmsiz olmağı qadağan etmiş, yaxın adamları sevməyi buyurmuşdur, sənin dediklərin isə bunlara ziddir. Dedim qələt edirsən, Quranda deyilmişdir:

«Əkər ata-anan çalışıb bir şeyi mənə şərik qoşmağa səni vadar etsə, onlara itaət etmə!»

Beyt

Haqqı yad etməyən min qohumdansa,
Xoşdur bir yad dosta ürək bağlansa.

**43. Mənzum hekayət**

Bağdadda çox zərif bir qoca vardı,
Qızını bir başmaq tikənə verdi.
Qızın dodağını o kobud, nadan;
Elə sordu ondan axdı qızıl qan
Səhəri atası bu halı görçək,
Damadın yanına yola düşdü tək.
Soruşdu: «Ay alçaq, bu necə dişdir?
Dodaq çeynəyirsən, bu necə işdir?»
Bunu zarafatla deməyirəm mən.
Şuxluğu ataraq ciddini al sən.
Təbə hakim olsa pis xislət, inan,
Ölüncə o şəxsin çıxmaz canından.

**44. Hekayət**

Bir fəqihin həddən artıq çirkin bir qızı vardı. Cehiz, var-dövlətə baxmayaraq, qızını alan olmurdu.

Beyt

İpək də, xara da çirkin görünər,
Çirkin bir gəlinə örtülsə əgər.

Nəhayət, qızını bir kora verməк məcburiyyətində qaldı. Nağıl

edirlər ki, o zaman Sərəndibdən[71] bir həkim gəlmişdi, o qədər məharətli idi ki, kor gözü də aça bilirdi. Bir gün adamlar alimdən soruşdular:

–Nə üçün kürəkənini müalicə etdirmirsən?

Alim dedi:

–Qorxuram ki, gözü açılandan sonra qızımı boşasın!

Misra!

Çirkin arvadlara kor ər kərəkdir.

**45. Hekayət**

Bir padşah dərvişlərə alçaq nəzərlə baxırdı. Onlardan biri bunu sezib dedi: – Ey şah, bu dünyada doğrudur, ordumuz yoxdur, bunda səndən daldayıq, lakin güzəranımız xoşdur. Öləndə bərabərik, qiyamətdə isə səndən irəlidə olacayıq.

Şer

Ölkə alan padişahlar qoysalar da qızıl tac.
Dərvişlər də çörək üçün duysalar da ehtiyac,
Hər ikisi ölən dəmdə olar bir cür natəvan.
Aparmazlar bir kəfəndən başqa bir şey dünyadan.
Can mülkündən bir gün köçmək lazım gələrsə əgər
Gədalıq çox sultanlıqdan şərafətli körünər.

**46. Hekayət**

Dərvişliyin zahiri əlaməti köhnə paltar, qısa saçdır, lakin haqiqətdə nəfsini öldürüb, qəlbini diri saxlamaqdır.

Şer

Arif deyil qapılarda dolaşan,
İddiası rədd olduqda savaşan.
Arif odur, dağdan uçsa bir qaya,
O qayanın qarşısından qaçmaya.



**Tərbiyət.**

Dərvişliyin yolu zikr, şükür, ibadət, itaət, sədəqə, qənaət, tohid, təvəkkül, hər çatinliyə qatlaşıb hər bəlayə dözməkdir. Bu sadalanan sifətlər kimdə varsa, qəba geymiş olsa da əsl dərvişdir. Lakin, hərzə-hərzə danışan, binəmaz, xeyrə-şərə yaramaz, əyyaş, səhərdən axşama qədər şəhvət hayına qalan, axşamdan səhərə qədər qəflət yuxusuna dalan, qabağına gətiriləni yeyən, ağzına gələni deyən, əba geymiş olsa da, dərviş deyil, lotudur.

Batini təğvadan[72] boş olan yazıq.
Zahirdə geymisən riyadan paltar
Qapından yeddi rəng pərdə, gəl, asma,
Sənin ki evində bircə həsir var.[73]

**47. Mənzum hekayət**

Təzə gül gördüm mən, bir neçə dəstə,
Bağlanıb ot ilə bir-biri üstə.
Dedim: «Vəcsiz otun nə nisbəti var,
Ki, tutsun gül ilə bir səfdə qərar?
Ot həmən ağlayıb dedi: «Sus bir az,
Kəramət əhlinə bu söz yaraşmaz.
Yoxsa da ətirim, rəngim, camalım.
Mənim də o bağda artmış kəmalım.
O bağın otuyam vəfalı bəndə,
Onun sayəsində boy atdım mən də.
Hünərli, hünərsiz olsam da, həmən
Allahın lütfündən yaranmışam mən.
Yoxsa da zatımda bir qabiliyyət.
Qüdrətim çatmırsa edim ibadət.
O özü tapacaq bu dərdə çarə,
Başqa yol qalmamış hər etibarə
Qaydadır böyüklər fərman verəndə
Əvvəl azad olar qocalmış bəndə».
Dünyanı düzən ey böyük yaradan,
Bu qoca bəndəni bağışla haman

Ey Sədi, razılıq Kəbəsinə gir,
Allahın qapısı sənin yerindir,
Yazıqdır bu böyük qapıdan qaçan.
O başqa bir qapı tapmaz heç zaman.

**48. Hekayət**

Bir filosofdan soruşdular: «Səxavət yaxşıdır, yoxsa şücaət?»
Dedi:
– Səxavəti olanın şücaətə nə ehtiyacı?

Beyt

Bəhrami-gur məzarında yazılmışdır aşikar,
Kəramətdə zorlu qoldan daha artıq quvvət var.

Şer

Qalmadı dünyada Hatəmi-Tai[74]
Onu yaxşılıqdır daim yaşadan
Malından zəkat ver, çünki üzüm də
Artar, meynələri kəsdikcə bağban.



## III FƏSİL

## QƏNAƏTİN FƏZİLƏTİ HAQQINDA

**1. Hekayət**

Hələb[75] şəhərinin bəzzazlar bazarında Qərb ölkələrindən gəlmiş bir dilənçiyə rast gəldim. O, xalqa müraçiətlə deyirdi:
–Ey varlılar, sizdə insaf, bizdə qənaət olsaydı, dünyada dilənçilik qalmazdı.

Şer

Məni ey qənaət, dövlətli eylə,
Dünyanın səndən xoş neməti yoxdur.
Loğmanın hikməti səbrilə oldu,
Kimdə səbr olmasa hikməti yoxdur.

**2. Hekayət**

Misirdə iki şahzadə var idi. Biri elm oxuyur, digəri mal toplayırdı. Nəhayət, biri əsrinin alimi, o biri Misirin hakimi oldu. Bir gün hakim qardaş alim qardaşa həqarətlə baxıb dedi:
–Mən səltənət aldım, sən isə yoxsulluqda qaldın.
Dedi:
–Mən öz taleyim üçün o böyük allaha daha çox şükür etmə–liyəm, çünki peyğəmbərlər və alimlər mirası, yəni elm mənə; Firo–un və Haman[76] mirası, yəni Misir hökmdarlığı isə sənə çatmışdır.

Şer

Qarınçayam, ayaq altda əzilləm,
Mən deyiləm nəştər vuran bir arı.
Bu nemətə neçə şükr etməyim ki,
Guçüm yoxdur inçidəm insanları.

**3. Hekayət**

Nağıl edirlər ki, bir dərviş ehtiyacın alovu içində yanır, cındır paltarını yamayır, öz küskün könlünə təskinlik verib deyirdi:

Beyt

Biz razıyıq sadə paltar, su və quru çörəkdən,
Xoşdur çəkmək möhnət yükü xalq minnəti çəkməkdən.

Kimsə ona dedi:

– Nə oturubsan, dur, filan adamın yanına get! O, çox səxavət, kəramət sahibidir, dərvişlərə rəğbət bəsləyir. Hamı onu ürəkdən sevir. Halından xəbərdar olsa, məmnuniyyətlə qarşılayıb, sənə hörmət edər.

Dərviş dedi:

– Sus, başqalarına əl açmaqdansa, aclıq içində ölmək yaxşıdır!

Şer

Yamaq tikib bir guşədə səbr eyləmək yaxşıdır,
Nə, ki, gedib paltar üçün xanı tərif eləsən,
Doğurdan da bir cəhənnəəm işgəncəsi kimidir.
Öz qonşunun sayəsində sən cənnətə gedəsən

**4. Hekayət**

Əcəm hökmdarlarından biri Məhəmməd peyğəmbərin yanına bilikli bir həkim göndərdi. Həkim bir neçə il Ərəbistan ölkələrində qaldı, lakin bu müddəat ərzində heç kim ona müalicə üçün müraciət etmədi. Nəhayət, o, Məhəmməd peyğəmbərin yanına gəlib şikayətləndi:

–Məni sizin adamlarınızı müalicə etmək üçün buraya göndəriblər. Ancaq bu müddət ərzində heç kim yanıma gəlməyibdir ki, öhdmə düşən vəzifəni yerinə yetirəm.

Peyğəmbər dedi:

–Bu camaatın bir adəti var: acmamış yeməzlər, doymamış yeməkdən əl çəkərlər.

Həkim dedi:



–Demək onların sağlamlıqlarının səbəbi b imiş.
Sonra təzim edib yeri öpdü və getdi.

Şer

Ariflər o zaman başlar kəlamə,
Ya da əl uzadar o vaxt təamə,
Ki, söz soyləməsə törəsin ziyan,
Ya da ac qalarsa zəifləsin can.
Mütləq dediyində bir hikmət olar
Yeyib içdiyi də bir qüvvət olar.

**5. Hekayət**

Biri hey tövbə edər, sonra da həddən çox yeyərdi. Axırda bir şey ona dedi: –Görünür çox yeməyə adət edibsən, nəfsin asıldığı tövbə bağı isə tükdən də nazikdir, sən ki, bu nəfsini belə bəsləyirsən, o, tük nədir lap zənciri də qırar.

Beyt

Birisi bəslərdi qurd balasını,
Böyücək məhv etdi öz ağasını.

**6. Hekayət**

Ərdəşir Babəkan[77] haqqında nağıl edirlər ki, bir gün o, bir ərəbə hakimindən soruşdu:

–Gündə nə qədər yemək lazımdır?

Dedi:

–Yüz dirəm ağırlığında.

Dedi:

–Bu qədərdən nə güc olar?

Dedi:

–Bunun gücü səni ayaq üstə saxlayır. Ondan çox isə artıq yük olar!

Beyt

Yemək lazım yaşamaqçün, deməkçün,
Səncə həyat lazım ancaq yeməkçün?!



**7. Hekayət**

İki Xorasanlı dərviş yol yoldaşı olub səfərə çıxdılar. Biri arıq idi, iki gündən bir yeyərdi. Digəri kök idi, gündə üç dəfə nahar edərdi. Təsadüfən bir şəhərə girəndə onları casus güman edib tutdular və hər ikisini zindana saldılar. İki həftə sonra günahsız olduqları aşkar oldu. Onları azad etmək istərkən kögün öldüyünü, arığın isə salamat qaldığını gördülər.

Camaat bu işə təəççübləndi. Orada bir alim var idi, dedi: – Bunun əksi təəccüblü olardı; çünki kök çox yeyən idi, aclığa dözməyib öldü, arıq az yeyən idi, aclığa tab gətirib, xilas oldu.

Şer

Adam az yeməyə edərsə adət,
Çətinlik zamanı tab edə bilər.
Qarınpa firavan yaşayar, amma,
Darlığa düşəndə acından ölər.

Beyt

Qarın təndirini tez–tez qalayan,
Dərd çəkər qıtlığa düşdüyü zaman.

**8. Hekayət**

Alimlərdən biri oğlunu çox yeməkdən çəkindirib dedi: «Doyunca yemək adamı xəstələndirər!». Oğlu dedi:

–Ay ata, adamı açlıq öldürər! Məsəl var deyərlər: «Açından ölməkdənsə, toxluqdan ölmək yaxşıdır»!

Atası dedi:

– Oğul, hər şeyin dərəçəsi var, eşitməmisənmi demişlər: «Yeyin, için amma həddini bilin!»

Beyt

O qədər çox yemə ağırlıq etsin,
O qədər aç qalma, can əldən getsin,

Şer

Yemək verməlidir vücuda ləzzət,
Çox olsa, verəcək əzab, əziyyət
Gülşəkar ziyandır, çox yesən əgər.
Az yesən, küt çörək olar gülşəkər.

Beyt

Qarınpa olmaqdan əl çək kişisən,
İt də çox yeməklə düşər hörmətdən.

**9. Hekayət**

Bir xəstəyə dedilər: – Ürəyin nə istəyir? Dedi: – Ürəyim «heçnə» istəyir.

Beyt

Bir mədə pozulub, ağrısa qarın,
Nə xeyri dünyada dövlətin, varın?

**10. Hekayət**

Vasit[78] şəhərində yaşayan bir baqqalın sufilərdə bir, qədər pulu vardı. O hər gün pulunu tələb edir, sufilərə ağzına gələni deyirdi. Borclular isə onun təhqirli sözlərindən zara gəlir, lakin dözməkdən savayı çarə tapmırdılar. Gördüm, onların arasında olan ağıllı bir adam belə deyir:

–Baqqaldan dirəm almaqdansa, nəfsini öldürüb ac qalmaq yaxşıdır.

Şer

Dərbanların cəfasını çəkməkdənsə yəqin ki,
Ağaların ehsanını rədd eyləmək yaxşıdır.
Qəssabların pis üzünü görməkdənsə bir daha.



Ürəyində ət arzusu qalıb elmək yaxşıdır.

**11. Hekayət**

Tatar[79] müharibəsində bir iyid ağır yaralanmışdı. Biri ona dedi:
–Filan tacirdə dərman var, istə, bəlkə verdi.
Deyirlər ki, o tacir xəsislik və paxıllıqda məşhur imiş.

Beyt

Süfrəsində çörək deyil, günəş olsaydı əgər,
İşıqlı gün görməz idi bu dünyada bir nəfər

İgid dedi.
–Dərman istəsəm, ya verəçək, ya verməyəcək; versə ya xeyir edəcək, ya etməyəcək. Demək, elə bir tacirdən dərman istəməyin özü mənim üçün zəhər içmək kimi bir şeydir.

Beyt

Minnətlə alınsa alçaqdan təam,
Yeyib kökəlsə də alçalar adam.

Atalar demişlər: «Abırını alıb, dirilik suyu versələr, ağıllı adam onu almaz, çünki zillətlə yaşamaqdansa, izzətlə ölmək yaxşıdır».

Beyt

Xoş sifətli bir adamdan alıb qanqal da yesən
Çox yaxşıdır bədsifətin verdiyi bal, şəkərdən.

**12. Hekayət**

Bir alimin yeyəni çox idi, gəliri az. Mənsəb sahiblərindən birinin alimə hörməti var idi, məsələni ona açdı. Mənsəb rahibi qaşqabağını tökdü, alimin dilənməsi ona iyrənc göründü.

Şer



Sən bəxtindən şikayət edib küsgün sifətlə
Əziz dostun yanına getmə, qəmlətmə onu.
Bir xahiş eyləyəndə gülər üzlü, şad görün,
Açıq alın istəyər iş sahibi dostunu.

Nağıl edirlər ki, o, alimin vəzifəsini balaca artırdı, lakin ona olan hörmətini xeyli azaltdı. Bir az keçdikdən sonra alim özünə qarşı əvvəlki hörmətin olmadığını hiss etdi və dedi:-- zəhirmar olsun o yemək ki, rəzalətlə qazanacaqsan, qazan ocaqda qaynayacaq, sən isə rüsvay olacaqsan!

Beyt

Alçalmaq yoluyla kim tapsa çörək,
Özünü alçaltmış o adam demək.

Beyt

Çörəyim artdıqça əksildim haman,
Yoxsulluq yaxşıdır sail olmaqdan.

**13. Hekayət**

Bir dərvişin bir şeyə artıq dərəçədə ehtiyaçı var idi. Biri ona dedi:
–Filan adam çoxlu mal-dövlət sahibidir, əgər möhtac olduğunu bilsə, mütləq sənə kömək edər.
Dərviş dedi:
–Axı, mən onunla tanış deyiləm.
Dedi:
–Mən tanış edərəm.
Dərvişin əlindən tutub haman adamın evinə apardı. Dərviş evə daxil olduqda sallaqdodaq, qaraqabaq bir adamın oturduğunu gördü, dərhal dinməz-söyləməz geri döndü.
Bələdçi soruşdu:
–Sən nə etdin?
Dedi:
–Onun xələtini sir–sifətinə bağışladım.

Şer

Dərdini deyəndə o şəxsə de ki,
Ən azı xoş dillə dindirər səni
Nanəcib adamdan mətləb istəmə,
Ki, acı dililə rədd edər səni.

**14. Hekayət**

Bir il İskəndəriyyədə[80] quraqlıq oldu. Yoxsulların taqəti əldən getmiş, səbri tükənmiş, göylərin qapısı yerin üzünə qapanmış, yerdəkilərin ahı göyə dayanmışdı.

Şer

Dərd çəkir hər canlı balıq, quş, ilan.
Yırtıçı vəhşilər, qarınca belə,
Bəs neçün cəmlənib dönmür insanın
Ahları buluda, göz yaşı selə?!

Belə bir ildə rəzil bir adam var idi ki (dostlardan uzaq olsun), onun pisliklərini təsvir etmək, xüsusi ilə böyüklər qarşısında, ədəbsizlik olar, lakin o haqda bir şey deməmək də ədalətsizlikdir, bəziləri bunu yazıçının acizliyi kimi qəbul edə bilər. Ona görə bir-iki Beytlə kifayətlənmək istəyirəm, çünki, deyiblər: «azlıq çoxluğa dəlalət edir, bir ovuc – xarvar əlamətidir».

Şer

Bir tatar öldürsə bu müxənnəsi,
Tatardan alınmaz bir də intiqam.
Bağdad görpüsünün neçə müddətdir,
Altından su keçir, üstündən adam.

Mərifətini bir balaca eşitdiyiniz bu adamın haman qıtlıq ilində bitməz-tükənməz sərvəti var idi, yoxsullara qızıl–gümüş paylayır, aç–yalavaclara süfrə açırdı.

Dərvişlərin bəziləri aclıqdan taqətdən düşmüş, canlarından



bezmişdilər. Onun qapısına getmək qərarına gəldilər, məsləhət üçün mənə müraciət etdilər.

İzzəti–nəfsim yol vermədi, onların bu fikrinə razı olmadım və dedim:

Şer

Şir yeməz heç zaman it artığını,
Acından ölsə də bir mağarada.
Biçarə, qarnı ac yaşasan belə,
Alçağa əl açma, sakın dünyada.
Hünərsiz bir adam Fridun olsa,
Rədd eylə, baxma heç dövlətə, ada
Naəhlin geydiyi o ipək paltar,
Salar divardakı bəzəyi yada

**15. Hekayət**

Hatəmi–Taidən soruşdular ki, dünyada özündən səxavətli bir adam görüb, eşitmisənmi?

Dedi:

– Bəli, bir gün qırx dəvə qurban kəsib ərəb əmirləri ilə səhranın bir guşəsinə çəkilmişdim. Meşədən şələ bağlayıb aparan bir odunçu gördüm.

Dedim: – Nə üçün hatəmin qonaqlığına getmirsən, bu saat bütün xalq onun süfrəsi başına toplanmışdır.

Dedi:

Kim öz əməyilə dolansa əlbət,
Hatəmi–Taidən götürməz minnət.

İnsafla demək lazımdır ki, mən onu özümdən daha səxavətli və mərd gördüm

**16. Hekayət**

Musa[81] əle1hissəlam gördü ki, çıplaq bir dərviş utandığından

özünü quma basdırıb.

Dərviş dedi: – Ya Musa, dua et, allah mənə var versin, yoxsulluqdan çanım boğazıma yığılıb.

Musa dua edib getdi.

Bir neçə gündən sonra münacatdan qayıtdıqda gördü ki, haman dərviş zəncirlənmiş və başına çoxlu adam toplanmışdır. Dedi:

–Buna nə olmuşdur?

Dedilər:

–Şərab içib, dava salmışdır, adam öldürmüşdür. Edamını əmr etmişlər.

Şer

Mümkündür bir aciz güclənib gedə,
Başqa acizləri qıra, məhv edə.

Musa əleyhissəlam Dünya yaradıcısının hikmətinə bir daha afərin dedi, belə bir duaya cürət etdiyi üçün üzr istədi...

Şer

Bir namərdin artsa pulu, rütbəsi,
Lazım gəlir ona sillə vurasan,
Bilmirsənmi o filosof nə dedi:
Qarıncaya pər verməsin yaradan.

Beyt

Bir kəs ki, var–dövlət sənə verməyir
O sənin xeyrini səndən çox bilir.

Atasının çoxlu balı vardır, övladı isə qızdırmadan sayıqlayır.

**17. Hekayət**

Bəsrədə[82] cəvahir satanlar içərisində bir dəvəçi ərəb ilə tanış oldum. O, nağıl edirdi ki, vaxtilə çöldə yolu azmışdım, yeməyə bir



şeyim olmadığı üçün ölümü gözümün qabağına almışdım. Bu anda bir kisə mirvarı tapdım. Güman etdim qorğadır, elə sevindim ki, o sevinc hələ indi də yadımdan çıxmayıbdır, mirvari olduğunu bildikdə isə elə gədərləndim ki, hələ indi də o acınacaqlı halımı unuda bilmirəm.

Şer

Susuz biyabanda, isti qumlarda,
Təşnəyə mirvari, inci nə gərək?
Acından yıxılıb qalançın nə fərq,
Qurşaqda dürr olsun ya quru təzək.

**18. Hekayət**

Bir ərəb susuz bir səhrada təşnəlikdən dad çəkərək deyirdi:

Şer

Nolardı ölümdən qabaq birçə gün.
Çataydım arzuma mən də müxtəsər.
Bir çaya düşəydim suyu dizədək,
İçəydim tuluğum dolana qədər.

**19.Hekayət**

Bir müsafir Bəsit çölündə azmış, azuqəsi də qurtarmışdı. Qurşağındakı bir neçə dirəmdən səvayi heç bir şeyi qalmamışdı. O nə qədər gəzib, dolaşdısa yolu tapa bilmədi və nəhayət aclıq və susuzluqdan həlak oldu. Bir neçə yoldan ötən onun başı üstə gəlib gördülər ki, dirəmləri gözləri qarşısına qoyub, torpaq üstə bu sözləri yazmışdır:

Şer

Cibi saf qızılla dolu bir şəxsə,
Çörəksiz yaşamaq mümkünmü bir an?
Səhrada istidən yanan, bir kəsə

Bişmiş şəlğəm xoşdur bir cib qızıldan.

**20. Hekayət**

Mən heç vaxt zamananın gedişindən nalə etməmiş və fələyin gərdişindən şikayətlənməmişəm, yalnız bir dəfədən başqa. Bir dəfə ayaqyalın qalmışdım, ayaqqabı almağa isə imkanım yox idi. Qanı qara halda Kufə məscidinə gəldim, ayaqsız bir adam gördüm: Allaha şükür edib ayaqqabısızlığa dözdüm.



Şer

Qızardılmış cücələr tox adamın gözünə,
Süfrə üstə qoyulmuş tərədən pis görünər.
Pulsuz və ac adama bişmiş şəlğəm özü də,
Qızardılmış cücədən daha nəfis görünər.

**21. Hekayət**

Hökmdarlardan biri qış fəslində bir dəstə yaxın adamları ilə birlikdə ova çıxıb, şəhərdən xeyli uzaqlaşmışdı. Qaranlıq düşdükdə hökmdar yaxınlıqda bir kəndli daxması görüb soyuqdan qorunmaq üçün orada gecələməyi məsləhət bildi. Vəzirlərindən biri etiraz edərək dedi:

–Yüksək mənsəbli hökmdara yaraşmaz ki, çirkli bir kəndlinin daxmasına pənah gətirsin. Əmr et elə burada çadır qurub, od yandırsınlar.

Kəndli bu məsələdən xəbərdar olcaq yemək hazırlayıb, çadıra gətirdi və təzim edərək dedi:

–Kəndli daxmasına gəlməklə hökmdarın qədr–qiyməti azalmazdı, lakin görünür ki, kəndlinin qədr–qiymətinin artmasına razı olmamışlar.

Kəndlinin sözü hökmdarın xoşuna gəldi və gecə ikən köçüb onun evinə getdi. Səhər kəndliyə çoxlu pul və bəxşiş verilməsini əmr etdi. Hökmdarı müşayiət edərkən kəndli ondan bir neçə addım geridə gedir və deyirdi:

Şer

Sultanın şöhrəti aşağı düşməz,
Olarsa bir gecə kəndliyə mehman.
Kəndlinin yüksələr fələyə başı,
Qonağı olarsa qüdrətli sultan.

**22. Hekayət**

Nağıl edirlər ki, nankor bir dilənçi, çoxlu mal yığmış, hədsiz dövlət toplamışdı.

Beyt

Geçə–gündüz həris idi qızıl–gümüş yığmağa,
Qızıl–gümüş düşmüş idi bir namərddə dustağa.

Padşahlardan biri ona dedi: – Danışırlar ki, sənin sərvətin həddini aşıbdır, bizim isə pula böyük ehtiyacımız vardır. Əgər ondan bir az əlborcu versən, məhsul yığıldıqda, vergi toplandıqda qaytarılıb sənə təşəkkür edilər. Dedi: – Ey yer üzünün allahı, şahın şəninə yaraşmaz ki, əlini mənim kimi bir dilənçinin murdar malı ilə çirkaba bulasın. Çünki mən onları dilənçilik yolu ilə dənə–dənə toplamışam, xırda–xırda yığmışam. Şah dedi: – Eybi yoxdur, düşmənə verəcəyəm.

Beyt

Nəsrani quyusu pak olmasa gər,
Cuhud meyyidini yumağa dəyər.

Beyt

Dedilər ki, əhəgin xəmiridir natəmiz,
Dedik ayaqyoluna suvayarıq onu biz.

Deyirlər ki, şahın təklifini rədd etdi, höcətə başladı, min bir bəhanəyə əl atdı. Şah əmr etdi lazım olan pulu ondan zorla döyədöyə alsınlar.

Şer

Bir iş ki, lütf ilə yerinə yetməz,
Axır hörmətsizlik baş verər əbəs.
Hər kəs başqasına xeyir verməsə
Düz olar, ona xeyr verməsə bir kəs.

**23. Hekayət**

Bir taçirin yüz əlli dəvə yükü malı, qırx qulu və xidmətçisi var idi. Bir axşam o Giş adasında[83] məni öz yanına çağırdı, bütün gecəni

sakit olmayıb boş–boş danışmağa başladı ki, Türküstanda filan anbarım var, Hindistanda filan malım, bu filan yerin qəbaləsidir, bu filan şeyin zəmanəti. Gah deyirdi: İskəndəriyyənin havası xoşdur, oraya gedəcəyəm, gah da əvvəl dediyinin əksinə danışırdı. Yox, Məğrib dənizi qorxuludur, ora gedə bilmərəm. Sonra dedi: – Ey Sədi, bir səfərim də qalmışdır, əgər o, baş tutsa, qalan ömrümü bir guşədə oturub dinc yaşayacağam.

Soruşdum:

– O hansı səfərdir?

Dedi:

–Farsdan Çinə kükürt aparacağam, eşitdiyimə görə çox bahadır. Oradan Çin kasası alıb, Ruma[84] Rumdan ipək alıb, Hindistana, Hindistandan polad alıb Hələbə, hələbdən şüşə alıb Yamənə, Yəməndən də paltar alıb vətənə qayıdacağam. Ondan sonra artıq ticarət daşını atıb bir dükanda oturacağam.

Xülasə, o qədər belə hədərən–pədarən danışdı ki, axırda taqətdən düşdü. Sonra mənə müraciət edərək dedi:

– Sədi, sən də gördüklərindən, eşitdiklərindən bir şey danış!

Dedim:

Şer

Eşitdinmi biyabanda bir tacir,
Atdan düşüb söylədi son sözünü:
«Doydurar ya qəbir, ya da qənaət
O dünyagir xəsisin ac gözünü».

**24. Hekayat**

Nağıl edirlər ki, Hatəmi–Tai səxavətdə məşhur olduğu kimi, bir varlı da xəsislikdə şöhrət tapmışdı. O, zahirini dünya malı ilə bəzəmiş, lakin batinində elə bir xəsislik kök salmışdı ki, nə Əbu Hüreyrənin pişiyinə bir tikə ət verər, nə də Əshabi–Kəhfin itinə bir parça sümük atardı. Çan bahası olsaydı da heç kimə bir tikə çörək verməzdi. Xülasə, onun qapısını və süfrəsini açıq görən olmamışdı.

Beyt



Yoxsul onun qapısında iy çəkərdi xörəkdən,
Quşlar belə həyətində tapmazdı bir dənə dən

Bir gün o varlanmaq məqsədilə Məğrib dənizi ilə Misrə doğru səfərə çıxdı. Qarşı tərəfdən güclü külək əsməyə başladı, o, gəminin qərq olacağını başa düşdü.

Beyt

Mümkündür səndəki xislətə dözmək,
Düz gəlməz çox zaman gəmilə külək.

O, əllərini qaldıraraq faydasız yerə qışqırmağa və dua oxumağa başladı. Adamlar gəmiyə minəndə qorxularından allaha əl açıb dua edir və dinə sadiq olduqlarını inandırmağa çalışırlar.

Beyt

Möhtac bəndə dua vaxtı allahına əl açar,
Kərəm çağı əllərini qoynuna qoyub qaçar.

Şer

Qızıla, gümüşə etmə qənaət,
Onları sərf edib ömür sür rahət.
Bu ev ki, yadigar qalacaq səndən,
Düzəlt kərpicini qızıl–gümüşdən.

Həmin adam tufanda qərq oldu. Onun Misirdəki yoxsul qohumları bu ölüm münasibəti ilə cındır paltarlarını yırtıb, varlıdan miras qalmış ipək və xəzdən təzə paltar tikdirdilər. Hələ bir həftə keçməmiş gördüm ki, varislərindən biri yorğa bir ata minib, bir qulun müşayiəti ilə hara isə gedir.

Şer

Əgər ölən diriləərək gəlsəydi,
Qohumları içinə şad, üzü şən.

Mərhumun ölümü yüngül olardı,
Onun mirasını geri verməkdən.

Onunla qabaqcadan tanış olduğuma görə ətəyindən tutub dedim:



Şer

Ye, ey xoşbəxt, heç nəyə uf demədən,
Bədbəxt öldü yığdığını yemədən.

**25. Hekayət**

Bir zəif balıqçının torüna bir güclü balıq düşdü. Nə qədər əlləşdi onu saxlaya bilmədi, balıq zor gəlib, toru balıqçının əlindən aldı, dartıb özü ilə apardı.

Şer

Nökər getdi çaya ki, su gətirsin,
Çay daşaraq aldı onu apardı
Tor həmişə balıq dolu gələrdi,
Bu dəfə də balıq toru apardı

Camaat balıqçını danlamağa başlayıb dedilər: – Adam da elə balığı əldən buraxarmı?! Dedi: – Ay qardaş nə edim, görünür, mənə qismət deyilmiş, ya əcəli çatmamışmış.

Hikmət

Ruzusu olmasa, ovçu Dəclədə balıq tuta bilməz,
Əcəli çatmasa, balıq quru yerdə də ölməz.

**26. Hekayət**

Əli–ayağı olmayan bir adam bir qırxayağı öldurdü. Yoldan ötən bir arif onu görüb dedi:
–Çox təəccüblüdür! Gorünür ki, bu qırxayağın əcəli çatmışdı ki, qırx ayağı ola–ola bir əlsiz–ayaqsızın əlindən qaçıb qurtara bilmədi.

Şer

Quduz düşmən gələn zaman sürətlə dal tərəfdən,
Qaçan atın ayağını əcəl tutub bağlayar.

Düşmən saysız qoşun çəkib keçən zaman hücuma
Çəksən, Kəyan[85] kamanını fələk tutub saxlayar.

**27. Hekayət**

Qarnıyoğun bir əbləh əynində bahalı paltar, başında Misirsayağı çalma bir ərəb atına minib hara isə gedirdi.

Bir adam məndən soruşdu:

–Sədi, belə naxışlı ipək paltarı belə qanmaz bir heyvanın əynində necə görürsən?

Dedim:

Beyt

Eşşəkdir deyirəm mən bu nadana,
Səsindən öküzdür, yerişdə dana.

Bir gözəl xilqət min ipək xələtdən yaxşıdır.

Şer

Bənzədir insana kim bu heyvanı?
Paltarı andırır azca insanı,
Hər şeyi haramdır bu nanəcibin,
Halaldır təkcə bir tökülsə qanı.

Şer

Nəcibyoxsul olsa, yəqin bil, onun,
Azalmaz el içrə qədri, qiyməti.
Qızıl mıx vursalar gümüş təxtinə,
Yenə nanəcibin artmaz qiyməti.

**28. Hekayət**

Bir oğru bir dilənçiyə dedi: – heç utanmırsan ki, bir quruşdan ötrü hər kəsə əl açırsan?



Dedi:

Beyt

Əlim açılsa da hər kəsə bil sən
Yaxşıdır kəsilən bir oğru əldən.

**29. Hekayət**

Nağıl edirlər ki, bir yumruqvuran (boksçu), yoxsulluqdan və ağır yaşayışdan zara gəlmişdi. Öz vəziyyətindən atasına şikayət edərək dedi ki, səyahətə çıxmaq fikrindəyəm, bəlkə qolumun gücü ilə özümə bir gün qazana biləm.

Beyt

Söylə, nəyə lazımdır görsənməyən bir hünər?
Ud yananda, mişk isə əziləndə iy verər!

Atası dedi:

–Oğul, bu boş xəyalı başından çıxar, rahatlıq istəyirsənsə qənaət et. Böyük adamlar demişlər–: Dövlət təkcə çalışmaqla deyil, çətinliyə alışmaqla da mümkündür.

Beyt

Zor ilə kimsə mal toplaya bilməz,
Korun qaşlarına vəsmə çəkilməz.

Beyt

Başının hər tükündə yüz hünər olsa əgər,
Baxtın yoxsa bu hünər bir iş görməz tük qədər.

Oğlan dedi:

–Ey ata, səyahətin bir çox faydaları var: adamın könlünü açır və mənfəət gətirir. Səyahət edən adam dünyanın əcaib və qəraib şeylərini görüb eşidir, şəhərləri gəzib, xeyirxah adamlarla görüşür; məlumatı artır, yar–yoldaş tapır, şöhrət qazanır, var–dövlət sahibi olur, təcrübə əldə edir. Necə ki, təriqətçilər demişlər:

Şer

Evə və dükana bağlansan əgər,
Ey naşı, dünyada avam qalarsan.
Fürsətin var ikən get dünyanı gəz,
Köçməmiş bu qoca, köhnə dünyadan.

Atası dedi:

–Ey oğul, doğrudur, səyahətin mənfəəti çoxdur, ançaq beş qrup adam üçün: Birinçi – çoxlu malı, gözəl kəniz və qulamı, bacarıqlı xidmətçiləri olan tacir üçün: çünki hər gün bir şəhərə gedib, hər axşam bir yerdə gecələr, hər an təbiətin nemətlərindən faydalanıb, hikmətli sözlər eşidər.

Şer

Dövlətli dağda da qərib deyildir,
O hara gedərsə hörmət qoyular.
Hər kəs ki, məhrumdur dünya malındn,
Doğma evində də qəriblik duyar.

İkinci – şirin söhbəti, qüvvətli fəsahəti, qüdrətli bəlağəti sayəsində hər yerdə hermət, izzət qazanan alim üçün:

Şer

Ağıllı adamlar qızıl kimidir,
Haraya getsələr olar hörməti.
Böyük adamınsa səfeh övladı,
Saxta pul kimidir, olmaz qiyməti.

Üçüncü – aşiqlərin hüsn–rəğbətini cəlb edən nazənin dilbər üçün: çünki böyük adamlar demişlər: azca gözəllik dünyaca var-dövlətdən yaxşıdır! Gözəl dilbər xəstə qəlblərin dərmanı, bağlı qapıların açarıdır. Kim onunla müsahib olsa, özünü bəxtiyar sanar, ona xidmət göstərən minnətdar olar.

Şer



Gözəl hara getsə hörmət qazanar,
Valideyni onu evdən qovsa da.
Tavus lələyini quranda gördüm,
Dedim: «Layiqmisən belə busata?»
Dedi: «Sus, hər kəsin olsa Cçamalı,
Rədd olmaz haraya getsə dünyada».

Şer

Övladın kamalı, camalı olsa,
Ata da rədd etsə qorxusu yoxdur.
Mirvarı sədəfdə qalmasın gərək.
Ki, dürri–yetimi sevənlər çoxdur.

DördünCü – xoş avazı ilə çayda axan suyu, göydə uçan quşu saxlayan xanəndə üçün, çünki o, bu məlahətli səsi ilə musiqi aşiqlərinin gönlünü alar, məhəbbət əhli hər yerdə onunla dost olmağa çalışıb xidmət göstərməyə can atar.

Beyt

Bir gözəl nəğməni eşidirəm mən,
Kim çalıb oxuyur belə ürəkdən?

Şer

Gözəldir hər səsdə olsa məlahət,
O səhər məstinə verər təravət.
Gözəl səs yaxşıdır gözəl camaldan,
Bu, ruha güc verər, o, nəfsə ləzzət.

Beşinçi – bir parça çörəkdən ötrü biabır olmamaq üçün öz əməyinin gücü ilə pul qazanan peşəkar üçün; çünki ağıllı adamlar demişlər:

Şer

Qürbətə getsə pinəçi şübhəsiz,

Duymaz həmən yerdə ağır möhnəti.
Ölkəsini tərk eləsə padişah,
Ac yataraq hiss eləyər qürbəti.

– Ey oğul, bu dediyim sifətlər səyahət zamanı xatircəmliyə və gözəl istirahətə səbəb olar. Bu sifətlərdən məhrum olan adamlar xam xəyala düşüb dünyanı gəzərlərsə, heç kəs onlardan bir xəbər tutub, adını belə çəkməz.

Şer

Hər bir kəsə kinlə baxsa ruzigar,
Nə istəsə, istədiyi əks olar.
Yuvasına dönməməli bir quşu,
Qəza sərrast tora tərəf aparar.

Oğlan dedi:
–Ata, alimlərin dediklərinə necə zidd ola bilərəm ki, demişlər: – Doğrudur hər kəsin bir ruzusu var, lakin ona çatmaq üçün insan bütün imkanlardan istifadə etmədidir, hərçənd olacağa çarə yoxdur, amma buna baxmayaraq fəlakətə səbəb olan hadisələrdən qaçmaq lazımdır.

Şer

Şübhəsiz ki, ruzi verir yaradan,
Lakin gərək özün çarə tapasan.
Hər adamı aparsa da bir əcəl,
Əjdahanın ağzına sən girmə gəl.

Bir də mən elə güclüyəm ki, qızmış fili yıxar, qəzəblənmiş şirlə pəncələşə bilərəm. Ey ata, yaxşısı budur ki, səyahətə çıxım, yoxsa bundan artıq yoxsulluğa taqətim yoxdur:

Şer

Kim itirsə var–dövləti, nə qəmi
Sərbəst gəzsin qoy o bütün aləmi.



Varlı yatar saraylarda gecələr,
Yoxsul isə harda olsa geçələr.

Oğlan bunu deyib atasından xeyir–dua aldı. Vidalaşıb yola düşərkən o, öz–özünə deyirdi:

Beyt

Hünər sahibi olsa bəxtsiz adam,
Gedər bir yerə ki, tanınmaz tamam.

Oğlan bir qədər getdikdən sonra böyük bir çayın sahilinə çatdı. Çay elə güclü idi ki, iri qayaları bir–birinə çırpır, gurultusu bir ağac məsafədən eşidilirdi.

Beyt

Elə bir çay ki, ördəyi qorxudurdu hər zaman,
Xırdaca dalğasına dözmürdü daş–dəyirman.

Gördü ki, çayın kənarında bir dəstə adam səfər yügünü bağlayıb oturmuşdur. Pulsuz gəncin ehsan əli bağlı olduğuna görə, sədəqə əlini açmalı oldu. Lakin, nə qədər yalvardısa yardım göstərən olmadı. Hətta rəhmsiz gəmiçi də istehza ilə ondan üz çevirib dedi:

Beyt

Pulsuz keçə bilərsənmi zorla dəniz yolunu,
On dirinin zorundansa ver bir ölü pulunu!

Gənc, gəmiçinin tənəsindən hiddətlənib ondan intiqam almaq istədi. Lakin, bu zaman gəmi hərəkət etməyə başladı. Gənc sevinərək gəmiçiyə dedi:
– Əynimdəki paltara razı olsan, verərəm!
Gəmiçi tamahkarlığına görə gəmini qaytardı.

Beyt

Hərislik ağılı salar kəməndə,
Tamahsa quşları, balığı bəndə.

Elə ki, gəncin əli gəmiyə çatdı, gəmiçinin yaxasından tutub onu möhkəmcə döydü.



Beyt

Əlinə keçərsə məhv et əğyarı,
Ki, qısas ürəkdən silər qubarı.

Gəmiçinin yoldaşı gəmidən çıxıb ona kömək etmək istədi. Lakin o da bacara bilmədi. Nəhayət, bu qərara gəldilər ki, gənclə barışıb, onu pulsuz aparsınlar.

Şer

Acıq, hirs görəndə sus dayan zinhar,
Bəlanın qarşısın müdara alar.
Hər kimin olarsa bir şirin dili,
Tük ilə o çəkər dalınca fili.
Bərkliyə rast gəlsən yumşaqlıq göstər,
Ki, yumşaq ipəyi doğramaz xəncər.

Onlar gəncin ayaqlarına düşüb üzr istədilər və öpüşüb gəmiyə götürdülər. Gəmi yola düşdü. Bir qədər getdikdən sonra suyun ortasında yunanlılardan qalmış təmir sütununa rast gəldilər. Gəmiçi sərnişinlərə müraciət edərək dedi:

–Gəmi xarab olubdur, onu təmir etmək lazımdır. Bir nəfər güclü, igid adam sütuna çıxmalı və gəminin kəndirini ona bağlamalıdır. İgidliyinə qürrələnən gənc, incidilmiş ürəkdəki kini unutdu, halbuki, atalar demişlər: könlünü bir dəfə sındırdığın adama yüz dəfə yaxşılıq etsən də, yenə o bir pisliyin intiqamından ehtiyat etməlisən. Çünki süngü yarası sağalar, söz yarası sağalmaz!

Beyt

Xilbaşa verirdi Bəktaş nəsihət[86]
Düşməni döydünsə oturma rahət.

Şer

İncitsən bir qəlbi arxayın olma,
Ki, sənin öz qəlbin asudə qalar.

Hasarın bürçünə daş atsan bil ki,
Bir daş da hasardan sənə atılar.

Gənc gəminin kəndirini qoluna sarıyıb sütuna çıxan kimi, gəmiçi kəndiri dartıb onun əlindən aldı və gəmini sürüb getdi, yazıq gənc heyran qaldı. O, suyun ortasında iki gün əziyyət və əzab çəkdi, üçüncü gün yuxu onun yaxasından tutub suya saldı. Bir gecə–gündüz suda əl–ayaq çalıb əlləşdikdən sonra, nəhayət ölümcül bir halda sahilə çıxdı, ağaç yarpaqlarından, ot köklərindən yeyərək azacıq cana gəldi, sonra baş alıb çöllərə yollandı. Xeyli yol getdikdən sonra o, ac–susuz taqətdən düşmüş halda bir quyu başına çatdı. Bura toplanmış: camaat hərəsi bir qara pul verib su içirdi. Gəncin isə pulu yox idi. O, zorla məqsədə çatmaq istədisə, yenə mümkün olmadı. Ümidi kəsildi, bir neçə adamı gotürüb yerə vurdu. Camaat birləşib onun üstünə düşdülər, döyüb möhkəm əzişdirdilər.

Şer

Fildə çox olsa da qüvvət, cəsamət,
hünülər birləşsə yıxarlar yəqin.
İttifaq bağlasa qarıncalar da,
Dərisin deşərlər qızmış şirlərin.

Gənc çarəsiz qalıb, nəhayət karvanın dalınca yola düşdü. Karvan axşam vaxtı elə bir düşərgəyə çatdı ki, orada hər an oğruların basqın etməsi ehtimalı var idi. Karvan əhlinin qorxudan əsdiyini və ölümü gözləri qabağına gətirdiyini gördükdə gənc dedi:

–Mən tək başıma əlli adamın cavabını verə bilərəm. Əgər o biri gənclər də kömək etsələr, heç kim bizə bata bilməz.

Karvan əhli bu gopa inanıb ürəkləndilər, gənclə yoldaş olmaqdan sevinərək, onu su və yeməklə təmin etməyi lazım bildilər. Oğlanın acından az qalmışdı canı çıxsın. O, lap taqətdən düşmüşdü. Buna görə də onların verdiyi çörəkdən bir neçə tikə acgözlüklə yeyib, üstündən su içdi, toxdayıb şirin yuxuya getdi. Karvanda qoca bir kişi vardı. O, yoldaşlarına müraciət edib dedi:

–Ay yoldaşlar, mən oğrulardan çox sizin yanınızdakı bu adamdan qorxuram. Deyirlər ki, bir ərəb bir qədər pul toplamışdı. O, oğruların qorxusundan gecələr evində tək yata bilmirdi, buna görə dostlarından birini evinə gətirdi ki, ona ürək–dirək olsun. Dostu bir neçə gün evdə qaldıqdan sonra pulların yerini öyrəndi və oğurlayıb şəhərdən qaçdı. Sabahısı gün camaat ərəbin gözündə yaş, cibini boş görüb soruşdu:

–Sənə nə olub? Yoxsa pullarını oğru aparıbdır?

Dedi:

–Pullarımı oğru yox, gözətçi apardı.

Qitə

İlandan arxayın yaşamadım mən,
Bilirəm çalmaqdır onun xisləti.
İlanın dişindən daha bətərdir,
Dostcildli düşmənin qafil zərbəti.

Nə bilirsiniz, bəlkə bu gənc də oğrudur. O yəqan karvana qoşulubdur ki, fürsət tapıb yoldaşlarına xəbər elsin. Məsləhət görürəm ki, onu yuxuda qoyub yola düşək.

Karvandakı gənclər qocanın məsləhətani qəbul etdilər. Pəhləvanın qorxusu qəlblərinə çökdü, onu yuxuda qoyub yola çıxdılar. O bir vaxt yuxudan ayıldı ki, günəş xeyli qalxmış, karvandan isə heç bir əsər qalmamışdı. Yazıq nə qədər dolanıb axtardısa, yolu tapa bilmədi. Ac–susuz üzüquylu yıxıldı, ölümünü gözünün qabağına gətirərək dedi:

Beyt

Dəvələr yollandı, artdı qəm–gədər,
Qəribin həmdəmi olar qəriblər.

Beyt

Qəribə o adam verər əziyyət,
Ki, özü görməmiş ömründə qürbət.

Yazıq bu halda ikən ova çıxıb, qoşunlarından ayrı düşmüş bir şahzadə gəlib onun yanına çıxdı və oxuduqu bu şerləri eşitdi.

Şahzadə gənci diqqətlə gözdər keçirdi, görkəmini sadə, əhvalını

isə pərişan görüb soruşdu:

–Haralısan, necə olub gəlib bura çıxmısan?

Gənc başına gələn hadisələrin bəzilərini nağıl etdi. Şahzadənin qəlbi riqqətə gəldi, ona bəxşiş, xələt verdi, öz şəhəriiə salamat çatması üçün etibarlı bir adamla yola saldı.

Atası onu gördükdə, çox sevindi, sağ–salamat qayıqdığı üçün şükür etdi. Axşam olduqda gənc atasına gəmidə gəmiçinin verdiyi əziyyətdən, quyu başında çəkdiyi məşəqqətdən, səhrada karvan əhlinin ona rəva gördüyü xəyanətdən danışdı. Atası dedi:

–Oğul, gedəndə sənə demədimmi ki, yoxsulların güclü əlləri sındırılmış, pəhləvan qolları qırılmışdır.

Beyt

Nə gözəl söylədi yoxsul pəhlivan,
«Bir qızıl yaxşıdır, dağ qədər zordan»

Oğlan dedi:

–Lakin xəzinə tapmaq üçün zəhmətə qatlaşmaq, qələbə çalmaq üçün ölümlə çarpışmaq, taxıl əldə etmək üçün dən səpib, yerşumlamaq lazımdır. Görmürsənmi ki, azacıq əziyyət çəkməklə necə xoş rahatlığa çatdım, balaca acılıq dadmaqla necə şirin həyat tapdım?

Beyt

Artıq yeməsə də insan ruzidən,
Lazımdır yenə də bir iş görəsən.

Beyt

Nəhəngdən qorxarsa dənizdə qəvvas,
Heç zaman qiymətli incilər tapmaz.

Dəyirmanın alt daşı hərəkət etmədiyi üçün bütün ağırlıq onun üzərinə düşür.

Şer



Mağara içində nə tapar aslan?
Uçmayan qartala ovmu gələcək!
Kim evdə oturub ruzi gözləsə,
Axırda o dönüb olar hörümçək.

Atası dedi:

– Ey oğul, bu dəfə fələk sənə yar, taleyin huşyar olmuşdur. Bir dövlət sahibi sənə rast gəlmiş, əli-açıqlıq göstərərək həyata qaytarmışdır. Belə hadisə nadir hallarda olar. Nadir hadisələrə isə bel bağlamaq olmaz. Amandır ayıq ol, tamaha düşüb bir də belə boş xəyallara aldanma!

Beyt

Ovlamaz həmişə ovçu ahunu,
Bəzən də, parçalar pələng ovçunu.

Neçə ki, nağıl edirlər: Fars hökmdarlarından birinin barmağında qiymətli qaşı olan bir üzük varmış. Bir gün o bir neçə yaxın adamları ilə birlikdə Şirazda Müsəllayə[87] gəzməyə çıxır və əmr edir ki, həmin üzüyü Əzüdüddövlə məqbərəsinin[88] günbəzinin üstünə sancsınlar. Kim nişan alıb oxu üzüyün halqasından keçirsə, üzük onun olsun. Hökmdarın yanında derd yüz məharətli ox atan varmış. Onların hamısı üzüyü nişan alıb atırlar, lakin heç birinvn oxu üzüyə dəymir. Təsadüfən orada oynayıb, oyan-buyana havayı ox atan bir uşağın oxunu külək gətirib üzüyün halqasından keçirir. Beləliklə uşaq üzüyə sahib olub varlanır. Bundan sonra o uşaq ox atmağı tərk edib kamanını yandırır. Camaat bunun səbəbini soruşduqda deyir:

Ona görə ki, əldə etdiyim şöhrəti saxlaya bilim.

Qitə

Mümkündür gah qoca, müdrik bir alim,
Səhv etsin, işində olsun nöqsanı.
Gah da bir anlamaz, hünərsiz uşaq,
Səhvən sərrast atıb vursun nişanı.

**30. Hekayət**

Nağıl edirlər ki, bir şeyx bir mağarada yurd salmış, qapısını camaatın üzünə bağlamışdı.

Şer

Dünyada tək xilas olar dünyadan
Qapını üzünə bağlayıb qalan.

Qənaətin bərəkətindən nə şahlıq şövkətinin əhəmiyyəti və nə varlıların dövlətinin qiyməti onun nəzərində deyildi:

Şer

Yolçuluğu kim öyrənsə dünyada,
Ölənədək hər yetənə əl açar.
Hərisliyi at bir yana şahlıq et,
Tamahsızın başı daim ucalar.

O tərəfdəki hökmdarlardan biri xəbər göndərdi ki, «mömin adamların kəraməti xatirinə xahiş edirik ki, bizimlə duz-çörək kəsməyə razılıq versin».

Şeyx razılıq verdi, çünki rəvayətə görə peyğəmbər deyibdir ki, dəvəti qəbul edərlər, çağırılan yerə gedərlər.

Sabahı gün şeyxin halından xəbər tutmaq üçün şah onun ziyarətinə getdi. Şeyx dərhal yerindən sıçrayıb onu qucaqladı, təşəkkür etdi, şahı mədh etməyə başladı.

Şah getdikdən sonra müridlərdən biri ürək edib şeyxdən soruşdu:
– Bu gün şaha göstərdiyiniz bu hörmət adətinizə düz gəlmirdi, indiyə qədər belə etdiyinizi görməmişdik, səbəbi nə idi? Dedi:
– Eşitməmisinizmi deyiblər:

Beyt

Kimin süfrəsində bir loxma yesən,
Gərəkdir durasan xidmətində sən.

Lətifə



Mümkündür ki, ömür boyu qulaqlar,
Eşitməsin ]ənk nəğməsi, ney və tar.
Göz bacarsa seyr etməsin çəməni,
Görməsin bir laləni, yasəməni.
Pərqü balınc olmasa da bir zaman,
Daş üstündə yatar yuxusuz insan.
Qucmaq üçün tapılmasa yar əgər,
Özünü də qucaqlayar bu əllər.
Lakin qarın, səbr etməz ac qalanda,
«Yox» sözünü başa düşməz bir an da.

## IV FƏSİL

## SUSMAĞIN FAYDALARI HAQQINDA

### 1. Hekayət

Dostlarımdan birinə dedim: – «Danışmaqdan ona görə imtina edirəm ki, çox zaman sözün yaxşısı da olur, pisi də; düşmənlar isə yalnız pisini görürlər»

Dedi: – Düşmən yaxşısını görməsə yaxşıdır.

Beyt

Bəllidir ki, xeyir işin şər görünər düşmənə
Bilə–bilə yalandan o, böhtan düzəldər sənə.

Beyt

Bil ədavət gözündə eyibdir hər bir hünər,
Sədi – güldür, lakin o, düşmənə xar görünər.

Beyt

Həyat verən bu günəşin özü də,
Çirkin şeydir yarasanın gözündə.

### 2. Hekayət

Bir tacirə min dinar ziyan dəydi. Oğluna tapşırdı ki, bu haqda heç kimə bir söz deməsin.

Oğlu dedi:

–Ey ata, əmr sizindir, demərəm. Lakin bir başa sal görüm, gizlətməyin nə faydası?

Dedi:

–Ondan ötrü ki, müsibət ikiqat olmasın: biri sərmayənin əldən getməsi, ikincisi qonşuların tənə etməsi.

Beyt



Dərdini düşmənə soyləmə aman,
Qəlbində toy–bayram eləyər haman.

### 3. Hekayət

Ağıllı–kamallı, elmli məlumatlı bir gənc var idi, lakin təbiətən adamlara uyuşmaz, alimlər məclisində bir kəlmə də danışmazdı. Bir dəfə atası ona dedi:

–Ey oğul, sən də görüb bildiklərindən bir şey danış!

Dedi:

–Qorxuram, bilmədiklərimdən soruşalar, xəcalət çəkəm.

Şer

Deyirlər ki, bir sufi[89]
Mıx çalırmış başmağına
Bir xan onu tutub deyir:
«Nal vur atın ayağına».

Beyt

Kimsə bir söz deməz sən sussan əgər,
Lakin söz dedinmi, dəlil də göstər.

### 4. Hekayət

Hörmətli bir alimin bir dinsizlə (allah ona lənət eləsin) mübahisəsi düşdü, lakin onunla höcətləşə bilmədi. Soz qalxanını yerə qoyub geri qayıtdı. Biri ona dedi: – Bu qədər bilik və kəmal sahibi olmağına baxmayaraq bir dinsizin ehdəsindən gələ bilmədin.

Dedi: –Mənim elmim Quran, hədis və şeyxlərin dediyinə əsaslanır, o isə bunların heç birinə inanmır, onun dedikləri də mənim işimə yaramır.

Beyt

Bir kəs ki, Qurana inanmayır heç
Cavabı odur ki, çavab vermə keç!

## 5. Hekayət

Həkim Calinus[90] gordü ki, bir nadai bir alimin yaxasından tutub onu təhqir eləyir.

Dedi:

– Əgər o, alim olsaydı, nadanla işi bu dərəcəyə çatdırmazdı.

Şer

Ağıllı olanlar heç vaxt vuruşmaz,
Alim nadanlara heç də baş qoşmaz.
Sözünü acıqla söyləsə nadan,
Ağıllı dindirər onu mehriban.
İki alim qoymaz bir tük qırılsın,
İstəməzlər sülhə zəncir vurulsun.
Hər iki sözləşən olarsa çahil,
Ehtiram zəncirin tez qırarlar bil
Birinə bir nadan çirkin söz dedi.
O biri təmkinlə belə söylədi:
Sən məndə çox eyib axtarma hədər.
Bilməzsən eybimi mən bilən qədər!

## 6. Hekayət

Səhbani-Vail[91] fəsahətlə danışmaqda misilsiz idi. Belə ki, bütün il boyu danışsaydı, onun sözlərində təkrar görməzdin. Əgər bir sözü ikinci dəfə deməyə məçbur olsaydı, başqa ibarələrlə ifadə edərdi. Bunu da deyim ki, saray xadimlərinə layiq xasiyyətlərdən biri də məhz bundan ibarətdir.

Şer

Əgər söz olarsa incə və şirin,
O sözü eşidən deyər afərin.
Bir dəfə dedinmi, təkrar etmə sən,
Xoş olar halvanı bir kərə yesən.

### 7. Hekayət

Eşitmişəm ki, alimlərdə demişdir:
–Başqasının sözünü kəsib danışmaq, öz qanmazlığını etiraf etmək deməkdir.

Şer

Hər sözün ey alim, baş–ayağı var,
Sözün arasına söz qatma zinhar.
Ağıllı sakitlik görməsə bir an,
Dil açıb bir söz də söyləməz inan.

### 8. Hekayət

Sültan Mahmudun xidmətçilərindən bir neçəsi Həsən Meyməndidən[92] soruşdu:
Sultan hansı məsələ haqqıda səninlə məsləhət edirdi?
Həsən Meyməndi cavab verdi:
–Məncə o məsələdən sizin də xəbəriniz var.
Dedilər:
–Sultan sənə dediyini bizə demir.
Dedi:
–Ona görə ki, başqasına deməyəcəyimə arxayındır. Bəs nə üçün məndən soruşursunuz?

Beyt

Bildiyi hər sözü söyləməz insan,
Verməz şah sirrinə başını qurban.

### 9. Hekayət

Bir evi almaq üçün beh verməkdə tərəddüd edirdim. Bu zaman bir cühüd dedi ki, mən bu məhəllənin böyüklərindənəm, o evi məndən soruş, heç bir eybi yoxdur, al!
Dedi: – Sənin qonşuluğundan başqa!



Şer

Bu evin ki, sənin kimi qonşusu var, şübhəsiz,
O ev dəyməz onca dirəm sikkəsi qəlp pula həm.
Ümid etmək olar ki, sən ölüb getsən dünyadan,
O binanın qiyməti də bəlkə ola min dirəm.

### 10. Hekayət

Bir şair oğrubaşının yanına gedib onu təriflədi. Oqrubaşı şairi soyundurub kənddən qovmağı əmr etdi. Yazıq çılpaq halda şaxtada gedərkən itlər dalınca düşüb hürməyə başladılar. İtləri qovmaq üçün yerdən bir daş götürmək istədi, yer don olduğuna görə daşı qopara bilmədi. Dedi:
–Bu necə haramzada camaatdır ki, iti açıb, daşı bağlayıblar! Oğrubaşı eyvandan bunu görüb şairin sözünü eşitdikdə güldü, onu yanına çağırıb dedi:
–Könlün nə istəyir, məndən tələb et!
Dedi:
–Öz paltarlarımı mənə bağışla, səndən ənam almaqdansa, baş götürüb qaçmaq yaxşıdır.

Beyt

Başqasının xeyrinə çalışar comərd olan,
Səndən xeyir ummuram, ancaq yetirmə ziyan.

Oğrubaşının ona yazığı gəlib paltarlarını qaytardı, bir kürk, bir qədər pul verib sevindirdi və evinə razı yola saldı.

### 11. Hekayət

Bir münəccim evə gəldikdə arvadının yad bir kişi ilə oturduğunu gerdü. Söyüş söydü, təhqir etdi, hay–küy saldı, dava-dalaş başladı. Bu hadisənin şahidi olan arif bir adam dedi:

Beyt

Hardan bildin göylərin üst qatında nə vardır,
Bilmirsən öz evində belə biganə vardır?

**12. Hekayət**

Pis səsli bir vaizin öz səsindən xoşu gəlirdi, elə boş-boş qışqırırdı ki, elə bil, qarğa qarıldayır, yaxud ulaq anqırırdı.

Beyt

Xətib Əbülfəvarisin[93] kobud səsi çıxanda,
Anqırtısı İstəxridə[94] qala yıxar bir anda.

Vaiz şan–şöhrət sahibi olduğundan qəsəbənin sakinləri onun pis səsinə dözür, könlünə dəyməyi məsləhət görmürdülər.

Onunla gizli ədavəti olan başqa bir vaiz bir gün onun görüşünə gəlmişdi, dedi:

–Xeyr olsun, səni yuxuda görmüşəm!

Dedi:

–Necə görmüsən?

Dedi:

–Yuxuda görmüşəm ki, sənin xoş səsin var, camaat da sənin səsindən həzz alır.

Vaiz bir qədər fikrə getdi, sonra dedi:

–Yaxşı oldu ki, belə bir yuxu görüb eybimi mənə anlatdın. Məlum olur ki, mənim səsim pisdir, camaat ucadan oxumağımdan əziyyət çəkir. Söz verirəm ki, bu gündən etibarən uca səslə oxumayım.

Şer

Dostlardan həmişə şikayətim var,
Ki, yaxşı deyirlər pisimə onlar
Eybimi görərlər bir hünər kimi,
Gül hesab edərlər hər tikanəmi
Hardadır həyasız, rəzil düşmənim
Ki, açıb göstərsin eybimi mənim?!



**13. Hekayət**

Bir nəfər Sincar[95] məscidində zöhlə tökən bir səslə azan verərdi. Məscidin sahibi ədalətli və xoş təbiətli bir əmir idi, onun könlünü sındırmaq istəmirdi, ona görə dedi:

–Ay kişi, bu məscidin qədimdən bəri xüsusi azancıları var, hər birisi məndən beş dinar alır. Sən on binar verərəm, bu şərtlə ki, gedib başqa məsciddə azan versən.

Onlar razılaşdılar. O getdi, və bir müddət sonra buradan keçərkən əmirin yanına gəlib dedi:

–Ey hökmdar, on dinar verib məsciddən çıxartmaqda mənə zülm edibsən; getdiyim yerdə başqa məscidə köçmək üçün 20 dinar verirlr, qəbul etmirəm.

Əmir qəşş edincə güldü və dedi:

–Ayıq ol, əlli dinara razı olmayınca getmə!

Beyt

Bıçaq ilə şüşə üstdən can sıxar gil qaşımaq;
Kobud səsin daha bətər qaşıyar hər könlü bax

**14. Hekayət**

Pis səsli bir şəxs ucadan Quran oxuyurdu. Onun yanından keçən bir arif soruşdu:

–Bu Quran oxumağın üçün sənə nə qədər verirlər?

Dedi:

–Heç nə qədər.

Dedi:

–Bəs nə üçün özünə əziyyət verirsən?

Dedi:

–Allah xatirinə oxuyuram.

Dedi:

–Allah xatirinə, oxuma!

Şer

Bu avazla oxusan Quran yəqin,
Aparарsan müsəlmanlıq rövnəqin.

## V FƏSİL

## EŞQ VƏ ÇAVANLIQ HAQQINDA

### 1. Hekayət

Həsən Meyməndidən soruşdular:

–Sultan Mahmudun hər biri dünya gözəli adlandırıla biləcək bu qədər qulamı olduğu halda, nə üçün Ayazı[96] hamısından çox istəyir, halbuki, Ayaz o qədər də yaraşıqlı deyildir.

Dedi: – Ürəyə yatan, gözə də xoş dəyər.

Şer

Padişah hər kəsə eləsə hörmət.
Pis iş də tutsa, hey tərif olunar.
Şah kimdən azacıq bədgüman olsa.
Ən yaxın adamı çıxmaz havadar.

Şer

Kim nəyə baxarsa inkar gözüylə,
Yusif hüsnünə də çirkindir deyər.
Lakin məhəbbətlə o, divə baxsa,
Gözünə misilsiz mələk görünər.

### 2. Hekayət

Deyirlər bir xacənin çox gözəl bir qulu var idi və xacə onunla dostluq büsatı qurmaq istəyirdi. Dostlarından birinə dedi: – heyif bu boy-buxundan, bu gözəllikdən ki, özü kobud, dili uzundur.

Dedi: – Qardaşım, eyş–işrət keçirdiyin adamdan hörmət gözləmə, aşiq–məşuqluq ortaya çıxanda, hakim–məhkumluq aradan qalxar

Beyt

Xacə bir nazənin bir pərisifət –
Qul ilə oynarkən gülərsə üzü,
Təəccüb deyildir qulu naz etsə,
Naz çəksə həvəslə xacənin özü...



### 3. Hekayət

Gördüm bir zahid eşq içində yanır, nə səbr edə bilir, nə dərdin açır. Çox əziyyət çəkir, çox məzəmmət eşidir, lakin fikirindən dönməyir və deyirdi:

Şer

Əlimi üzmərəm mən ətəyindən,
Bir iti qılıncla vursan da məni.
Axı səndən başqa ümidim yoxdur,
Qaçsan bil taparam yenə də səni –

Bir dəfə onu danlayıb dedim:

–Səlis əqlinə nə olmuşdur ki, xəsis nəfsin ona üstün gəldi? Bir az fikrə getdi, sonra dedi:

Şer

Haraya girərsə eşqan sultanı,
Alar iradədən tabü–təvanı.
Çirkaba qərq olan biçarə məgər,
Dünyada heç təmiz yaşaya bilər?

### 4. Hekayət

Birisi gönlünü vermiş, canından keçmişdi. Lakin göz dikdiyi yer qorxulu, getmək istədiyi yer təhlükəli idi: hazır kükə deyildi ki, əl atıb götürsün, xam cücə deyildi ki, tez tora düşsün.

Beyt

Puluna baxmazsa nazənin dilbər,
Qızılın torpaqla olar bərabər.

Yenə nəsihət edərək ona dedilər: – Bu sevdadan əl çək, çoxları bu xam xəyala düşmüş, lakin gör necə olmuş, nə hala düşmüşlər?!

Nalə çəkib dedi:

Şer

A dostlar etməyin mənə nəsihət,
Ki, mənim gözlərim ondadır fəqət,
Cəngavər məhv edər zorla düşməni,
Yar isə naz ilə öldürür məni.

O necə məhəbbətdir ki, can qorxusundan canandan əl çəkəsən?!

Şer

Sən əgər özünü unutmamışsan,
Sənin aşiqliyin yalandır demək.
Dost ilə birləşmək mümkün deyilsə,
Onun arzusuyla öləsən gərək.

Beyt

İmkan tapsam tutaram ətəyindən nigarın,
Yoxsa gedib ölərəm, qapısında o yarın.

Onun işləri ilə maraqlanan, qayğı göstərib səhhətinin hayına qalan yaxın adamları çox səy göstərdilər, öyüd verdilər, yalvardılar, yaxardılar, xeyri olmadı.

Beyt

Təbibim deyir ki, səbr eylə, dayan,
Bu həris nəfs isə dözməyir bir an.

Şer

Bilirsənmi nazlı dilbər bir gecə,
Aşiqanə pıçıldadı gizlicə.
Belə diqqət verirkən sən özünə,
Heç qiymətim görünərmi gözünə?

Nağıl edirlər ki, onun aşiq olduğu şahzadəyə xəbər çatdırdılar ki,



çoxdandır xoş təbiətli, şirindil bir cavan bu tərəflərə gəlib–gedir, gözəl sözlər danışır, mənalı söhbətlər edir. Deyəsən qəlbində bir məhəbbət, başında bir sevda var.

Şahzadə başa düşdü ki, cavanın gönlünü çalmış, onu öz bəla girdabına salmışdır. Tez ata minib o tərəfə getdi. Cavan uzaqdan şahzadənin gəldiyini gördükdə ağlayaraq dedi:

Beyt

Qatilim yenə də gəlib dayandı,
Sanki qurbanına ürəyi yandı.

Şahzadə cavanı xoş dindirdi, kefini soruşdu, adı, yeri, sənətilə maraqlandı, çavan dostluq dəryasına elə qərq olmuşdu ki, nəfəs almağa taqəti, cavab verməyə qüdrəti olmadı.

Beyt

Əzbərdən bilsən də Quranı inan,
Çaşsan əlif, bey də çıxar yadından.

Şahzadə dedi: –Nə üçün mənimlə danışmırsan mən də dərvişəm, dərvişlərlə oturub–duranam, hətta onlara qulağı sırğalı bir qulam. Bu zaman məhbubunun nəvazişindən qüvvət alan cavan başını dostluq dəryasının dalğaları arasından çıxararaq dedi:

Beyt

Səninlə bir məkanda olmaq bir əmri–mahal,
Sən sözə dil açanda olar mənim dilim lal.

Bunu dedi, bərkdən bir nərə çəkdi və canını haqqa təslim etdi...

**5. Hekayət**

Son dərəcə gözəl bir şagird var idi, insan taiəti gözəlliyə meyl etdiyi üçün müəllim də ona mail olmuşdu.

Ona görə başqa şagirdlərə etdiyi əziyyət və tənbehi ona rəva

görməzdi. Təklikdə rast gələndə isə ona belə deyərdi:

Şer

Ey mələk, mən sənə elə valehəm,
Ki, bütün varlığım çıxıb yadımdan.
Kipriyin qəlbimə oxlar atsa da,
Mən kiprik vurmayıb baxaram heyran.

Bir dəfə şagird ona dedi: –Dərsimə nəzər yetirdiyin kimi, tərbiyəmə də fikir ver ki, xoşuna gəlməyən şeyləri düzəltməyə çalışım.

Dedi: – Ey oğlan, sən bunu başqalarından soruş, o gözlə ki, mən sənə baxıram, hünərdən başqa bir şey germürəm.

Şer

Bədxahın gözləri çıxsın dünyada,
Görür nöqsan kimi hər hünərini.
Varsa yetmiş eybin bircə hünərin.
Dost ancaq görər o bir hünərini.

**6. Hekayət**

Yadımdadır bir gecə sevimli dilbərim qapıdan girdi, onu görcək özümü itirib elə tələsik ayaqa qalxdım ki, ətəyim yellənib çırağı söndürdü.

Beyt

Bu, yuxumu, gün çıxıb qatı zülməti boğdu.
Bu xoşbəxtlik ülkəri əcəb haradan doğdu!

O oturdu və gileylənib dedi:

–Məni görcək çırağı söndürməyində nə məna var?

Dedim:

–Bunun iki mənası var, birinci budur ki, səni görüb günəş çıxdığını zənn etdim, ikincisi isə bu şeri xatırladım:

Şer



Şamın qabağını bir çirkin kəssə,
Tut öldür o saat qoy görsün hamı.
Yox, əgər şirindil bir nazəninsə,
Yapış ətəyindən tez söndür şamı.

**7. Hekayət**

Biri çoxdan idi ki, dostunu görmürdü soruşdu:

–Hardasan, nə vaxtdandır intizarını çəkirəm.

Dedi:

–İntizar çəkmək tənkə gəlməkdən yaxşıdır.

Şer

Gec gəldin ey nazlı məstanə gözəl,
Çəkmərəm yaxandan bu tezliklə əl.
Xoş olmaz məşuqi görmək nüdrətən,
Lazımdır yarını tez-tez görəsən.

**Hikmət**. Əgər sevgilin öz yoldaşları ilə sənin yanına gələrsə demək incitmək üçün gəlmişdir, çünki bu halda ya qısqanclıq baş verəcəkdir, ya düşmənçilik.

Beyt

Dostlarla sən məni görməyə gəlsən,
Dava axtarırsan, sülhə də gəlsən.

Şer

Yar əğyarla bir anlığa belə söhbət edərkən,
Qeyrətimdən titrədim mən az qaldı ki, verəm çan.
Gülüb dedi: mən məclislər çırağıyam, ey Sədi!
Mənə nə var bir pərvanə özünü etsə qurban.

**8. Hekayət.**

Yadımdadır qədim zamanlarda bir dostum var idi, bir qabıqda iki badam içi kimi yaşayırdıq. Birdən başqa yerə getməli oldu. Bir müddətdən sonra qayıtdıqda şikayətlənməyə başladı və dedi:

–Bu müddət ərzində mənə bir qasid belə göndərməyibsən!

Dedim:

–Rəva görmədim ki, qasidin gözü sənin camalının nuru ilə işıqlansın, mən isə məhrum qalım.

Şer

Köhnə dostum, gəl sən mənə öz dilinlə tövbə vermə,
Kəs məni qılınc ilə bu cür yola qoya bilməz.
Paxıllığım tutur hər kim sənə baxsa doyunca yar,
Sonra yenə deyirəm ki, heç kim səndən doya bilməz.

**9. Hekayət**

Gördüm bir alim birinə aşiq olmuş, pərdə də sirrinin üzərindən götürülmüşdü. Çox iztirab çəkir, aqır əziyyətlərə davam gətirirdi. Bir dəfə ona ürək–dirək verib dedim: – Bilirəm sənin bu dostluqdan məqsədin birino əziyyət vermək, bu məhəbbətdən istəyin birinin qəlbini incitmək deyildir. Belə olan halda alimə yaraşmaz ki, nahaq yerə günaha batsın, bir tərbiyəsizin üstdə özünü hörmətdən salsın.

Dedi: –Ey əziz dost, gəl məzəmmət əlini bu dərdli yaxamdan çək, sənin etdiyin bu məsləhət haqqında mən dəfələrlə düşünmüşəm, görmüşəm ki, onun cəfasına dözmək, ayrılığına tab gətirməkdən yüngüldür, alimlər deyiblər ki: «Sözü ürəyə salıb dərd etmək, gözü gözəldən ayırmaqdan asandır»

Şer

Ayrı qalmaq müşkülsə bir dilbərdən,
Zülm etsə də gərək zülmə dözəsən.
Bir gün çəkdim əllərindən əlaman,
Sonra oldum etdiyimdən peşiman.
Yar gərəkdir yar yolunda can verə,
Nə ki bir söz deyəndə o yan verə.
Özü bilər ya çağırar, ya qovar,
Məgər onda deyilmi hər ixtiyar?!



**10. Hekayət**

Cavanlıq vaxtlarında, bildiyin üzrə hamının başına gəldiyi kimi, mən də bir gözələ aşiq olmuş, and içib əhd–peyman bağlamışdım, özü xoşəxlaq, üzü isə ondörd gecəlik ay kimi parlaq idi.

Beyt

Yar üzünün nəbatı bax ab–həyat içib gülər,
Kim ki, nabatə meyl edər şəkkərinə salar nəzər*

Təsadüfən ondan xoşa gəlməyən bir hərəkət baş verdi, ürəyim sındı, sidqim siyrildi, məhəbbət daşını atıb dedim:

Beyt

Bir yol tap get sən də məqsədə asan,
Barı bax özünə, bizə baxmırsan.

Eşitdim ki, gedə–gedə deyirdi:

Beyt

Yarasa sevmirsə nurlu günəşi,
Günəşin əksilməz bundan atəşi.

Bundan sonra o, başqa şəhərə getdi. Amma sözü mənə yaman yer etdi.

Beyt

Çıxdı əldən yar vəsli, getdi şadlıq neməti

* Бу Бейтдяки «Нябат» сизц бириnъи мисрада от (сябзи), икинъи мисрада набат (гянд) мянасындадыр (мугяръим).

Kim əzabdan əvvəl anlar var olan xoş ləzzəti?

Beyt

Qayıt, gəl,vur, öldür, bu ölüm, bilsən
Xoşdur mənə, sənsiz ömür sürməkdən.

Şükür olsun ki, bir müddətdən sonra geri qayıtdı, çənəsinin almacçığı heyva kimi zərif tüklərlə örtülmüş, rəngi solmuş, əvvəlki gözəllikdən bir nişan qalmamışdı. Ümid edirdi ki, durub üzündən öpəcəyəm. Oturub üzümü kənara çevirdim və dedim:

Şer

O gün ki cəmalın xətti gözəldi,
Qoymadın bir salam o xəttə nəzər.
Bu gün sülh edərək gəlmişsən çünki,
Qoyulub o xəttə indi zir-zəbər.

Şer

Tazə baharım, varağın soldu bax,
Qoşa qazan, söndü, bu od, bu ocaq.
Bunca çəkib sən özünü dartma gəl,
Anla daha indi deyilsən gözəl.
Get onu tap kim sənə pabənd ola,
Bir kəsə naz et ki, sənə bənd ola.

Şer

Dedilər ki, bağda göyərti xoşdur,
Sözün doğrusunu deyənlər bilər.
Yəni gözəl üzdə tər səbzi bitsə,
Aşiq məftun olub təmənna dilər.
Lakin qanqal bitmiş sənin üzündə,
Yolduqca daha çox artıb yüksələr.

Şer



Səbr etsən, etməsən bunu yaxşı bil,
Gözəllik əyyamı keçib gedəcək.
Sənin tək canımdan əl çəkməsəydim,
Saqqalı qoymazdım çıxa həşrə dək.

Şer

Yarımdan sual etdim: hanı o hüsnü camal,
Qaralmışdır ay üzün batmısan dərdə, ğəmə.
Cavab verdi bilmirəm bu üzümə nə oldu
Görünür hüsnüm üçün batmış belə matəmə.

**11. Hekayət**

Bağdad bədəvi ərəblərinin birindən soruşdular: – Yeniyetmələr haqqında nə deyə bilərsən?

Dedi: – Onlardan xeyir umma, nə qədər ki, gözəl və zərifdirlər kobudluq edərlər, elə ki, çirkinləşib kobudlaşdılar, məhəbbət göstərib dostluq edərlər

Nəzm

Yeniyetmə nə qədər ki, gözəldir,
Dili acı olar, xisləti yaman.
Elə ki, üzünün gülşəni soldu,
Hamıya dil töküb olar mehriban.

**12. Hekayət**

Bir alimdən soruşdular: – Bir adam gözəl bir nigarla xəlvət otağa çəkilə, qapını daldan baqlaya, rəqiblər yuxlamış, şəhvət coşmuş ola, ərəblər demişkən: «Xurmalar dəymiş, bağban yatmıqa ola», insan öz nəfsini saxlayıb gözəllərin əlindən qurtara bilər, ya yox?

Alim dedi:

–Gözəllərin əlindən qurtarsa da, söz gəzdirənlərin dilindən qurtara bilməz.

Beyt

İnsan qurtarsa da pis əməlindən.
Qurtarmaz bədxahın tənələrindən.

Beyt

Bacararsan bir iş görüb salmayasan səsə sən,
Bacarmazsan lakin xalqın dillərini kəsəsən.

**13. Hekayət**

Tutuquşu ilə qarğanı bir qəfəsə salmışdılar. Tutuquşu qarğanın çirkin sifətini görməkdən xoşlanmayaraq, öz–özünə deyirdi:

–Bunun nə kifir, eybəcər və yöndəmsiz sir–sifəti vardır! Kaş aramızda məğriblə məşriq qədər məsafə olaydı!



Şer

Hər kəs səhər duranda görsə sənin üzünü,
Onun parlaq gündüzü tutqun axşama dönər.
Sənin kimi bir nacins sənə həmdəm olmalı,
Təəssüf ki, dünyada sənə tay yox bir bəşər

Daha qəribəsi orasında idi ki, qarğa da tutuquşu ilə bir yerdə olmaqdan qədərlənərək təəssüflənir və həyatının gedişindən şikayətlənib deyirdi:

–Baxtım qara, taleyim dönük, fələk vəfasız imiş! Mən gərək indi bir qarğa ilə bir bağda divar üstə nazlana–nazlana gəzə idim!

Beyt

Sıxar möminləri sanki bir zindan,
Rindlərlə bir yerə düşdüyü zaman.

Görəsən nə günah işləmişəm ki, ruzigar məni cəzalandırıb belə xəbis, lovğa və nacins bir axmaqla həmsöhbət etmiş və fəlakətə salmışdır.

Şer

Şəklini çəksələr divara sənin,
O evə heç yaxın gəlməz bir insan.
Behiştdə sən olsan əgər, adamlar,
Qaçıb cəhənnəmdə salarlar məkan.

Bu məsəli ona görə gətirdim başa düşəsən ki, alim adam cahilə nə qədər nifrət edərsə, cahil yüz dəfə, min dəfə artıq ona nifrət bəsləyər.

Şer

Rindlər məclisində vardı bir zahid,
Bəlxli bir cavan ona dedi: «Sus!
Narazı olsan da qaşqabaq tökmə;

Sən də biz deyən tək deyilsən, əfsus!»

Şer

Hamı birləşmişdir gül və lalə tək,
Sən isə arada quru odunsan.
Ey naxələf şeyx, müxalif külək,
Qar kimi soyuqsan, buz kimi donsan.

**14. Hekayət**

Bir dostum var idi, onunla çox səfər etmiş, çoxlu duz-çörək yemişdik, aramızda möhkəm bir səmimiyyət yaranmışdı. Bir dəfə cüzi bir mənafe üstündə könlümə toxundu, dostluğumuz pozuldu. Lakin buna baxmayaraq qəlbimizdə olan məhəbbət bağları hələ qırılmamışdı. Eşitdim bir gün məclisdə mənim şerimdən bu iki beyt:

Şer

Duzluca gülərkən mənim nigarım,
Bir az da duz səpər yarama aman.
Dərvişin əlinə nola zülfündən
Bircə tel düşərək olaydı dərman!

oxunarkən dostlarım, bu sözlərin xatirinə yox, bəlkə əxlaqlarının təmizliyinə görə şeri bəyənib afərin demişlər, o cümlədən haman adam da məni tərifləmiş, köhnə dostluğumuzun qırılmasına təəssüf etmiş, təqsirini boynuna almış, günahını etiraf etmişdir. Beləliklə, onun da barışmaq arzusunda olduğu meydana çıxdı, dərhal bu şeri yazıb göndərdim, sülh bərpa oldu.

Şer

Vəfayə söz verdik, peyman bağladıq,
Sən cəfa edərək vəfanı atdın.
Dünyada bir sənə könül vermişdim.
Tezliklə sən onu vurdun, qanatdın.



Barışmaq istəsən gəl şad et məni,
Əzəldən daha çox sevərəm səni.

**15. Hekayət**

Bir adamın gözəl və cavan arvadı öldü, kəbini üzündən çox qocalmış qaynanası onun evində yaşamalı oldu[97]. Kişi qaynanasının söhbətindən bezmiş, lakin arvadın kəbinini verə bilmədiyindən onunla bir evdə yaşamaq məcburiyyətində qalmışdı. Dostlarından bir neçəsi onu görməyə gəldilər. Onlardan biri soruşdu:

–Əziz sevgilinin dərdinə dözmək çoxmu aqırdır? Kişi cavab verdi:

–Qaynana üzü görmək mənim üçün arvad dərdinə dözməkdən daha ağırdır.

Şer

Güllər tarac oldu, tikanlar qaldı,
Xəzinə dağıldı, ilanlar qaldı.
Gözümə batarsa zəhərli mismar,
Düşməni görməkdən daha xoş olar.
Kaş ki, mən itirim min dostu, yarı,
Görməyim yanımda bircə əğyarı.

**16. Hekayət**

Xatırımdadır, cavanlıq günlərindən birində bir küçədən keçərkən gözəl bir nigara rast gəldim. Təmuz[98] ayı idi, istisi ağızları qurudur, səmum yeli beyinlari qaynadırdı; qızmar günorta günəşinə tab gətirməyib divar kölgəsinə pənah apardım, dedim bəlkə bir adam bir içim su verib Təmuz atəşini söndürə. Birdən bir evin qaranlıq dəhlizindən bir nur parladı, yəni elə bir camal göründü ki, qadir bir natiq onun nadir gözəlliyini təsvir etməkdən acizdir. Sanki qaranlıq bir gecədən səhər açıldı, ya zülmətdən həyat suyu tapıldı. Əlində qarlı su ilə dolu bir piyalə vardı, içinə qənd tökülmüş, müşk qarışdırılmışdı. Bilmirəm onu gülablamı belə ətirləndirmiş, yoxsa gül yanağından ona bir neçə qətrə tər damcılatmışdı.

Xülasə, onun inçə əllərindən piyaləni alıb başıma çəkdim, dirilib cana gəldim.



Beyt

Qəlbimdə sonsuz bir atəş var inan,
Dənizi içsəm də doymaram bir an.

Şer .

O xoşbəxtə eşq olsun ki, göz açanda hər səhər,
Belə huri cəmalına baxıb edir iftixar.
Şərab məsti gecə yarı ayılsa da, şübhəsiz,
Bu saqidən məst olanlar qiyamətdə ayılar.

**17. Hekayət**

Məhəmməd Xarəzmşah[99] Çin ilə əlverişli sülh bağladığı ildə mən Kaşğər[100] şəhərinə gəlmişdim. Orada olduqca gözəl və yaraşıqlı bir oğlan uşağı gördüm. Onun kimilər haqqında belə deyirlər:

Şer

Müəllimin sənə hər bir ədanı öyrətdi,
Bu nazü qəmzəni, zülmü cəfanı öyrətdi.
Bu hüsndə, bu gözəllikdə görmədim insan,
Mələkmi yoxsa sənə bu liqanı öyrətdi?

O, Zəməxşərinin[101] «Müqəddimeyi-Nəhv» kitabını əlində tutaraq oxuyurdu: «Zeyd Əmri vurdu...». Dedim: – Ay oğlan, Xarəzm ilə Çin sülh bağladılar, Zeydlə Əmrin[102] düşmənçiliyi hələ də davam edir.

Güldü, haralı olduqumu soruşdu.

Dedim: – Şiraz torpağındanam.

Dedi: – Sədinin sözlərindən nə bilirsən?

Ərəbcə dedim:

Şer

Dilçi bir alimə rast gəldim bu gün
Zeyd Əmrə baxan tək baxdı üzümə.
«Kəsrə» tək başını aşağı saldı.

«Zəmmə» tək hücuma keçdi üstümə.

Bir az fikrə getdikdən sonra dedi: – Sədinin şerlərinin çoxunu burada farsca oxuyurlar, sən də bu dildə desən daha tez anlaşılar*. Adamla onun biliyinə görə danışarlar.

Dedim:

Şer

Nəhvə qarışdı başın ey yar bu gün,
Səbrimizi məhv elədin büsbütün.
Aşiqinin qəlbi əsirin ikən,
Zeyd ilə Əmr oldu sənin məşğələn.

Ertəsi gun səhər tezdən səfərə çıxmağa hazırlaşarkən, ona dedilər ki, filankəs Sədidir. Qaça–qaça gəlib çox üzrxahlıq etdi və sonra gileylənib dedi: – Nə üçün demədiniz ki, Sədiyəm, lazım olan xidməti edəm?!

Dedim: – Səni gerdükdə nitqim tutuldu.

Dedi: – Nə olar bir neçə gün burada qalıb dincələsən, biz də sizin söhbətinizdən feyzyab olaq.

Dedim: – Aşaqıdakı hekayətə görə qala bilmərəm.

Şer

Mən dağlarda rast gəldim bir alimə,
Yaşayırdı mağarada yalqız, tək,
Dedim: neçin gəlməyirsən şəhərə
Ömr edəsən gözəl həyat sürərək?
Dedi: axı, şəhərdə çox gözəl var,
Fil sürüşər yerdə çox olsa çiçək!

Bunu dedim, bir–birimizlə öpüşüb vidalaşdıq.

Şer

Belə öpüşmənin nə mənası var,

* Сяди йухарыдакы шери яряб дилиндя демишдир (мцтяръим).



Ki öpüb tez yola salasan yarı.
Elə bil alma da yardan ayrılmış,
Bir üzü al olmuş, bir üzü sarı.

Beyt

Can verməsəm dostumla vidalaşan dəmdə mən,
Xəbərsizəm deməli sədaqətdən, diləkdən.

**18. Hekayət**

Hiçaz karvanı ilə gedərkən bir dərviş də bizə qoşuldu. Ərəb əmirlərindən biri ona yüz dinar baqışladı ki, o da qurban kəsdirsin. Yolda Xəface[103] yol kəsənləri tökülüb karvanı çapdılar, hər nə var idisə, sil–süpür edib apardılar. Tacirlər ahü–fəryad etməyə, nahaq yerə dadü–bidad qoparmağa başladılar.

Beyt

Ağlayıb sızlasan sən hər nə qədər,
Geriyə qaytarmaz oğru bircə zər.

Vəziyyətini dəyişməyib sakit oturan bir adam var idisə, o da haman dərviş idi.

Dedim: – Məgər sənin pullarını oğrular aparmayıblar? Dedi:

–Nə üçun, aparıblar, ançaq mən pulun varlığında ona bağlı deyildim ki, yoxluğunda ağlayam.

Beyt

Bir kəsə, bir şeyə könül vermə, bax,
Çətindir, könülü geriyə almaq

Dedim: –Seylədiyin vəziyyət tanışdır, çünki mənim də cavanlıqda sevgilim olmuşdur. Mən o dilbərə elə bağlı idim ki, camalı gözümün qabləsi, vüsalı ömrümün sərmayəsi idi.

Şer

Səmadan nazil olmuş bir mələkdi sanki xilqətdə,
Ki, yerdə bir bəşər mümkün deyildir bu lətafətdə
Qəsəm ol dostluğa kim, ondan ayrı boşdur hər söhbət,
Ki, olmaz insan övladı belə hüsnü vəcahatdə.

Birdən ölüm yatağına yatdı, ayağı əcəl torpağına batdı, evlərindən qalxan fəraq naləsi göyə dayandı, qəlbim od tutub yandı. Bir neçə gün qəbri üstdən ayrılmayıb, fəraqi haqqında bir şer yazdım. O cümlədən dedim:

Şer

Ayağına batan zaman əcəlin sərt tikanı,
Kaş başımı öz əlilə qoparaydı bu fələk.
Ta ki, gözüm görməyəydi sənsiz qalmış cahanı,
Məzarına mənəm gələn başıma gül tökərək.

Şer

O gözəl ki, heç bir qərar tutmadan,
Gül nəstərən bəsləyəydi hər zaman.
Öz gülünü soldurdu bu zəmanə,
Torpağında bitirdi vəhşi tikan.

Dilbərin fərağından sonra and içdim, nə qədər sağam bir daha eyş fərşini açmayam, ömrümün sonuna qədər işrət məclisinə qədəm basmayam.

Şer

Dəniz fayda verərdi çox olmasaydı tufanı,
Gül söhbəti xoş olardı olmasaydı tikanı,
Tavus kimi nazlanırdım dünən vüsal bağında
Bu gün isə qıvrılıram ilan tək fərağında

**19. Hekayət**



Ərəb əmirlərindən birinə Leyli və Məcnun əhvalatını danışaraq dedilər:

–Məcnun elm–fəzilət sahibi olmasına baxmayaraq, əqlini itirib çöllərə düşmüşdür.

Əmr etdi ki, Məcnunu tapıb onun hüzuruna gətirsinlər. Məcnunu gətirdilər. Əmir onu danlayaraq dedi:

–Şərəfli insan sifətində nə nöqsan gördün ki, heyvan xasiyyətini qəbul edib, adamlarla ünsiyyətdən əl çəkdin?

Məçnun ağlayaraq cavab verdi:

Beyt

Onu sevdiyimə gülənlər ki, var,
Kaş yarı bir dəfə görəydi onlar!
Hər kəs axtarırsa mənim eybimi,
Kaş yarın hüsnünü görəydi bir an.
Onun camalına olaraq heyran.
Əlini kəsəydi bir turunc kimi.

Məcnunun sözlərinin düzgün olub–olmadığını öyrənmək, bu qədər fitnəyə səbəb olan bir gözəli görmək məqsədilə əmir Leylini çağırtdırmağı əmr etdi. Bütün ərəb tayfalarını gəzib Leylini tapdılar və onu əmirin sarayına gətirdilər. Əmir Leylini gözdən keçirdi, qarayağız, arıq bir qız gördü, xoşuna gəlmədi, onun hərəmxanasında olan ən axırıncı kəniz gözəllikdə Leylidən qat–qat üstün idi. Ona görə də artıq Leyliyə əhəmiyyət vermədi. Məcnun bunu hiss edib dedi:

–Leylinin gözəlliyini dərk etmək üçün, ona Məcnunui gözü ilə baxmaq lazımdır.

Şer

Yar kuyindən gələn səsi göyərçinlər eşitsə,
Mənim kimi fəğan edib inildəyər onlar da.
Ey dostlarım, mənə tənə vuranlara deyiniz,
Ki, dərdimi duymaq üçün duyğu yoxdur oilarda.

Şer

Sağlamlar nə bilir nədir dərdü ğəm,
Dərdimi anlayar dərd çəkən həmdəm.
Arı nəştərini dadmayana sən,
Arıdan nə üçün söhbət edirsən?
Olmasa əhvalın bizim tək əgər,
Halımız sənə bir əfsanə gələr.
Ağrımı özgəyə bənzətmə sən də,
Duz onun əlində, yarasa məndə.

Şer

Sən bilməzsən məndə olan əhvalı,
Mənim dostum öz həmdərdim olmalı.
Ta söyləyim dərdimi o həmdərdə,
İki odun yaxşı yanar bir yerdə.

**20. Hekayət**

Həmədan qazısı haqqında danışırlar ki, o bir nalbənd oğluna bənd olmuş, qəlbinin nalını oda qoymuşdu, bir müddət dərdilə kədərlənmiş, bir müddət ətrafında hərlənmiş, gah dalınca düşüb gedərmiş, gah haqqında danışıb, şer deyərmiş.

Şer

Gözümə göründü o sərv qamət,
Qəlbimi qaparaq saldı ayağa.
Ürəyi kəməndə salan bil, gözdür,
Qəlbi qorumaqçın gözünü bağla.

Deyirlər ki, bir dəfə yoldan gecərkən oğlan qazının yolunu kəsdi, özü haqqında deyilən bəzi sözləri eşitdiyinə və bərk incidiyinə görə, qazını söyməyə başladı, ürəyi soyumadı, sonra onu daşladı, ağzına gələni dedi, olmazın hörmətsizliklər etdi.

Qazı əhvalatı müşahidə edən, onunla birlikdə gedən üləmalardan birinə demişdi:

Beyt



Gözəlin acığı nazə bərabər,
Üzünü turşutsa şirin dad verər.

Ərəb ölkələrində belə bir məsəl var, deyərlər: –«Sevgilinin söyüşü şirin kişmiş kimidir».

Beyt

Sənin gül əlindən yumruq yesəm mən,
Xoşdur öz əlimlə çörək yeməkdən.

Qara–qışqırıq salır, demək razılıq iyi gəlir.

Beyt

Üzüm qora çağı turş olar yəqin,
Üç-dörd gün səbr elə ki, olsun şirin.

Qazı bunu deyib geri döndü, gəlib qəzavət kürsüsündə oturdu. Onun xidmətində olan mənsəb sahiblərindən bir neçəsi baş əyib təzim etdilər, yeri öpüb belə dedilər:

–Ədəb xaricində olsa da, icazə verin sizə bir sual verək. Böyüklər deyiblər:

Beyt

Hər bir sözə irad tutmaq bil, deyildir, məsləhət,
Böyüklərə qələt tutmaq özü sayılar qələt.

Lakin bütün ömrümüz boyu sizdən mərhəmət görüb, ənam aldığımız üçün, bildiyimiz məsləhəti deməsək, xəyanət etmiş olarıq. Yaxşısı budur ki, sən bu nalbənd oğlundan əl çəkib öz ehtiras süfrəni yığışdırasan, pak qəzavət kürsüsünü belə çirkin işlərlə kəsafətə bulaşdırmayasan. Hərifin kim olduğunu kördünüz, hərfin nə olduğunu eşitdiniz.

Şer

Biri həyasızlığa etmişsə adət,
Özgə həyasına verərmi qiymət?
Çox olmuş əlli il yaxşı qalan ad
Bir çirkin iş ilə olmuşdur bərbad!

Qazı dostlarının fikrini bəyəndi, onların xeyrxahlığına qarşı təşəkkür etdi, və dedi: – Mənim haqqımda əziz dosqlarımın dedikləri tamamilə düzdür, ona etiraz ola bilməz, çünki doğru sözdur, lakin:

Beyt

Nə qədər kefindir elə məzəmmət
Zəncini yumaqla ağarmaz əlbət.



Beyt
Bu dünyada səni mənə unutduran iş varmı?
Başı qopmuş bir ilanam, qıvrılmasam olarmı?

Bunu deyib onu yola gətirmək üçün adam saldı, mal tökdü, pul xərclədi, hədiyyə aldı. Demişlər ki, kimin qızılı qovluğundadır, onun gücü də öz qolundadır; kimin dünyada kisəsi boşdur, onun da dünyada heç kəsi yoxdur.

Beyt

Qızılı kim görsə ona baş əyər
Dəmirqol tərəzi olsa da əgər.

Müxtəsər, bir gecə aranı xəlvət eləmişdilər ki, darğaya da xəbər çatdı. Qazı bütün gecəni şərab içir, sevgilisinin gah sağına, gah soluna keçir, məhəbbətin şiddətindən belə zümzümə edirdi:

Şer

Ey kaş xoruz banlamasın bu səhər erkən,
Aşiqlər hələ doymadı məşuqələrindən
Yatdıqda yarın sən oyaq ol, fürsəti vermə,
Bu ömrü, amandır, belə bivayə keçirmə.
Məsciddən azan səsləri yüksəlsə də hər an,
Ya təbl sasi qalxsa Atabəy sarayından.
Sən açma xoruz gözləri tək ləbləri zinhar,
Əfsanə demə, etmə sən ez sirrini izhar.

Qazı bu vəziyyətdə idi ki, yaxın adamlarından biri gəlib dedi: – Nə oturmusan qalx, nə qədər bacarırsan tez qaç! Paxılların sənə həsəd aparıb xəbərçilik etmişlər, bəlkə də haqq demişlər. Nə qədər ki, fitnə odu alovlanmayıb, bəlkə onu tədbir suyu ilə söndürək, sabaha qalsa güclənib yangına çevrilər, yayılıb dünyanı bürüyər.

Qazı gülümsəyərək ona baxdı və dedi:

Şer

Şirlər ov üstünə pəncə açanda,
Nə fayda itlərin hürüşməsindən.
Yarınla üz–üzə söhbət elə, qoy
Əlinin dalını çeynəsin düşmən.

O gecə şaha da məlumat verdilər ki, sənin ölkəndə belə bir murdar hadisə baş vermişdir, əmrin nədir?

Şah dedi: – Mən onu əsrimizin görkəmli alimi, misilsiz qazısı kimi tanıyıram, ola bilər düşmənləri bu hadisəni onun haqqında uydurmuş olalar, bu məsələni yoxlamayınca mən ona inana bilmərəm. Ağıllı adamlar deyiblər:

Şer

Hirslənib qılınca tezcə əl atsan,
Sonra peşmançılıq baş verər inan.

Qazının yanına gəldi. Gördü şam yanır, oğlan oturub, şərab dağılıb, qədəh sındırılıb, qazı isə özündən getmiş, dünyadan bixəbər, məst, sərxoş, bihuş, mədhuş bir halda yatır. Şah ehmalCa qazını oyadaraq ahəstə dedi: – Dur, günəş çıxmışdır.

Qazı işin nə yerdə olduğunu başa düşüb soruşdu:

– Hansı tərəfdən çıxmışdır?

Dedi: –Hər gün çıxdığı tərəfdən, məşriqdən.

Dedi: –Allaha şükür olsun ki, tövbə qapıları hələ açıqdır, hədisdə deyilib: «Tövbə qapıları o zaman bağlanar ki, günəş məğribdən çıxsın». İlahi tövbə edirəm, bağışlanmağımı istəyirəm.

Şer

Mənə iki şeyi tutdular nöqsan,
Qarabəxt dedilər bir də ki, nadan.
Sən məni həbs etsən, haqdır, yeri var,
Əfv etsən cəzadan daha xoş olar.

Şah dedi: – İndiki halda, öldürüləcəyini bildikdən sonra tövbənin faydası yoxdur, hətta bu barədə belə bir ayə də vardır: «Cinayətdən sonra tövbənin xeyri yoxdur».



Şer

O oğrunun tövbəsindən nə fayda,
Ki, kəməndi ata bilmir saraya.
Ucaboya «meyvə dərmə» deməli,
Gödəklərin onsuz da çatmır əli
.

Belə bir iyrənc iş tutduqdan sonra bağışlanmağın qeyri-mümkündür.

Şah bunu decək, çəza müvəkkilləri tökülüb qazının əl-ayağını bağladılar.

Qazı dedi: – Şaha deyəcək mənim daha bir sözüm qalmışdır. Şah eşitdi və dedi: – O nə sözdür?

Qazı dedi:

Şer

Ətəyindən məlamət yağdıranda mənə sən.
Zənn etmə ki, əlimi üzərəm ətəyindən.
Bu günah ki, mənim var, xilas olmaq çətindir,
Bircə ümid qalıbdır, o da kəramətindir.

Şah dedi: – Bu şeri çox gözəl dedin, sözü qəribə bir məharətlə yerində işlətdin. Lakin əqlə müvafiq, şərə mütabiq olmaz ki, sənin bu günkü hazırcavablığın canını mənim əlimdən xilas etsin. Əmr edəcəyəm səni saray qülləsindən atsınlar ki, başqaları da görüb ibrət alsınlar.

Dedi: –Ey yer üzünün allahı, mən sənin xanədanının yetişdirməsiyəm, özü də bu günahı tək mən etməmişəm, çoxları etmişlər, başqaların at ki, mən ibrət alım.

Şahı gülmək tutdu, təqsirindən keçdi, qətlini tələb edənə isə belə dedi:

Beyt

Sənin öz canında varikən nöqsan,
Neçin başqasında eyb axtarırsan?

## Məvzum hekayət

Gülərüz bir gözəl, xoşsifət cavan
Gəmidə olmuşdu yarla mehriban.
Belə oxumuşam, ümmanda bir gün,
Girdabə düşdülər bəxtləri küskün.
Gəmiçi atıldı dəryaya həmən
Cavanı qurtarsın bəlkə ölümdən.
O isə dalğada əl-qol ataraq,
Deyirdi yarımı xilas et ancaq,
Bu sözü deyincə qaraldı gözü,
Bu oldu cavanın sonuncu sözü.
Eşqə sadiq sanma hər riyakarı,
Ki, bərk gündə ata yarı ilğarı,
Sevənlər bax belə yaşadı, bil sən,
Bir söz də gəl dinlə, qoca Sədidən
Sədi bilir eşqin hər dəlilini,
Bağdadlı bilən tək ərəb dilini.
Könül veribsənsə bir canana sən,
Gərək göz yumasan bu cahana sən,
Leylinin Məcnunu dirilsə əgər,
Eşqin hədisini burdan öyrənər.



# VI FƏSİL

## ZƏİFLİK VƏ QOCALIQ HAQQINDA

### 1. Hekayət

Dəməşq məscidində bir neçə alimlə mübahisə edirdik. Bu zaman bir gənc məscidə girib soruşdu:

–Sizlərdən fars dilini bilən varmı?

Hamı məni göstərdi, mən ondan soruşdum:

–Nə sözün var?

Dedi:

–Yüz əlli yaşında bir qoca can üstdədir. O, fars dilində nə isə danışır, biz isə başa düşmürük, mərhəmət göstərib qocanın yanına getmək zəhmətini qəbul etsəniz savab olar, bəlkə vəsiyyət edir.

Mən qocanın başı üstə çatan zaman o, bu şeri oxuyurdu:

Şer

Bir zaman dedim ki, kamə çataram,
Bilmədim bu arzu boş bir həvəsdir.
Təəssüf ki, ömrün bol süfrəsindən,
Bir tikə götürdük, dedilər, bəsdir.

Beytin mənasını şamlılara ərəbcə dedim. Onlar qocanın ömrünün uzunluğuna, eləcə də həyatın vəfasızlığına etdiyi təəssüfə təəccübləndilər. Mən qocadan soruşdum:

–Özünü necə hiss edirsən? Cavab verdi:

–Nə deyim?

Şer

Bilmirsənmi bir adamın çıxarsalar dişini,
Kefi necə pozular və halı olar pərişan?
İndi özün hesab elə necə olar əhvalı,
O kəsin ki, bədənindən çıxıb gedə əziz can

Dedim:

–Ölüm fikrini başından çıxart. Özünü qorxutma, çünki yunan filosofları demişlər: – Bədən nə qədər sağlam olsa, onun həmişə belə qalacağına ümid bağlamaq olmaz, xəstəlik nə qədər ağır olsa, onun həmişə ölümlə nəticələnəcəyinə hökm vermək yaramaz. Müalicə etdirmək istəyirsənsə həkim çağıra bilərəm. Qoca üzünü çevirib güldü və dedi:

Şer

Bir təbib görsə ki, yamandır xəstə,
Əlini tez qoyar əlinin üstə.
Xacənin xəyalı, nəqşi-eyvandır,
Ev isə binadən belə virandır.
Qocanın işləri olarkən əngəl.
Sürtürdü arvadı hey ona səndəl.
Əhval ki, dolaşdı, pozuldu məzac,
Nə əfsun saqaldar, nə də ki, əlac.

**2. Hekayət**

Bir qoca belə nəql edirdi ki, bir qızla evlənmişdim, evi gülçiçəklə bəzəmiş, aranı xəlvət eləmişdim, könlümü ona vermiş, gözümü ona dikmişdim. Uzun gecələri yatmaz, ona lətifələr və məzhəkələr deyərdim ki, bəlkə ürəyini ələ alam, qorxudan çıxa, mənimlə ünsiyyət bağlaya, o cümlədən bir gecə deyirdim: «Baxtın sayıq, dövlətin ayıq imiş ki, tərbiyyəli, təcrübəli, dünyagörmüş, zamanın isti–soyuğunu dadmış, yaxşı–pisi tanıyan, qədir bilən, söz anlayan, təbiəti xoş, dili şirin, dostluq bacaran mənim kimi mehriban bir qocaya rast gəldin».

Şer

Çalışıb qəlbini alaram ələ,
İncitsən dözərəm zülmə cananım.
Tuti tək xorəyin qənd olsa əgər,
Bax sənə qurbandır bu şirin canım.



Nə yaxşı ki, sən şorgöz, acısöz, hərdən bir xəyalə düşən, ayağı sürüşkən, hər gecə bir yerdə yatan, hər gün bir yarla dostluq qatan, qocaların əksinə olaraq, əql ilə deyil, cəhl ilə rəftar edən bir nadan cavanın çənginə keçməyibsən.

Şer

Gözəl, ay camallı nazlı hər cavan,
Olmaz məhəbbətdə sadiq çox zaman.
Bülbülü eşqinə sanma vəfadar,
Ki hərdəm bir gülün üstünə qonar.

Beyt

Özündən yaxşıyla gəz axşam–səhər,
Özün kimisiylə vaxtın boş keçər.

O qədər belə yağlı dil tokdüm, elə bildim könlünü ələ ala bilmiş, özünü tələyə sala bilmişəm. Elə bu zaman dərdli sinəsindən soyuq, dərin bir ah çəkib dedi: – Sənin dediyin bu sözlərin çəkisi mənim ağıl tərəzimdəki çəkisi, vaxtı ilə məni tutmuş mamaçadan eşitdiyim bir söz qədəri də deyildir. Mamaçam deyirdi:

–Cavan gəlinin yanında tirin uzanması, pirin oturmasından yaxşıdır.

Şer

Arvad ər önündə bir şey gördü ki,
Oruc dodaqlartək büzülüb qalmış.
Dedi ki, ölüyə əfsun kar etməz,
Bu yazıq əbədi yuxuya dalmış.

Şer

Əgər arvad ər yanından acıqlanıb durarsa,
Belə evdə cəngü–cədəl, fitnə–fəsad törəyər.
Bir qoca ki, əsa ilə qalxıb durur ayağa,
Öz əsası qalxarmı heç çalışsa da nə qədər.

Xülasə razılıq olmadığı üçün ayrılmalı olduq. İddə[104] vaxtı qurtardıqdan sonra onu tünd xasiyyət, acıdil, bədtinət, yoxsul bir cavana ərə verdilər. Qadın döyülür, söyülür, əzab, əziyyət çəkirdi.

Bununla belə ağızdolusu deyirdi: – Allaha şükür o əzablı dəhşətdən qurtarıb bu nəşəli nemətə çatmışam.

Şer

Tünd xasiyyət, inadla mənə çox zülm etdin sən,
Yenə nazın çəkirəm, çünki ay tək gözəlsən.
Cəhənnəmdə səninlə birkə yaimaq yaxşıdır,
Başqasila çənnətdə könülsüz kef çəkməkdən.
Bir gözəlin ağzından soğan iyi gələrsə,
Xoşdur çirkii əlində tutduğu gül–çiçəkdən.

**3. Hekayət**

Diyarbəkrdə bir qocaya qonaq oldum. Onun çoxlu malı və gözəl bir oğlu var idi. Bir gecə qoca dedi:

–Ömrümdə bundan başqa övladım olmayıbdır. Bu vadidə ziyarətgah deyən bir ağac vardır ki, adamlar dilədiklərini almaq üçün ora gedirlər. Mən həmən ağacın altında uzun gecələr oturub ağlamış və çoxlu dua etdikdən sonra allah bunu mənə əta etmişdir.

Oğlan isə bu vaxtda astadan yoldaşlarına deyirdi:

–Kaş o ağacın yerini biləydim, gedib dua eləyəydim, atam öləydi.

Ata sevinirdi ki, oğlum ağla çatıb; oğul deyinirdi ki, atam nə üçün ölmür.

Şer

İllər keçir lakin güzər etmirsən,
Öz atanın məzarına heç zaman.
Sən atana nə hörmətlər etdin ki,
O hörməti gözləyirsən oğlundan?

**4. Hekayət**



Bir gün cavanlığıma salıb bərk qaçmış, yorulub gecəni bir dağın ətəyində qalmışdım. Karvanın arxasınca asta–asta gələn bir qoca dedi: – Nə oturubsan, bura yatmaq yeri deyil!

Dedim: –Necə yeriyim, ayağım getmir.

Dedi: –Eşitməmisən ki, deyiblər: «Yeriyib oturmaq, qaçıb yıxılmaqdan yaxşıdır».

Şer

Ey mənzilə çatmaq üçün tələsərək can atan,
Heç tələsmə, səbrli ol, mənə qulaq as bir az,
Ərəb atı tələsərək qoşa çapar, yorular,
Dəvə isə gecə-gündüz asta gedər yorulmaz.

**5. Hekayət**

Cəld, gülər üz, şirin söz bir cavan oğlan mənimlə dostluq edirdi, heç bir dərdi ürəyinə salmaz, heç bir qəmi yaxına buraxmaz, dodaqları gülüşdən əskik olmazdı.

Çoxdan idi ki, görüşmürdük, bir dəfə ona rast gəldim, gerdüm arvad almış, övlad basmış, şadlığın kökü kəsilmiş, şənlik gülü solmuş. Dedim:

–Kefin necədir, neçə dolanırsan?

Dedi:

–Uşaqlar olandan uşaqlığı buraxmışam.

Beyt

Uşaqlıq və gənclik, qocalıq nədir?
Bizi xofa salan bu zəmanədir.

Şer

Qocaldınsa əl götür uşaqlıq şıltağından
Burax qalsın gənclərə hər oyun, hər zarafat.
Cavanlığın şövqani qocalardan gəl umma,

Gedən sular dübarə arxa qayıtmaz, əlbət.

Şer

Keçdi cavanlıq daha yox iqtidar,
Ah nə yaman getdi o xoş ruzigar.
Getdi qolumdan necə şir qüvvətim,
Şadlanaram olsa penir qismətim.
Qaraltmışdı tüklərini bir qarı.
Ona dedim: ey kecən il kaftarı,
Saçlarını rəngləmək olmaz çətin,
Amma düzəlməz bu kəman qamətin.

**6. Hekayət**

Bir gün cavanlıqda nadanlıq ədib anamın üstünə bərk qışqırdım. O, qəlbi incimiş halda güncdə oturdu, ağlayıb dedi:

– Görpəliyini unudubsan ki, belə kobudluq edirsən?

Ana oğlunu zorlu görçək haman,Belə söylədi: – Ey pələig ovlayan!Yada düşsə idi uşaqlıq çağın,Ki, qoyiumda güçsüz çƏgərdin fəğan.Bu gün eyləməzdin mənə zülmlər,Ki, sən güclüsən indi, mən natəvan.

**7.Hekayət**

Xəsis bir dövlətlinin xəstə bir oğlu vardı. Xeyirxah adam lar ona dedilər:

Bu oğluna ya bir quran xətm etdir, ya bir qurban kəsdir. Bir az fikirləşdikdən sonra dedi:

–Quran otaqdadır, sürü uzaqda. Quran yaxşıdır. Bir arnf bunu eşidib dedi:

–Quran ona görə yaxşı oldu ki, o, dil ilə başa gəlir, qurban isə pul ilə.

Şer

İtaət olsaydı pul ilə əgər,



Çoxları ulağtək batardı gilə.
Yüz dəfə əlhəmdü oxuyar amma,
Zərərə qatlaşmaz bir dinar belə.

**8. Hekayət**

Bir qoca kişiyə dedilər: – Nə üçün evlənmirsən?

Dedi: – Qoca arvadın nə ləzzəti. Dedilər: – İmkanın ki var, cavan al. Dedi: – Mən qoca ola–ola qoca arvadı bəyənmirəm, o cavan ikən mən qocanı necə sevə biqər?

Beyt

Yetmiş yaşlı bir qoca cavanlıqdan vursa dəm
Deməli kor istəyir görsün işıqlı aləm.

Beyt

Xanımı zor ilə razı etməzsən,
Ona zor yaxşıdır on batman ətdən

**Lətifə**

Eşitmişəm bu günlərdə əldən düşmüş bir qoca,
İstədi ki, bu yaşında alsın cavan bir arvad.
Göhər adlı bir qız tapdı, gözəl, göyçək dilaram.
Ki, dünyada tapılmazdı gizli qalmış belə zad.
Bütün qayda-qanun ilə elçi saldı, toy etdi,
Lakin əvvəl həmləsində boşa getdi hər murad.
Kaman çəkib ox atdısa hədəfindən yan keçdi.
Qalın paltar tikmək üçün iynə olmalı polad
Dostlarına gileylənib qoca dedi: bu şux qız
Necə yıxdı evimi, gör, etdi işimi bərbad.
Ərlə arvad arasında dava düşdü, belə ki,
Darğa, qazi işə baxdı, Sədi qopardı fəryad,
Dedi: – Qızda nə günah var, axmaq qoca bir utan,
Titrək əllə inci deşə bilərsənmi sən? Heyhat!

## VII FƏSİL

## TƏRBİYƏNİN TƏSİRİ HAQQINDA

**1. Hekayət**

Bir vəzirin bir kütbeyin oğlu varidi. Bir alimin yanına göndərdi ki, buna tərbiyə ver, bəlkə ağıllana.

Alim bir müddət ona tərbiyə verdi, təsiri olmadı. Atacsının yanına adam göndərib xəbər çatdırdı ki: – Oğlun ağıllanmır, amma məni dəli edib.

Şer

Heç seyqəl götürməz zatı pis dəmir,
Nə qədər çalışsan bədgöhər olar.
İti yeddi dəniz su ilə yusan,
Yaş olcaq daha da beş-bətər olar.
İsanın eşşəyi Məkkəyə getsə,
Qayıdıb gələndə yenə xər olar.

**2. Hekayət**

Bir alim oğlanlarına öyüd–nəsihət verib dedi:

–Əziz oğlanlarım, sənət öyrənin ki, dünya malına etibar yoxdur. Səfərdə qızıl-gümüşün qorxusu var, ya oğru aparar, ya xərçlənib qurtarar, sənət isə qaynar bulaq, tükənməz bir xəzinədir. Sənət sahibi dövlətdən məhrum olsa da, qorxusu yoxdur, çünki sənət özü elə bir dövlətdir ki, ona sahib olan hara getsə, hörmət qazanıb yuxarı başda oturar. Sənətsiz adam isə dara düşdükdə əl açıb dilənçiliklə dolanar.

Beyt

Ağırdır rütbodən düşüb qul olmaq,
Naza öyrəşəndən sonrakı danlaq.



Şer

Nagahan Şamda bir iğtişaş düşdü,
Hərə baş götürüb qaçdı bir yina.
Elmli, kamallı kəndli övladı,
Gedib vəzir oldu şaha, sultana.
Lakin fərasətsiz vəzir balası,
Kəndlərdə diləndi hey yana-yana.

Şer

Ata mirasını istəyirsənsə,
Çalışıb atanın elmini öyrən!
Çünki dövlətini bir gün içində,
Havaya sovurub xərc edəcəksən.

**3. Hekayət**

Alimlərdən biri bir şahzadəyə dərs deyir, lakin rəhmsizcə döyür, olmazın əziyyətlər vesrirdi. Bir dəfə uşaq tab gətirə bilməyib atasının yanına şikayətə getdi. Köynəyini çıxarıb göyərmiş bədənini atasına göstərdi. Atasının ürəyi yandı, müəllimini çağırtdırıb dedi:

–Mənim oğluma etdiyin o əziyyət və tənbihi heç bir rəiyyət övladına etmirsən, bunun səbəbi nədir?

Dedi: –Səbəbi odur ki, gərək hamı danışanda ağzının sozünü bilsin, xalq yanında özünü yaxşı aparsın, xüsusilə padşahlar; çünki şahların dediyi hər söz dillər əzbəri, tutduqu hər iş əllər vərdişi olur, qara camaatınkına isə o qədər əhəmiyyət verən olmaz.

Şer

Yüz nalayiq iş görərsə bir kasıb,
Yüzdən birin bilmoz dostlar–aşnalar.
Amma sultan bircə gülünc sez desə,
Dilə düşər ölkə-ölkə dolanar.

Deməli, boyüklərin uşaqlarının tərbiyəsilə daha çox məşğul olmaq, onların əxlaqının gözəlliyinə daha çox fikir vermək müəllimin

borcudur.

Şer

Kiçik ikən har uşaq edilməzsə tərbiyət,
Böyüyəndə görünməz onda ədəb, nəzakət.
Yaş çubuğu, istəsən hər şəkilə salarsan
Od qurudub düzəldər o çubuğu nəhayət.

Alimin çavabı, oğluna qarşı tələbkarlığı şahın xoşuna gəldi. Ənam bağışladı, xələt verdi, rütbəsini artırdı.

**4. Hekayət**

Məğrib ölkəsində qaraqabaq, acıdil, tündxasiyyət, mərdümazar, gəda təbiət, bədgirdar bir mədrəsə müəllimi gördüm. Sir-sifətini görən müsəlmanların işi düz gətirməz, quran oxumasına qulaq asanların üzü gülməzdi. Bakirə qızlar, pakizə oğlanlar onun əlindən zara gəlmişdilər, nə gülməyə cürət edirdilər, nə danışmağa cəsarət: Gah birinin al yanağına sillə vurardı, gah o birinin əl-ayağını fələqqəyə qoyardı. Müxtəsəri axırda, valideynlər onun qəddarlığını başa düşdülər, döydülər, incitdilər, mədrəsədən qovdular. Dərsləri həlim, yumşaq xasiyyət, mehriban, ehtiyacı olmayınca danışmayan, heç kəsin qəlbinə dəyməyən, könlünə toxunmayan bir müəllimə tapşırdılar.

Birinci müəllimin qorxusu şagirdlərin ürəyindən çıxdı, ikinci müəllimin mələk təbiətli olduğunu görüb div xasiyyətli olmağa başladılar. Onun həlimliyinə bel bağlayıb elm oyrənməyi tərk etdilər, oxumaq əvəzinə oyun çıxardır, min bir gələk qururdular, əlindəki yazı lövhələrini bir-birinin başına vurub qırırdılar.

Beyt

Müəllim olarsa səssiz, mülayim,
Uşaqlar bazarda oynayır daim.

İki həftədən sonra həmən mədrəsənin yanından keçirdim, gördüm birinci müəllimin könlün alıb yenə öz yerinə qaytarmışlar.



Açığını deyim ki, bərk incidim, ixtiyarsız olaraq dedim: «Yenə də bu iblisi bu mələklərə müəllim ediblər?!» Dünyagörmüş hazırcavab bir qoca dedi:

Şer

Mədrəsəyə göndərdi oğlunu bir padşah,
Gümüş bir lövhə qoydu onun yanına həmən.
Lövhün başı üstündə qızıl xətlə yazdırdı,
Xoşdur ustad cəfası ata məhəbbətindən.

**5. Hekayət**

Bir zahid oğluna əmilərindən çoxlu miras qaldı. O, bunu eyş işrətə israf etməyə başladı. Görmədiyi yaramaz iş, dadmadığı içki qalmadı. Nəhayət ona nəsihət verib dedim:

–Oğul, adamın gəliri çaya, eyş–işrət isə dəyirmana oxşar. Yalnız o adam kefi istədiyi kimi xərcləyə bilər ki, kifayət qədər gəliri olsun.

Xərçini az elə, yoxdursa gəlir,
«Dəniz mahnısında» belə deyilir.
«Yağmasa dağlara əgər yağış, qar,
Bir ilin içində Dəclə quruyar».

–Ağlını başına toplayıb eyş–işrətdən əl çək. Var–dövlətin tükənər, darlığa düşüb peşmançılıq çəkərsən!

Kef məclisində çalğıya qulaq asmaq oğlana xoş gəldiyi üçün sözüm qulağına batmadı, etiraz edərək dedi.

–Bu günün şadlıq və sevincini sabahkı qəm qorxusu ilə puç etməyi aqıllı adamlar bəyənməzlər.

Şer

O varlı-dövlətli bəxtəvərlərin,
Bəd gündən varmıdır qorxusu bəyəm?
Kefindən əl çəkmə bir anda, dostum,
Sabahkı gün üçün bü gün çəkmə qəm.

Bundan əlavə mən səxavət taxtında oturub, mərhəmət kəmərini belimə bağlamışam və əliaçıqlıqda camaat içində şöhrət qazanmışam.



Şer

Kimin səxavətdə çıxdısa adı,
Pulu saxlamağı o bacarmadı,
Elə ki, yaxşı ad qazandı insan,
Kərəm qapısını bağlamaz bir an.

Nəsihət qəbul etmədiyini və mənim isti nəfəsimin onun soyuq dəmirinə təsir etmədiyini gördükdə, öyüd verməkdən əl çəkdim, onunla dostluğu kəsdim və filosofların bu sözünü yerinə yetirdim: «Sən sözünü de, qəbul etməsələr, özləri təqsirkardırlar».

Şer

Sözünə yoxsa da bir qulaq asan,
Sən yenə öyüd ver mərd-mərdana.
Çox çəkməz görərsən döşünə döyən
İlişib düşəndə dara, zindana,
Əlini dizinə vurub söyləyir:
Kaş qulaq asaydım o mərd insana.

Az keçdikdən sonra, necə ki, düşünmüşdüm, elə də oldu. Onu acınacaqlı bir vəziyyətdə gördüm: paltarlarına yamağı yamaq üstün dən vurub, bir loğma çörək üçün dilənirdi. Əhvalına ürəyim yandı, bu halda onu, danlamağı və yaralı ürəyinə duz səpməyi insafsızlıq hesab edib öz-özümə dedim:

Şer

Yaramaz bir hərif məstlik zamanı,
Düşünməz ki, sabah qalacaq darda.
Ağaclar baharda meyvə versə də,
Qış fəsli lüt qalar soyuqda, qarda.

**6. Hekayət**

Bir şah oğlunu bir ədibə tapşırıb dedi:

–Bunu öz övladın kimi tərbiyə et!

Ədib baş, əyib hökmdarın tapşırığını qəbul etdi. O, uzun müddət oğlanın tarbiyəsilə məşğul olub, səy göstərdisə də, heç bir fayda vermədi. Ədibin öz oğlanları isə elm və bilikdə şöhrət tapdılar. Şah ədibə qəzəblənib dedi:

–Vədə xilaf çıxıb, tapşırığımı sədaqətlə yeriiə yetirmədnn. Ədib dedi:

–Böyük hökmdar bilməlidir ki, tərbiyə eyni idi, qabiliyyət isə müxtəlif!

Şer

Doğrudur ki, daşdan çıxar cəvahir,
Lakin hər daşda bil cəvahir olmaz.
Hər yerdən görünər Süheyl[105] ulduzu,
Lakin hər məkanda təsir bir olmaz.

**7. Hekayət**

Bir mürşüdün öz müridinə belə dediyini eşitdim: – Əgər insan övladı ruziyə bağlı olduğu qədər ruzi verənə baqlı olsaydı, mövqeyi mələklərdən üstün olardı.

Şer

Allah səni unutmadı öz ananın bətnində,
Ki huşsuz və hissiz olan bir nütfəydin o zaman.
Belə yazıq vəziyyətdə qaranlıq bir guşədə.
Əta etdi sənə: əqal, nitq, şüur, camal, can.
Əllərində yaratdı o xoş düzülmüş on barmaq,
İki güclü qol düzəldib asdı iki yanından.
Ey hümmətsiz, indi necə xəyalına gəlir ki,
Gün keçdikcə unudacaq səni böyük yaradan.

**8. Hekayət**

Gördüm bir ərəb oğluna hey belə deyir: – Ey oğul, qiyamət günü səndən soruşacaqlar əməlin nədir, soruşmayacaqlar atan kimdir.



Şer

Gəbə örtüyünü öpməyirlər ki,
Onu toxumuşdur bir ipək qurdu.
Bəlkə o, bir əziz kəslə oturub,
Onun şərəfilə möhtərəm oldu.

**9. Hekayət**

Alimlərin yazdığına görə əqrəbin doğumu başqa heyvanların doğumuna oxşamaz. Əqrəbin balası anasının qarnını deşib bayıra çıxar. Buna görə onların yuvasından əqrəb qabıqları tapılar.

Bir gün bir hökmdarın yanında həmin məsələ haqqında danışdım. O dedi:

–Mən də bu sözün doğruluğuna inanıram, şübhəsiz bu cür də olmalıdır, çünki ancaq kiçiklikdə anası ilə belə rəftar edən, böyüklükdə belə bir şöhrət tapar və hörmət qazanar.

Şer

Oğluna vəsiyyət edərkən ata,
Dedi gəl unutma bu nəsihəti,
Kim sadiq olmasa öz nəsəbinə,
Nə bir dostu olar, nə də hörməti.

**10. Hekayət**

Yoxsul bir dərvişin arvadı hamilə idi, doğum vaxtına az qalırdı, dərvişin isə ömründə uşağı olmamışdı. Dedi:

– Əgər allah mənə oqul versə, əynimdəki xirqədən başqa nəyim varsa hamısını fəqar-füqəraya bağışlayacağam.

Təsadüfən oğlu oldu, əhdini yerinə yetirib var-yoxunu dərvişlərə payladı.

Şam səfərindən qayıdarkən yolum o kənddən düşdü, kefini soruşdum, dedilər zindandadır. Səbəbini bilmək istədim. Dedilər: – Oğlu şərab içibdir, dava edibdir kimin isə qanın töküb qaçıbdır. Onun əvəzinə atasının boynuna kəndir salıb, ayağına zəncir vurub aparıblar.

Dedim: – Bu bəlanı o özü dua edib, allahdan istəmişdir.

Şer

Ey əqli başında olan kişi bil,
Hamilə qadınlar doğsalar ilan,
Cəmiyyət gözündə daha da xoşdur,
Yaramaz, naxələf övlad doğmaqdan.

**11. Hekayət**

Uşaq idim, bir böyükdən hədd-büluğ haqtıada soruşdum.

Dedi: – Kitablarda oxumuşam ki, üç əlaməti var: biri on beş yaşına çatmaq, ikincisi – şeytani olmaq, üçüncüsü – buğyeri tərləmək. Amma haqiqətdə bir nişanı vardır, o da öz nəfsinin xeyrindən çox, allah rizasına çalışmağıdır. Kimdə bu xüsusiyyət yoxdursa ağıllı adamlar onu hədd-büluğa çatmış, kəmalə yetişmiş hesab edə bilməzlər.

Şer

Bir qətrə su ana bətnində qırx gün,
Qaldıqda surətdə adama bənzər.
Qırx yaşlının əqli, ədəbi yoxsa,
Yaraşmaz ki, ona adam deyələr.

Şer

Zənn etmə ki, surətdədir, qamətdədir adamlıq,
Cavanmərdlik, səxavətdir adamlığa əlamət.
Şübhəsiz ki, mahir rəssam al və yaşıl rəngilə
Divarlarda çəkə bilər adama bənzar surət.
Nə fərqi var divardakı bu nəqş ilə insanın,
Əgər onda yoxdursa bir ehsan, hünər, fəzilət.
Hünər deyil bu dünyanı ələ almaq əzizim,
Hünərin var bir ürəyi ələ alıb, qıl rahət.

**12. Hekayət**



Bir dəfə həcc zəvvarları arasında dalaşma düşdü, mən də piyadələr içərsində idim, əməlli başlı vuruşurduq, bir-birimizi kötəkləyib baş-gözünə vururduq, söyüş söyürdük, ağzımıza gələni deyir, əlimizə keçəni döyürdük. Eşitdim dəvə üstə kəcavənin bir gözündə oturan adam o biri gözündə oturana belə deyirdi:

–Qəribə şeydnr, piyada şahmat xanasında gedib başa çatanda vəzir, yəni əvvəlkindən yaxşı olur, bu həcc piyadələri Məkkəyə çatanda niyə belə dəli olublar?!.

Şer

Bu sozümü söyləyiniz o zülmkar hacıya,
Ki, zülmlə soyur xalqın dərisini yanmadan,
Özü deyil, hacı onun dəvəsidir belə ki,
O zavallı tikan yeyib, yük daşımış hər zaman.

**13. Hekayət**

Bir hindli məşəl atıb-tutmaq öyrənirdi. Bir arif görüb dedi: – Sənin ki, evin qəmişdir, bu nə məşğələdir, nə işdir?

Beyt

Yerli hesab etmədiyin sözü demə heç zaman,
Elə cavab vermə ki, o, gətirə bilsin ziyan.

**14. Hekayət**

Bir kişinin gözü ağrayırdı, baytarın yanına gedib dedi: «Gözümə bir dərman ver!» Baytar heyvanların gözünə çəkdiyi dərmandan onun gözünə çəkdi. Kişi kor oldu. Onlar dalaşıb hakimnn yanına getdilər. Hakim dedi:

–Baytarın taqsırı yoxdur. O kişi heyvan olmasaydı baytarın yanına getməzdi. Həmin hekayəni deməkdən məqsədim bunu başa salmaqdır ki, naşı adama böyük iş tapşıran axırda peşman olar və ağıllılar yanında axmaq sayılar.

Heç zaman iş bilən, ağıllı usta
Bədəslə ən mühüm vəzifə verməz.
Toxucu olsa da həsir toxuyan,
Lakin ipək işi ona verilməz.

**15. Hekayət**

Böyük ruhani başçılarından birinin oğlu öldü. Soruşdular: –Qəbir daşının üstünə nə yazaq?

Dedi: – Quran ayələrinin izzət və hörməti daha yüksək olduğundan rəva deyil ki, belə yerlərə yazılsın, çünki zaman keçdikcə pozulub gedər, camaat onu tapdalayıb keçər, ya da üzərində bir it xarablıq edər. Əgər bir şey yazmaq zəruridirsə, bu Beyt bəsdir:

Şer

Bostanda bitəndə yamyaşıl otlar,
Şadlıqdan ürəyim əsərdi tir-tir.
Gəl ey dost, indi gör bahar çağında,
Necə qəbrim ustə yaşıl ot bitir.

**16. Hekayət**

Bir zahid bir dövlətlinin yanından gecərkən, gördu ki, bir qulun əl-ayağın bərk baqlayıb doyür. Dedi: – Oğlum, allah sənin kimi bir məxluqu sənin əlində əsir edib, sənə üstünlük vermişdir. Xudavəndi-aləmə şükür et və onu bu qədər incitmə. Yaxşı deyil ki, sabah qiyamət günü o, üzü ağ olsun, sən üzü qara.

Şer

Sən çox da qulunu qəzəblə söymə,
Qəlbini incitmə, özünü döymə.
Sən onu almısan on dirəm pula,
Can verməmisən ki, o yazıq qula.
Nə qədər duracaq bu zor, bu rəftar,
Unutma ki, səndən böyük allah var.
Ey Aquş və Arslan[106] atası olan,



Sən də öz ağanı çıxarma yaddan.

**Hədis:** Peyğəmbər səlləllahü əleyhdən eşidiblər, deyib ki, qiyamət günü ən böyük dərd odur ki, əməli saleh qul behiştə, onun bəd əməl aqası isə cəhənnəmə gedə.

Şer

Gücsüzü, tabei çox incitmə sən,
Qəzəbdə, hiddətdə eyləmə ifrat.
Hesab çəkiləndə rüsvayçılıqdır,
Ki, xacə zəncirdə, qul isə azad.

**17. Hekayət**

Bir dəfə Bəlxdən səfərə çıxarkan şamlılarla yoldaş oldum. Yollar qorxulu idi. Bu zaman döyüşkən, ox atan, silah oynadan bir gənc pəhləvan da bizə qoşuldu. O elə güclü idi ki, on adam onun kamanının yayını çəkə bilməz, məşhur pəhləvanlar arxasını yerə vura bilməzdi. Lakin buna baxmayaraq, o, naz–nemət içərisində böyümüş, ömründə nə səfərə çıxmış, nə çətinlik görmüş, nə igidlərin gur səsi qulağında cingildəmiş, nə də süvarilərin qılınc parıltısı gözünü qamaşdırmışdı.

Beyt

O heç vaxt düşmənə əsir olmamış.
Üstünə yağmamış oxlardan yağış.

Xülasə, biz onunla birlikdə sürətlə gedirdik. O, gücünü göstərərək qabaqına çıxan köhnə divarı bir yumruqla yıxır, qocaman ağacı kökündən çıxarıb qürurla deyirdi:

Beyt

Fil hanı ta görsün pəhləvan nədir,
Şir hanı ta görsün qəhrəman nədir?!

Qəflətən bir daşın arxasından iki hindli çıxıb bizi öldürmək

istədi. Onlardan birinin əlində çomaq, o birininkində oxmaq var idi. Gəncə dedim:

– Nəyi gözləyirsən?

Beyt

Zorunu, gücünü göstər bunlara!
Düşmən öz xoşuyla gəlmiş məzara!

Gördüm kaman oğlanın əlindən sürüşdü, qorxudan canına titrətmə düşdü.



Beyt

Sivri ox ilə tükü yara bilən hər bir kəs
Vuruşda pəhləvanla üz-üzə dura bilməz.

Başqa çarə tapmadıq, silah və paltarımızı verib canımızı xilas etdik.

Şer

Göndər çətin işlərə iş bilən bir insanı,
Ki, kəməndə salsın o, qəzəblənmiş aslnı,
Cavan əgər fil kimi gücə malik olsa da.
Düşmən hücum edəndə qorxuya düşər canı,
Mahir döyüşçü bilər döyüş nədir, vuruş nə
Necə ki, alim bilər şəriəti, Quranı.

**18. Hekayət**

Gördüm bir dövlətli oğlu atasının qəbri üstə oturmuş, bir kasıb uşağı ilə mübahsəyə qızışmış və deyir:

–Mənim atamın qəbri ağırdır, üstü yazılıdır, ətrafı bəzəklidir, daşı mərmərdəndir, torpaqı ənbərdəndir, kənarına mina səpiblər, qırağına kaşı döşəyiblər, sənin atanın goru nəyə oxşayır, üstünə iki qarış torpaq töküblər, vəssəlam.

Kasıb uşağı dedi:

–Sənin atan bu aqır daşların altındaq tərpənənə qədər mənim dədəm behiştdə olar.

Beyt

Ulağa yükü az çatsalar əgər,
Şübhəsiz yolunu asudə gedər.

Şer

Ömründə çox əzab görən, aclıq çəkən bir kasıb,
Yəqinimdir ölümündən düşməyəcək dəhşətə.

Lakin dövlət, naz-nemətə öyrənmiş hər bəxtəvər,
Ölüm vaxtı, şübhəsiz ki, gələcəkdir vəhşətə.
Məlumdur ki, dar məhbəsdən azad olan bir əsir
Həbsə gedən bir əmirdən çox layiqdir hörmətə.

**19. Hekayət**

Böyüklərdən birindən soruşdular: – Nə üçün hədisdə deyilmişdir ki, sənin ən birinci düşmənin iki böyrün arasında yerləşmiş nəfsindir?

Dedi: – Ona görə ki, hər hansı düşmənə yaxşılıq etsən dost olar, nəfsə güzəştə getsən düşmənçiliyi artar.

Şer

İnsan az yeməklə mələyə dönər,
Heyvantək yesə o fərqlənməz daşdan.
Kimi razı salsan qul olar sənə,
Nəfsi razı salsan əsir olarsan.

## VARLILIQ VƏ YOXSULLUQ HAQQINDASƏDİNİN MÜDDƏİ İLƏ MÜBAHİSƏSİ.

Zahirdə dərvişə oxşayan, lakin batində dərviş olmayan bir adamın bir məclisdə oturub nalayiq–nalayiq danışdığını, şikayət dəftərini açıb varlıları məzəmmət etdiyini gördüm, sözü o yerə çatdırıışdı ki, deyirdi: yoxsulların qüdrət əli bağlanmış, varlıların isə səxavət ayaqları sınmışdır.

Beyt

Kərəmi olanın dirəmi yoxdur,
Dirəmi olanın kərəmi yoxdur.

Böyüklərin neməti ilə böyüdüyüm üçün bu söz mənə ağır gəldi.

Dedim: – Dostum, varlılar yoxsulların xəzinəsi, zahidlərin dəfinəsi, zəvvarların pənahgahı, səyyahların və qonaqlarıı mehmannavazıdırlar.



Onlar başqalarının rahatlığı üçün ağır yükə qatlaşar, xidmətçiləri və qulluqçuları yeyib doyduqdan sonra özləri təama əl atarlar, artıq qalanlarını dul qadınlara, qohum–qardaşa, qonum–qonşuya paylarlar.

Şer

Dövlətlidə hər şey vardır, vəqf, nəzir, qonaqlıq,
Zəkat, fitrə, iltifat, qurbanlıq bir də ehsan.
Yazıq sənin nəyin var, tay olasan onlara,
İki rükət namazın, onu da ağ qılırsan.

Səxavət və ibadətə gəldikdə isə, o da dövlətlilər üçün tez müyəssər olar, çünki xüms–zəkat vermək üçün var–dövlət onlarda, razü–niyaz etmək üçün təmiz paltar və boş vaxt onlardadır. Agıllı adamlar bilirlər ki, ziyarətin gücü ləziz yeməklərdə, ibadətin duzu təmiz geyməklərdədir. Boş mədədə nə qüvvət, boş əldə nə mürüvvət, yalın ayaqda nə seyr, ac qarında nə xeyir ola bilər?!

Şer

Gecəni narahat yatar o kəs ki,
Sabahın xərcindən çəkir xəcalət.
Qarınca yay vaxtı çalışıb yığar,
Ki qışda yaşasın asudə, rahat.

Aydındır ki, aclıq ilə rahatlıq, oxsulluq ilə şadlıq bir yerə sığa bilməz. Biri axşam yeməyi yeyib şam namazı qılır, biri:, «allah mənə axşam yeməyi yetir» – deyə üzüquylu yıxılır. Bunları necə bir–birinə bənzətmək olar?!

Beyt

Dövlətli edirkən haqta ibadət,
Acın qəlbi çəkir çörəyə həsrət.

Əlbəttə ki, varlıların ibadəti tez qəbul edilər, çünki onların hər şeyi hazır, qəlbi rahat, ürəkləri asudədir; nə fikirləri dağınıq, nə xəyalları pərakəndədir. Varlıların məişəti xoş keçdiyindən onlar

ibadəti də təmənnasız edirlər. Ərəb deyər: – «Allah, məni ağır yoxsulluqdan, mərdümazar qonşuluqdan özün saxla!». Hədisdə deyilib ki, «Yoxsulluq hər iki dünyada üzü qaralıqdır».

Dedi:

–Eşitməmisənmi peyğəmbər əleyhissəlam buyurubdur: «Yoxsulluq mənim fəxrimdir». Dedim: – Sus, peyğəmbər əleyhissəlamin işarəsi o adamlara aiddir ki, onlar qənaətə qane olub, özlərini qəza oxuna qurban verirlər, bunların haqqında deyilmişdir ki, dərviş paltarı keyib, sədəqə ilə alver edirlər.

Şer

İçi boş təbil tək ey hay–küy salan,
Əlində nəyin var çıxarkən yola
Kişisən xalqdan tamahını kəs,
Təsbihi çevirmə boş sağa–sola.

Mərifətsiz dərviş o qədər deyinər ki, axırda küfr deməyə başlar. Odur deyiblər ki, «Yoxsulluq aparıb axırda dinsizliyə çıxarar». Lütü yoxdan geyindirmək mümkün olmaz, biz hara, dövlətlilər hara, verən əl ilə diləyən əlin nə müqayisəsi?! Görmürsənmi xudavəndi-aləm Quranda behişt əhlinin nemətlərindən danışarkən deyir ki, «Onların ruzusu hazırdır». Onu da bilməlisən ki, dolanacaq hayında olan əxlaq qayğısına qala bilməz, onun rahatlığı ruzi üzüyünün arxasında olar.

Beyt

Hər susuz yatarkən yuxuda bişək,
Bütün kainatı çeşmə görəcək.

Mən bu sözləri deyirdim ki, dərvişin səbr kasası daşdı, özünü saxlaya bilməyib iti dilini işə saldı, qılınc çəkdi, qalxan qaldırdı, fəsahət atını səfahət meydanıida çapdırıb mənim üsqümə hücuma keçdi və dedi:

–Sən varlıları o qədər təriflədin, onlar haqqında o qədər cəfəngiyat danışdın, güman etmək olar ki, onlar hər bir dərdin dərmanı, ya da nemət karıdırlar. Halbuki onlar lovğa, xudpəsənd, dövlətmənd, xalqdan qaçan, mal–nemət düşgünü, rütbə–sərvət vurğunu olan bir



ovuc adamlardır ki, onlar aqızlarını xeyrə açmaz, xoş nəzərlə heç kəsə baxmazlar. Onlar yoxsulları başıboş axmaq hesab edirlər, alimləri gözüac, gəda təbiətli qələmə verirlər. Dövlətlərinin zahiri şöhrətinə, rütbələrinin xəyalı hörmətinə arxalanaraq hamıdan yuxarıda oturar, özlərini hamıdan yuxarı tutarlar. Başqalarına baş əyib birinci salam verməyi özlərinə ar bilərlər. Onlar bilmirlər ki, ağıllı adamlar deyiblər: «Kimin səxavəti az, sərvəti çoxdursa, o zahirdə varlı, əslində isə yoxsuldur»

Beyt

Bir hünərsiz dövlətilə rişxənd etsə alimə
Onu eşşək quşqunundan daha alçaq zənn elə.

Dedim: – Bunları çox da məzəmmət etmə, kərəm sahibidirlər.

Dedi: – Səhv edirsən, dirəm aşiqidirlər. Nə olsun ki, yağmurlu buluddurlar, yağmırlar; nurlu günəş mənbəyidirlər, işıq saçmırlar; nemət atına miniblər, lakin çapmırlar; allah xeyrinə bir qədəm atmaz, başa qaxmadan, üzə vurmadan bir dirəm verməzlər. Əzab–əziyyətlə mal toplayar, acgözlüklə qoruyub saxlar, sonra isə həsrətlə qoyub gedərlər.

Hüşyar adamlar deyiblər: «Xəsisin malı o vaxt torpaqdan çıxar ki, özü torpağa gedər».

Beyt

Birisi zəhmətlə toplayar nemət
Başqası xərcləyər çəkmədən zəhmət.

Dedim: – Sən ona görə nemət sahiblərini xəsis adlandırırsan ki, özün gözüacsan, yoxsa gözütox adamlara xəsis ilə səxavətli eyni görünər. Qızılı məhək daşı tanıyar, xəsisi dilənçi. Cavab verdi: – Mən bunu təcrübədən bilirəm, onlar qapılarında elə kobud, qaba, tərbiyəsiz, güclü, mərhəmətsiz adamlar saxlayırlar ki, onlar qapıya yanaşan düz adamların döşündən vurub geri qaytarsınlar, mehtərəm adamlara hörmətsizlik edib yola salsınlar, fəqir-füqəranı döyüb bayıra atsınlar və desinlər: – «Rədd olun, evdə adam yoxdur». Hər halda belə deməkdə səhv etmirlər.

Beyt

Bir evdə ki yoxdur ağıl, himmət, tədbir, xoş rəftar,
«Bu evdə bir adam yoxdur» desən əgər yeri var.

Dedim: – Çünki borc istəyənlərin əlindən cana gəliblər, dilənçilərin dilindən fəğana. Adamın ağlına batmır ki, səhraların qumu dürr olsa da, gədaların gözü doysun.

Beyt

Tamahkarın gözü dünyada doymaz,
Necə ki, şəbnəmlə bir quyu dolmaz.

Harada çətinlik çəkmiş, acılıq dadmış adama rast gəlirsən, görürsən ki, özünü oda, suya vurur, təhlükəli işlərə əl atır, nəticəsindən qorxmur, halala, harama fərq qoymur.

Şer

Bir itin başına dəysə bir kəsək?
Sevinib kəsəyi sümük zənn edər.
İki şəxs çiynində meyit aparsa,
Tüfeyli pay bilib ardınca gedər.

Varlılara gəldikdə isə allahın mərhəmət nəzəri onların üzərindən əskik olmaz, halalı harama qarışdırmağa qoymaz. Fərz edək ki, mən bunları sənə söyləməmiş, fikirlərimi sübut üçün dəlil gətirməmişəm. Lakin xahiş edirəm düzünü deyəsən, heç görübsənmi yoxsulluqdan səvay özgə bir səbəbə görə bir adamın qolu dalına bağlansın, bir köməksiz, yazıq həbsə alınsın, bir məsum qazın ismət pərdəsi yırtılsın, ya birinin əli biləyindən vurulsun??!! Çox zaman şir ürəkli mərd adamlar ehtiyac üzündən lağımlarda ələ keçir, ayaqları sındırılıb aşıq sümükləri ipə keçirilir.

Aydın məsələdir ki, bir yoxsulun ehtirası coşsa, şəhvətini söndürmək istəsə və evlənmək imkanı olmasa, mütləq zinaya yol verəcək, cinayət edəcəkdir, çünki nəfs və həvəs ayrılmaz yoldaşdır,



yəni bir qarında bəslənmiş ekiz qardaşdır. Nə qədər bu oyaqdır, o biri də ayaq üstə duracaqdır.

Nağıl edirlər ki, bir dərvişi bir cavanla pis iş üstdə tutdular, rüsvayçılıq bir yana dursun,– daşqalaq qorxusu vardı, yalvarıb deyirdi: –Ay müsəlmanlar, rəhm edin, varım yoxdur evlənəm, taqətim yoxdur səbr edəm. Çarəm nədir, islam dinində də ki, rahiblik[107] qadağandır.

Dövlətlilərin ürəklərinin sakit və könüllərinin rahat olmasının bir səbəbi də odur ki, hər gecə bir sənəmi qoynuna salır, hər gün bir gözəli bağrına basır. Deməli:

M i s r a

Hər səhər yenidən bəyliyə başlar.

Səhər şəfəqi onun xoşbəxtliyindən vəcdə gəlib qızarır, sərv ağacı xəcalətindən aşağı baxmağa utanır.

Beyt

Batırıb əlini dostun qanına,
Fındıqça qoymuşdur dırnaqlarına.

Belə gözəllər ola–ola varlıların günaha batmaları, ya başqa çirkin işə əl atmaları inandırıcı deyildir.

Beyt

Bir gönül ki, əsir etmiş behişt hurilərini
Qəlbi qarət olmuşlara əhəmiyyət verərmi?

Beyt

Əlində xurması olan, bir nəfər.
Bir də daş atarmı ağaca məgər?

Əliboşların çoxu natəmiz adlarını günah çirkabına bulayar. Aclar isə çörək oğurlamağa belə məcbur olarlar.

Beyt

Yırtıcı it ət tapanda artar şövqi, həvəsi,
Sormaz Dəccal eşşəyidir bu, ya Saleh dəvəsi[108].

Çox görünüb ki, ən namuslu adamlar kasıblıq üzündən pis işlərə qoşulmuş, xalq içində yaxşı adını itirərək bədnam olmuşlar.

Beyt

Pəhrizə olarmı acın imkanı?
Yoxsulun deyərlər, olmaz imanı.

Hatəmi–Tai səhrada yaşardı. Şəhərdə olsaydı dilənçilərin əlindən aciz qalardı, əynindəki paltarı tikə–tikə olardı.

Cavab verdi: – Yox, mən varlıların halına acıyıram. Dedim: – Yox, varlarına həsrət çəkirsən.

Biz hələ uzun müddət belə sərt danışdıq, hücum edən hər piyadəsini dəf etməyə çalışdım, harda «şah» dedi isə, «vəzirlə» qarşısını aldım. Nəhayət mərifət xəzinəsində nə qədər sözü vardısa, hamısını dedm, höçət heybəsində nə qədər oxu vardısa, hamısını atdı.

Şer

Fəsahət əhlinin içindən rədd et,
O kəs ki, şişirdir özünü hər an
Din əhli, mərifət sənət sahibi,
Ona öz yerini verməli nişan.

Axırda dəlili qalmadı zəlil etdim. Əlin işə saldı, söyüş söyməyə başladı. Adətən cahil adamların peşəsi belədir, müxalifinə söz ilə bata bilməyəndə, düşmənçiliyə əl atırlar. Büttəraş Azər də belə etmişdi, sözdə oğluna üstün gələ bilmədiyi üçün davaya başlamış və demişdi: «sözünü geri götürməsən, səni daşla vuracağam».

Məni söydü, ondan da ağırını dedim, yaxamdan yapışdı, çənəsindən tutdum.

Şer



Mən onu qovuram, o qovur məni,
Xalq bizə rişxəndlə gülür arxadan.
Bizim sözümüzü eşidənlərin,
Barmağı ağzında qalmışdır heyran.

Müxtəsər, mürafiə üçün qazının yanına getdik, ədalətlə nə deyərsə razılaşacağımızı qət etdik. Dedik: qoy müsəlman hakimi bu məsələni həll etsin, varlılarla yoxsullar arasındakı fərqi şərh etsin.

Qazı diqqətlə üzümüzə baxdı, ciddiyyətlə sözümüzə qulaq asdı. Sonra dərin fikrə getdi. Bir azdan sonra başını qaldırıb dedi:

–Ey varlıları tərifləyib, yoxqulları təhqir edən şəxs, bilməlisən ki, gül tikansız, xəzinə ilansız ola bilməz, harda şərab var, orda məst də olacaqdır, harda sədəf var, orda nəhəng də olacaqdır. Dünyanın şirin ləzzəti dalında ölümün acı şərbəti durmuşdur, behişt nemətləri qarşısında Məkkarə səddləri qurulmuşdur.

Beyt

Dostu sevən dözməlidir sitəm etsə də əğyar,
Xəznə-ilan, gül və tikan, fərəh-fəğan bir olar.

Görmürsənmi bağda həm salxım söyüd olur, həm də quru çubuq. Eləcə də varlılar içərisində şükür edənlər olduqu kimi, küfr edənlər də vardır. Yoxsullar içərisində səbr edənlər olduğu kimi, diltəng olanlar da vardır.

Beyt

Hər bir şeh damlası dürr olsa əgər,
Bazarı qığ kimi doldurar gövhər.

Allaha o varlılar yaxındır ki, dərviş təbiət olsunlar, o yoxsullar yaxındır ki, varlı xislət olsunlar.

Varlıların ən böyüyü odur ki, yoxsulların halına qalsın, yoxsulların da ən yaxşısı odur ki, varlıların qapısını az açsın. «Allaha təvəkkül» ilə yaşayanların ruzisi çatacaqdır.

Sonra qazı məzəmmət nəzərlərini müddəiyə tərəf çevirib dedi:

–Ey deyən ki, «Varlıların başı qarışıqdır, işləri səhv, peşələri əyyaşlıqdır». Doğru deyirsən, belələri vardır, onların ağlı kəm, mürüvvəti azdır, əllərinə keçən nemətin qədrini bilməzlər, oğurlayar, gizlədər, özləri yeməz, başqalarına da verməzlər. Fərz edək ki, birdən quraqlıq olsa, ya Nuhun tufanı[109] qopsa, onlar öz varlarına arxayın olub yoxsulların halına qalmazlar və allahdan qorxmayıb deyərlər:

Beyt

Başqası yoxluqdan olsa da həlak,
Biz ördək kimiyik tufandan nə bak* ?!

Beyt

Dəvə üstə kəcavədə asudəcə oturan,
Bir arvadın nə vecinə quma batmış bir insan.

Beyt

Alçaqlar canını xilas edən dəm,
Deyərlər bizə nə batsa da aləm.

Bəli, bu dediyim kimiləri vardır. Lakin ehsan verən, dua oxuyan, həm bu dünya, həm axirət hayına qalanları da yox deyildir. Məsələn, dünya üzünün adil şahı, qələbələr və zəfərlər hakimi, islam dininin hamisi, Süleyman mülkünün varisi, zəmanə şahlarının ən ədalətlisi Müzəfərəddin Atabəy Əbubəkr ibn Səd ibn Zənginin (allah onun ömrünü uzun, bayraqlarını zəfərli etsin) bəndələri bu qəbildəndir.

Şer

Bir ata oğluna onu etmədi,
Ki, sən səxavətlə etdin insana,
Allah əvəzində səni qaldırdı,
Hökmüran eylədi bütün cahana.

Qazı sözü bu dərəcəyə çatdırdıqda, bizdən daha artıq mübaliğə

* Бак – горху



atını fəsahət meydanında çapdırdıqda yürütdüyü mühakimə, çıxardığı hökmlə razılaşmalı olduq. Aramızda olub–keçənləri unutduq. Bir–birimizə baş əyib salam verdik, dalaşmağı barışmaqla əvəz etdik. Qucaqlaşıb öpüşdük, fitnə yatdı, düşmənçilik aradan qalxdı, sülh yarandı, söhbətimiz bu sözlə tamamlandı:

Şer

Ey kasıb, dövrandan etmə şikayət,
Əgər bədbəxt olub, bədbəxt ölsən də.
Ey varlı xoşbəxtsən, həm ye, həm bəxş et,
Bu dünya səndədir, o dünya səndə.

## VIII FƏSİL

## SÖHBƏT QAYDALARI HAQQINDA

### (Hikmət və nəsihətlər)

**Hikmət**. Mal-dövlət yaşamaq üçündür, yaşamaq mal-dövlət yığmaq üçün deyil.

Ağıllı bir adamdan soruşdular:

–Xoşbəxt kimdir, bədbəxt kim?

Dedi:

–Xoşbəxt odur ki, əkər–yeyər, bədbəxt odur ki, qoyub–gedər.

Beyt

Namaz qılma o heçə ki, heç bir xeyir demədi,
Ömrü boyu ehtirasla mal topladı, yemədi.

**Hədis**. Musa əleyhissəlam Qaruna nəsihət edib deyirdi: – Başqalarına yaxşılıq elə, necə ki, allah sənə yaxşılıq edibdir. Eşitmədi, aqabətin eşitdin.

Şer

O adam ki, dinar, dirəm ilə xeyir görmədi,
Dinar, dirəm üstə başı getdi əldən nəhayət.
İstəyirsən xoş olasan sən hər iki dünyada,
Xəlqə kərəm et ki, sənə allah etmiş kəramət.

**Nəsihət.** Ərəblər deyirlər: bağışla, lakin minnət qoyma, çünki faydası özünə qayıdacaqdır.

Şer

Kəramət ağacı hara düşdüsə,
Boy atıb yüksəldi fələklərəcən.
Əgər istəyirsən bar verə daim,
Minnət ərəsilə onu kəsmə sən.



Şer

Allaha şükr elə, ki fayda vardır
Onun baxışında, fəzilətində,
Şaha minnət qoyma xidmqtinlə, bil
Səni o saxlamış öz xidmətində.

**Hikmət**. İki adam havayı zəhmət çəkib, faydasız əmək sərf edər: biri yığıb yeməyən, o biri bilib etməyən.

Şer

Biliyin olsa da bir ümman qədər,
Nadansan əməlin olmasa əgər,
Eşşəyə yüklənsə bir neçə kitab,
Nə alim olar o, nə də süxənvər.
Başı boş o yazıq heyvan nə bilsin,
Dalında odundur, ya kitab–dəftər.

**Nəsihət**. Elm əqidəli olmaq üçündür, dünya malı yığmaq üçün deyildir.

Beyt

Kim satsa biliyi, məsləki, dini,
Elə bil odlamış öz xirmənini.

**Hikmət**. Oxuduğuna əməl etməyən alim məşəl gəzdirən kora bənzər.

Beyt

Faydasız keçirsə ömrünü insan,
Qızılı tullayar bir şey almadan.

**Hikmət**. Ölkə ağıllı adamlarla gözəllənər, din pak adamlarla möhkəmlənər.

Şahlar alimlərin məsləhətinə daha çox möhtacdır, nəinki alimlər şahların mərhəmətinə.

Şer

Ey padişah, əgər məndən istəyirsən nəsihət,
Bu mənalı sözlərimi sən həmişə sal yada:
İşi ancaq alimlərə tapşır sən əl-əlbət
Hərçənd alim işə möhtac deyildir heç dünyada

Uç şey əbədi yaşamaz: – Mal ticarətsiz, elm mübahisəsiz və hökmdar siyasətsiz...

Pislərə rəhm edib, yaxşıları incitmək– zalimləri bağışlayıb, məzlumlara zülm etməkdir.

Beyt
Xəbisə nə qədər etsən ehtiram,
Sənin dövlətinə qatacaq haram.

**Hikmət**. Padşahların dostluğuna, uşaqların xoşavazlığına etibar yoxdur. Biri riya ilə dəyişilər, biri röya ilə.

Beyt

Min dostlu məşuqə könül vermə sən,
Verəndə ürəyi ayır bədəndən.

**Nəsihət.** Sirrini yoldaşına bildirmə, nə bilirsən bəlkə bir gün düşmən oldu. Düşmənin də çox zərər vurma, bəlkə bir gün dost oldu. Gizlətmək istədiyin sözü ən sədaqətli dostuna belə demə, çünki hər bir dostun öz dostu, dostunun da öz dostu var...

Şer

Susmaq çox yaxşıdır, nəki, sirri sən
Birinə deyərək, «demə» deyəsən.
Suyunu gözündən bağla çeşmənin,
Çünki arx dolarsa daşacaq yəqin.



Beyt

O söz ki, aşkarda deyə bilməzsən,
Onu gizlində də heç söyləmə sən.

**Nəsihət.** Zəif düşmən tabe olursa, o bunu güclü ola bilmək xatirinə edir. Əgər dostların dostluğuna etibar yoxdursa, düşmənin yaltaqlığına necə etibar etmək olar?! Kiçik düşmənə etinasız baxmaq, xırda qığılcıma məhəl qoymamaq kimidir.

Şer

Əlinə keçəntək düşməni öldür,
Çünki od yüksəlsə odlanar cahan.
Qoyma düşməni heç oxa əl atsın,
Onu tik ox ilə o əl açmadan.

**Nəsihət.** İki düşmən arasında elə söz danış ki, onlar dostlaşanda utanmayasan!

Şer

İki şəxsin arasında savaş bənzər bir oda,
Odun tökər od üstünə söz gəzdirən o bədbəxt.
Vuruşanlar çox çəkməz ki, barışarlar yenidən,
O naxələf ortalıqda qalıb çəkər xəcalət.
Anlamazdır iki adam arasına od salan,
Çünki özü bu atəşdə yanacaqdır nahayət.

Şer

Sözünü dostuna yavaşca danış,
Ta qulaq asmasın qan içən əğyar.
Divar qarşısında söz deyən zaman,
Bil ki, divarın da qulaqları var.

**Hikmət**. Düşmənlə barışanın məqsədi dostlarla savaşmaqdır.

Beyt

Ey ağıl sahibi o dostdan yan dur,
Ki, daim düşmənlə oturub–durur.

**Nəsihət**. Bir işə başlarkən tərəddüd etsən az zərərli tərəfini qəbul et.

Beyt

Sərt danışma başqası deyərsə xoş söz sənə,
Dava cavabı vermə sülh qapısın döyənə.

**Nəsihət.** Qızıl ilə düzələn işdə, canı təhlükəyə salmaq ağılsızlıqdır.

Beyt

Elə ki, əl üzdün bütün ümiddən.
Haqlısan qılınca əl atanda sən.

**Nəsihət.** Zəif düşmənə rəhmin gəlməsin, güclənsə sənə rəhm etməyəcəkdir.

Beyt

Düşməni zəif görcək qürrələnmə heç zaman,
Hər sümükdə bir məğz var, hər köynəkdə bir cavan.

**Nəsihət.** Kim pis adamı öldürsə, xalqı onun bəlasından qurtarar, onu isə allahın əzabından.

Şer

Yaxşılıq çox yaxşı sənətdir, amma,
Cəllad yarasına məlhəm qoyma sən.
İlana rəhm edən bilməyir məgər,
Adəm övladına zülm edir həmən.



**Nəsihət**. Düşmənin nəsihətini qəbul etmək xatadırsa, onu eşitmək rəvadır, çünki dediyinin əksinə əməl etdikdə, təmamilə düzgün iş görmüş olarsan!

Şer

Qaç düşmən dediyi sözlərdən hər an,
Olarsan axırda bil ki, peşiman.
O sənə göstərsə yolu dümbədüz,
Sola dön, o yolu hesab etmə düz.

Hədsiz sərtlik dəhşət yaradar, yersiz mülayimlik hörmət azaldar. Nə elə qaba ol ki, səndən qaçsınlar, nə elə yumşaq ol ki, üzünə qabarsınlar!

Şer

Adam həm sərt olar, həm də mülayim,
Aqil peşə etməz sərtliyi daim.
Olsan çox mülayim qudurar düşmən,
Sərt olsan düşərsən qədrü qiymətdən.
Çalış həddən artıq özünü öymə,
Həddindən artıq da qəddini əymə!

Şer

Qoca atasına dedi bir çoban;
– Mənə bir öyüd ver, ey aqal insan!
Dedi: Xeyrxah ol, nə bir o qədər,
Ki, qurdlar sürünü eyləsin hədər.

**Hikmət**. İki adam dinin və dövlətin düşmənidir: – helmi olmayan hakim, elmi olmayan alim.

Beyt

Olmasın ölkədə elə padişah
Bilməsə ki, ondan böyükdür allah.

**Nəsihət.** Gərək şah düşmənə elə hiddətlənməsin ki, dostların da inamı qırılsın. Hirs atəşinin ilk odundan qəzəb sahibi yanar, alovun düşmənə çatıb–çatmaması isə sonraya qalar.

Şer

Torpaqdan yaranan insan övladı,
Yel kimi təkəbbür göstərməz bir an.
Belə ki, odlusan, təkəbbürlüsən,
Bilmirəm oddansan ya ki, torpaqdan.

Şer

Biləqanda[110] bir abidlə görüşdüm,
Dedim: mənə bir öyüd ver, et dua.
Dedi: get sən dozümlü ol, torpaqtək,
Biliyini basdır ya da torpağa.

**Hikmət**. Xasiyyəti pis adam elə bir düşmən əlinə keçmişdir ki, hara getsə canını onun cəngindən qurtara bilməyəcəkdir.

Beyt

Bədcins bəla əlindən fələyə qaçsa əgər,
Öz xisləti əlindən yenə də bəla çəgər.

**Nəsihət.** Düşmən qüvvələrini dağılmış görsən, cəm ol, toplanmış görsən, sayıq.

Şer

Düşmənlər pərişan olduğu zaman,
Dostlarla kef elə, çəkmə dərdü qəm.
Gördün ki, düşmənlər dilbirdir, durma,
Kamanı saz elə, hasarı möhkəm.

**Hikmət**. Tədbirləri baş tutmayanda düşmən dostluq fikrinə



düşər və dostluqla elə işlər görər ki, onu heç bir düşmən bacarmaz.

**Nəsihət.** İlanın başını düşmən əlilə əz, hər iki tərəfi xeyirlidir: düşmən qələbə çalarsa, ilanı öldürmüş olarsan, ilan qalib gələrsə, düşməndən qurtararsan!

Beyt

Davada qorx zəif düşməndən hər an,
O, şiri hədələr öldüyü zaman.

**Nəsihət.** Xəbər ürək açan deyilsə, sən sus, başqası desin.

Beyt

Ey bülbül, sən gətir bahar xəbəri,
Qoy bayquş söyləsin pis xəbərləri.

**Nəsihət**. Qəbul edəcəyinə əmin olmayınca, heç kəsin xəyanətini şaha açma, yoxsa öz həyatını təhlükəyə salmış olarsan.

Beyt

Sözünü o zaman söylə ki, yəqin,
Nəticə verəcək sənin sözlərin.

**Nəsihət.** Nəsihətdən dəm vuran adamın özü başqalarının öyüdünə möhtacdır!

Düşmənin sözünə aldanma, məddahın tərifini qulağa alma; biri kələk üçündür, biri çörək! Qoyunu topuğundan püfləyəndə şişdiyi kimi, axmağı da tərifləyəndə şişər!

Şer

İnanma o məddah şairlərə ki,
Bir zərrə nəfüçün səni mədh edər.
Verməsən ona bir mənfəət, inan,
Eybini sayacaq beş yüz o qədər.

**Hikmət**. Danışana eyib tutan olmasa, danışığı islah olmaz!

Beyt

Öz sözünün lütfünə qürrələnmə bir belə,
Qanmazın boş tərifi və öz bəyənməyinlə.

**Hikmət**. Hər kəsə özü kamallı, övladı camallı görünər!

**Lətifə**

Yəhudilə müsəlman savaşırdı bir zaman,
Gülmək tutdu məni çox onların əhvalından.
Müsəlman deyirdi ki, qəbaləm yalansa qoy,



Bir yəhudi olum mən. olmasın məndə vicdan.
Yəhudi söyləyirdi Tövrata and içirəm,
Əgər mən yalan desəm, qoy adlanım müsəlman.
Ağıl silinsə əgər bu dünyadan büsbütün,
Yenə bir kəs özünü bilməz cahil və nadan.

**Hikmət**. On adam bir süfrə başında yeyə bilər, iki it bir cəmdək üstə dalaşmaya bilməz! Tamahkara dünyanı da versən doymaz, gözütoxa bir çörək də bəs olar. Mal çoxluğundansa, göz toxluğu yaxşıdır!

Beyt

Bir çörək doldurar bağırsaqları,
Dar gözü doydurmaz dünyanın varı.

Şer

Ölən zaman atam edib vəsiyyət,
Mənə verdi ancaq bircə nəsihət.
Dedi: Şəhvət oddur, uzaq ol ondan,
Uzaqlaş sən bu cəhənnəm odundan.
Cəhənnəmdə yanmaqa tab etməzsən,
Öz səbrinlə su səp ona indidən.

**Nəsihət.** Varlı vaxtında kömək etməyən, yoxsul zamanında kömək görməz.

Beyt

Dünyada ən bədbəxt mərdümazardır,
Dara düşsə hamı ondan bezardır.

Tələsik düzələn şeyin ömrü çox olmaz.

Şer

Deyirlər ki, qırx ilə Şərq elində,

Qayırırlar bir dənə çin kasası
Mərvdəştdə[111] hər gün yüzü qayrılar,
Görürsən də necə olur bahası?!

Şer

Yumurtadan çıxan kimi cücə ruzi axtarar,
Bilməz lakin şüur nədir, doğulanda hər insan.
O tez qandı, tez usandı, axır qaldı əli boş
Bu təmkinlə, fəzilətlə şöhrət tapdı anbaan.
Şüşə boldur, buna görə ona qiymət verilməz,
Qiymətlidir inci, çünki olubdur az tapılan.

**Nəsihət.** Hər şey səbrlə düzələr, tələsən tərsə düşər.

Şer

Gözümlə görmüşəm biyabanda mən,
Təmkinlə yol gedən qaçanı ötdü.
Sürətli səmənd at yoruldu yolda,
Dəvəsə ahəstə mənzilə yetdi.

**Nəsihət.** Nadan üçün susmaqdan yaxşısı yoxdur, lakin əgər o bunu bilsəydi, nadan olmazdı.

Şer

Sənin ki, kamalın, şüurun yoxdur,
Yaxşıdır dilini salasan bəndə.
Adamı öz dili hörmətdən salar,
Puç qoz da bilinər yüngül gələndə,

Lətifə

Bir əbləh daima çalışırdı ki,
Eşşəyə öyrətsin hərfi təmamən,
Bir ağıllı dedi: – Ay axmaq kişi,
Əl çək bu xam xəyal, sarsaq əməldən,
Heyvan danışmağı səndən öyrənməz,



Barı sən susmağı heyvandan öyrən.

Şer

Hər kəs çalışsa ki, tez versin cavab,
Çox sözü səhv olar çəgər iztirab,
Ya dil aç söz söylə huşlu insantək,
Ya da sus danışma dilsiz heyvantək.

**Hikmət**. Kim özündən çox bilənlə mübahisə etsə ki, biliyi meydana çıxsın, biliksizliyi ortaya çıxar.

Beyt

Səndən ağıllılar bir söz deyəndə,
Etiraz eləmə, yaxşı bilsən də.

**Hikmət**. Pislə oturan yaxşılıq qazana bilməz.

Şer

Mələk divlə oturarsa bir yerdə,
Öyrənəcək hiylə, riya, xəyanət.
Sən pislərdən öyrənməzsən yaxşılıq,
Qurddan olmaz kürk dərisi nəhayət.

**Nəsihət.** Xalqın gizli eybini açma ki, onları rüsvay edərsən, özünü etibardan salarsan.

Elm oxuyub əməl etməyən adam, yer sürüb toxum səpməyən əkinçiyə bənzər!

İmansız adamda ibadət olmaz, ağılsız adama dövlət yaraşmaz! Savaşda zirəng olan adam mülayim olmaz!

Beyt

Sanma ki, çadrada bir cananədir,
Bəlkə açıb gördün qarı nənədir.

**Hikmət**. Əgər hər gecə Qədr gecəsi olsaydı, onda əsl Qədr gecəsi qədrsiz olardı.

Beyt

Kövhər adlansaydı dünyada hər daş,
Bir qiymət alardı onda: kövhər, daş.

**Hikmət**. Hər zahiri göyçək olanın batini də gözəl olmaz. İş təbiətdədir, surətdə deyil.

Şer

Hər kişinin üzündən bilmək olar bir gündə,
Onun elmi, şüuru yüksəlmiş haralara,
Lakin onun qəlbini bildim deyə fəxr etmə!
İllər lazım özünü bildirsin qəlbi qara.

**Nəsihət.** Böyüklərlə davaya qalxanlar öz qanlarına qəltan olarlar.

Şer

Özünü çox böyük hesab eyləmə,
Düz demişlər biri iki görər çaş.
Çox çəkməz kəlləni sınmış görərsən.
Qoçla vuruşmağa tab etməz bu baş.

**Hikmət**. Şirlə pəncələşmək, şəmşirlə yumruqlaşmaq ağıllı adamlara yaraşmaz.

Beyt

Məstilə gücünü sınama bir an,
Əlini qoynunda saxlayıb, dayan.

**Nəsihət.** Gücsüz güclüyə igidlik göstərmək istəsə, öz qətlində düşmənə kömək etmiş olar.



Şer

Ana uşağının nə gücü vardır.
Vuruşsun cənkavər bir pəhləvanla.
Zəif nadanlıqdan qırar qolunu,
Döyüşsə dəmirqol bir qəhrəmanla.

Hər kəs nəsihət eşitməsə, danlaq eşitməlidir.

Beyt

Əgər qulağına girmir nəsihət,
Sus, səni danladığım vəqt!

**Hikmət**. Küçə itlərinin ov itini görməyə gözü olmadığı kimi, hünərsizlərin də hünər sahibini görməyə gözləri olmaz, hay-küy qoparırlar, lakin qabağa gəlməkdən qorxarlar, yəni rəzil adam sənətdə birinə üstün gələ bilmədikdə böhtana başlayıb onun üstə düşər.

Beyt

Paxıllar çox qiybət etməyi sevər,
Susarlar qarşıda dilli görsələr.

**Hikmət**. Qarın olmasaydı heç bir quş tora düşməzdi, bəlkə də heç ovçu tor qurmazdı.

Filosoflar gec-gec yeyər, möminlər doymadan çəkilər, zahid qarnı tutunca, gənclər nimçədəki qurtarınca, qocalar tar təgüncə, qələndərlər isə mədədə yer, süfrədə çörək qalınca yeyərlər

Beyt

İki gün qarınqulu yata bilməz sübhəcən,
Bir gün dolu mədədən, bir gün də boş mədədən.

**Hikmət**. Arvada qulaq asmaq, abdala süfrə açmaq günahdır.

Beyt

Rəhm etsən qan içən vəhşi pələngə,
Qoyuna zülm edib salırsan çənkə.

**Hikmət**. Kimin qarşısında öz düşmənidir, öldürməsə özü öz düşmənidir.

Beyt

Əldə daş, qıvrılır daş üstə ilan,
Səbr edib düşünməz ağıllı olan.

**Hikmət**. Bəziləri isə bu fikrin əleyhinədirlər. Onlar deyirlər: – Əsiri öldürməkdən, səbr etmək daha məsləhətdir, çünki ixtiyar əldədir, istəsən öldürərsən, istəsən bağışlarsan, lakin tələsik öldürsən, bir də lazım ola bilər, geri qaytara bilməzsən, peşman olarsan.

Şer

Dirini öldürmək mümkündür hər an,
Ölünü diriltmək olmaz heç zaman.
Ox atan lazımdır səbr etsin bir az,
Kamandan çıxan ox bir də qayıtmaz.

**Hikmət**. Cahillərə baş qoşan alim hörmət gözləməməlidir. Cahil adam heyvərəlik və uzunçuluqda alimə üstün gəlsə təəccüblü deyildir, çünki həmişə daş cəvahiri sındırar.

Beyt

Bülbülün qarğa ilə birkə olsa qəfəsi,
Təəccublü deyildir çıxmasa onun səsi.

Şer

Əgər hünər sahibini incitsə bir hünərsiz,



Onun qanı bu təhqirdən zərrə qədər qaralmaz.
Çünki sınsa qara daşla bir zər kasa, heç zaman,
Daşın qədri yüksəlməz və zərin qədri azalmaz.

Ağıllı adamın axmaqlar qarşısında susmağı təəccüblü deyildir, çünki nağara səsi, tar səsinə, sarımsaq iyi isə ənbər qoxusuna həmişə üstün gələr.

Şer

Bir cahil hay-küylə qaldıraraq səs
Qoymadı aqali bir alsın nəfəs.
Məlumdur ki, həzin ahəngli hicaz,
Döyüş təbilinin səsini basmaz.

**Hikmət**. Cavahir toz-torpaqa batsa da yenə qiymətini itirməz, toz–torpaq göyə qalxsa da yenə qiymətə minməz. Tərbiyəsiz istedad heyfdir, istedadsız tərbiyə isə mümkün deyildir. Kül oddan əmələ gəldiyi üçün ali əsli–nəsəbi vardır, lakin özündə hünər olmadığından torpağa bərabərdir; şəgərin qiyməti qamışdan əmələ gəldiyi üçün deyil, təbiətində şirinlik olduğu üçündür.

Şer

Kənanın yox idi hünəri, ona
Peyğəmbər nəsili açmadı müşkül
Sən qızı göstərmə, hünəri göstər.
İbrahim[112] oddandır, tikandan da gül.

**Hikmət**. Müşk odur ki, ətir versin, nəinki əttar desin.

Beyt

İnsanda vardırsa hünərdən əsər,
Özü susarsa da danışar hünər.

Beyt

Aqil əttar dükanıtək: özü sakit, ətri xoş,
Cahil döyüş təbli kimi: özü küylü, içi boş.

Şer

Məsəl var deyərlər: kamil bir alim
Cahillər içinə düşərsə əgər
O bənzər pəriyə korlar içində,
Ya zındıq evində Qurana bənzər.

**Nəsihət.** Bir ömürdə ələ gələn dostu, bir anda incidib əldən vermə.



Beyt

Neçə ilə daş ləl olar qoca dövran içində,
Aman daşa çırpma onu, sən də bir an içində.

**Hikmət**. İradəsiz kişi həyasız arvadın əlindən yaxasını qurtara bilmədiyi kimi, ağıllı da nəfsin əlindən öz canını qurtara bilmir. Gücə əsaslanmayan bir tədbir əfsanəyə bənzər, tədbirə əsaslanmayan bir güc isə divanəyə. Əvvəlcə tədbir və qabiliyyət lazımdır, sonra hökmranlıq.

Beyt

Ölkəsindən əvvəl tədbir, zəka lazım hər şaha
Ki, nadanın səltənəti meydan oxur allaha.

Yeyib paylayan igid, yığıb saxlayan abiddən yaxşıdır. Yalnız camaatın xoşuna gəlmək xatirinə bu dünyanın eyş-işrətindən əl çəkən adam, halal şöhrəti atıb, haram şəhvətdən yapışmış olar.

Şer

Abid allah xatirinə guşənişin olmasa,
O yazıq nə görə bilər qaralmış bir aynada.

**Hikmət**. Dənə–dənə bol olar, dama–dama göl olar, yəni gücü çatmayan adamlar kiçik daş yığıb saxlayar, fürsət düşcək zalimdən qisas alar.

Beyt

Qətrələr toplaşıb çay olur haman,
Çaylar da birləşib yaradır ümman.

Beyt

Yığılıb göl olar kiçik damlalar,
Balaca dənlərdən düzələr anbar.

**Hikmət**. Alim avamların səhvlərinə göz yummamalıdır. Bunun hər iki tərəfə ziyanı vardır: bu tərəfin əzəməti azalar, o tərəfin cəhaləti artar.

Beyt

Alçaqla danışsan xoş dil ilə sən,
O da lovğalanıb öyünər həmən...

**Nəsihət.** Şeytan əməli heç kimə yaraşmaz, xüsusilə alimə! Çünki elm şeytana qarşı bir silahdır, silah sahibi isə düşmənə əsir düşsə, rüsvayçılıq bir neçə qat artıq olar.

Şer

Günü qara olan bir avam, nadan,
Yaxşıdır xeyirsiz bir ağıllıdan
O kordu, görmədi yolu, sürüşdü
Bu iki göz ilə quyuya düşdü.

**Hikmət**. Can bir nəfəsə bağlıdır, dünya isə iki yoxluq arasında bir varlıqdır, dini dünyaya satanlar xamdırlar, Yusifi satanlar əvəzində nə alacaqlar?!

Beyt

Düşmənin sözüylə dostunu satdın,
Gör kimlə birləşdin, gör kimi atdın?!

**Lətifə**. Şeytan düzdən qaçar, sultan pulsuzdan.

Şer

Namaz qılmayana borc vermə aman,
Aclıqdan şikayət etsə də haman.
O allah borcunu vermirsə, Əgər,
Bəndənin borcunu neçə ödəyər?



**Nəsihət.** Diriliyində adamın çörəyini yeməsələr, öləndən sonra adını çəkməzlər! Üzümün dadın bağ sahibindən çox, onu yığan dul qadın bilər. Misirdə qəhətlik üz verdikdə Yusif peyğəmbər doyunca yeməzdi ki, acları unutmasın!

Şer

Bolluqda yaşayan toxlar nə bilir,
Acların əhvalı neçə yamandır,
Yazığın halını o kəs bilər ki,
Aclığın dəhşəti ona əyandır.

Şer

Köhlənə minən ey səvari bil ki,
Eşşəyi batanı atmaq günahdır.
Sən kasıb qonşundan od da istəmə,
Bacadan yüksələn tüstülər ahdır.

**Hikmət**. Qıtlıq ilində, vəziyyəti ağır olan dərvişə yalnız o şərtilə «Kefin necədir?» deyə bilərsən ki, yarasına məlhəm qoyasan, qabağına dirhəm.

Şer

Bir kişinin görsən batıb gilə yüklü eşşəyi,
Ürəyində təəssüf et, lakin yaxın getmə sən,
Əgər gedib soruşdunsa nə olmuşdur? Gərəkdir,
Qol çırmayıb eşşəyinin quyruğundan çəkəsən.

**Hikmət**. İki şey mümkün deyilir. Qismətdən artıq yemək və əcəl catmamış ölmək.

Şer

Qəza bir də təkrar etməz dad etsə də bir qarı,
Min ah çəkib bir ağızdan qoparsa da min şivən.

Nə vecinə küləklərə vəkil olan mələyin,
Xəzan vaxtı bir qarının şamı söndü küləkdən.

**Nəsihət.** Ey ruzisi qalmış getmə, yiyəcəksən, ey əcəli çatmış acma, öləcəksən.

Şer

Özün üçün çalışsan da, əgər çalışmasan da,
Yetirəcək öz ruzunu sənə böyük yaradan.
Sən ağzına girsən də lap qızmış şirin, pələngin,
Bir şey olmaz əgər əcəl çatmamışsa bu zaman.

**Hikmət**. Qismətin deyilsə, əlin çatmayacaqdır, qismətindirsə harda olsan, gəlib tapacaqdır.

Beyt

Ab–həyat[113] tapmaq üçün İsgəndər çox yol keçdi,
Zülmatə dək getdi, lakin onu təkcə Xızr içdi.

**Hikmət**. Qisməti olmayan ovçu Dəclədə balıq tuta bilməz, əcəli çatmamış balıq quruda ölməz.

Beyt

Yazıq xəsis dincəlməz gəzər hey yorulunca,
O gəlirin dalınca, əcəl onun dalınca.

**Hikmət**. Fasiq varlı üstü qızılla suvanmış təzəkdir, sadiq yoxsul, üzü toza bulanmış bəzəkdir, bu Musanın yamaqlı paltarıdır, o Fironun yaraqlı saqqalı. Yaxşıların möhnətinin axırı sevinc olacaq, pislərin dövlətinin sonu heç.

Şer

Hər kimin vardırsa dövləti, malı,
Onun ürəyinə yol tapmaz kədər.



Bir söylə heç dövlət, səadət, şadlıq,
Başqa bir saraya girərmi məyər?

**Hikmət**. Paxıl, allahın başqasına verdiyi nemətindən paxıllıq edər və günahsız adamlardan da zəhləsi gedər.

Şer

Kütbeyin bir kişi gördüm ki, varlı,
Bir şəxsin dalınca hey qeybət edir.
Dedim ki, ey xacə, sən bədbəxt isən,
Xoşbəxt bir adamın günahı nədir?

Şer

Paxıla istəmə bəla, o yazıq,
Olmuşdur əbədi bəlayə düçar.
Nə lazım olasan paxılla düşmən,
Onun paxıllıqtək öz düşməni var.

**Həqiqət.** Həvəssiz şagird pulsuz aşiqə, bələdçisiz səyyah qanadsız quşa, əməlsiz alim barsız ağaca, elmsiz zahid qapısız evə oxşar. Quranın nüzulundan məqsəd yaxşı əxlaq üçündür, surələri varaqlamaq üçün deyildir. İbadət edən avam yeriyən piyadəyə, riayət etməyən alim yatan süvariyə oxşar. Gözünü yuxarı dikən günahkar özünü yuxarı tutan dindardan yaxşıdır.

Beyt

Mərhəmət sahibi olan bir sərdar,
Zülmkar qazıdan çox üstün olar.

**Nəsihət.** Bir adamdan soruşdular:
–Barsız alim nəyə bənzər?
Dedi:
–Balsız arıya!

Beyt

Eşşək arısına deyək: «Ay arı
Sən ki bal vermirsən, gəl sancma barı!»

Mürüvvətsiz kişi – arvad, tamahkar abid – quldurdur.



Şer

Ağ geyinib xalq gözündə özünü düz göstərən,
Ey hər işi qəlbi kimi qara olan bişüur.
Bu dünyadan öz əlini üzən zaman nə fərqi,
Paltarının qolu qısa, ya da ki, çox uzundur.

**Hikmət**. İki adamın: gəmisi batmış tacirlə, qələndərə dost olmuş varisin qəlbi təəssüf dərdindən, ayağı həsrət zəncirindən xilas ola bilməz.

Şer

Dərvişlər gözündə halaldır qanın,
Onlara olmasa xeyrin, ehsanın.
Ya yoldaş olmasın sənə göy köynək,
Ya da ki, büsbütün evindən əl çək.
Ya dostluq eyləmə filbanla əsla
Ya fil kirə bilən bir həyət saxla.

**Nəsihət.** Şah verən xələt nə qədər izzətli olsa da, öz paltarın daha izzətlidir. Hökmdar süfrəsindəki xörək nə qədər ləzzətli olsa da, öz heybəndəki çörək daha ləzzətlidir.

Beyt

Yaxşıdır öz halal sirkənlə tərən,
Kəndxuda verdiyi quzu ətindən.

**Hikmət**. Naməlum dərmanı həkimsiz içmək, nabələd yolu karvansız getmək ağıllı adamların, işi deyil. İmam Məhəmməd Qəzalidən[114] soruşdular:
–Elmdə bu dərəcəyə necə çatdın.
Dedi:
–Bilmədiyim şeyi soruşmaqdan utanmadım.

Şer

Sağlamlıq o zaman təmin olar ki,
Təbibə verəsən sən öz nəbzini.
Hər şeyi bilməsən soruş, utanma,
Sənə bu öyrədər bilik rəmzini.

**Nəsihət**. O şeyi ki, arxayınsan sənə deyəcəklər, soruşmağa tələsmə, çünki, hörmətə zərəri var.

Şer

Loğman görəndə ki Davud əlində,
Bir dəmir parçası dönüb olur mum.
Sirri soruşmadı, bildi sorğusuz,
Olacaq az sonra məsələ məlum.

**Hikmət**. Qonşuluq şərtlərindən biri budur ki, ya özünə ev tikəsən, ya ev sahibi ilə yola gedəsən.

Şer

Müsahib zövqüncə söz de hər zaman,
Əgər onun sənə vardırsa meyli.
Hər aqil Məcnunla oturub dursa,
Sözü olmalıdır «Leyli və Leyli».

**Nəsihət**. Yaramaz adamlara qoşulan, onların təbiətini qəbul etməsə də, onların təriqətinə görə müttəhim edilər, xərabata namaz qılmağa getsə onu şərab içməkdə taqsırlandırarlar.

Şer

Anlamaz yerinə qoydun özünü,
Nadanı özünə eylədin həmdəm.
Alimdən istədim versin nəsihət,
Dedi ki, nadanla oturma bir dəm,
Əgər alim isən nadan olarsan,
Nadansan olarsan nadan da kəm.



**Hikmət**. Dəvənin həlim olduqunu hamı bilir. Noxtasını bir uşaq tutub yüz ağac[115] aparsa yenə itaətindən çıxmaz. Lakin təhlükəli bir uçuruma rast gəldikdə, uşaq nadanlıq ucundan keçmək istəsə, dəvə artıq itaətdən boyun qaçırar, dartıb noxtanı uşaqın əlindən alar, çünki belə vaxtda sərt olmaq əvəzinə həlim olmaq düzgün deyildir. Məsəl var deyərlər: Düşmən yumşaqlıqla dost olmaz, bəlkə bir az da tamahı artar.

Şer

Qulu ol, baxsa sənə kimsə məhəbbətlə əgər,
Kim sənə əyri baxa, durma çıxar gözlərini
Yumuşaq söyləmə sən qəlbi daşa sözlərini,
Ki, pas atmış dəmirə incə yiyə etməz əsər.

**Nəsihət.** Hər kəs başqalarının sözünü kəssə ki, öz mərifətinin dərəcəsini bildirsin, tərbiyəsinin səviyyəsini göstərmiş olar.

Şer

Ağıllı ta ondan soruşmasalar,
Dil açıb bir cavab verməz heç zaman.
Boşboğaz haq söz də desə, şübhəsiz,
Elə bilərlər ki, o, deyir yalan.

**Nəsihət.** Paltarımın altında bir yaram var idi, hər gün şeyx soruşardı:

–Yaran necədir? Soruşmazdı ki, yaran haradadır? Başa düşdüm qəsdən belə edir, bilir ki, hər üzvün adını deməyi rəva görməzlər. Ağıllı adamlar deyiblər: «Ölçülməmiş suala, biçilməmiş çavab verərlər».

Şer

Qəti bilmədikcə doğrudur sözün,
Bir söz də deməyə ağzını açma.
Düz deyib zindanda qalmaq yaxşıdır,
Yalanla zindandan qurtarmaqdansa.

**Hikmət**. Yalan da xəncər yarası kimi bir şeydir, özü sağalsa da, izi qalar. Odur ki, Yusifin qardaşları yalançılıqda şöhrət tapdıqdan sonra doqrularına da inanan olmadı...



Şer

Hər bir kəsi tanısalar daim doğru danışan,
Bir xətayə yol versə də keçərlər günahından.
Əgər adı şöhrət tapsa onun yalançılıqda,
İnanmazlar şübhəsiz ki, doğru söz deyən zaman.

**Hikmət**. Bütün kainatın ən əzizi, zahirən insan, mövcudatın ən rəzili itdir. Lakin ağıllı adamların hamısı bu fikirdədir ki, vəfalı it vəfasız insandan yaxşıdır.

Şer

Bir itə bir tikə çörək verəndə,
Unutmaz yüz kərə bassan da daşa.
Alcağa bir ömür çörək yedirsən,
Bir dəfə tünd olsan başlar savaşa.

**Nəsihət.** Öz hayına qalanda hünər olmaz, hünəri olmayandan rəhbər çıxmaz.

Şer

Yekə bir öküzə rəhm eyləmə sən,
Ki çox yatan olar, həm də çox yeyən.
Kökəlmək istəsən gər ögüz kimi
Ulağtək insana xidməti öyrən.

**Hikmət**. İncildə yazılıbdır: «Ey insan övladı, dövlət verirəm başın eyş-işrətə qarışır, məni unudursan, yoxsul edirəm mısmırığını salıb oturursan».

Şer

Gah nemət içində məğrursan ğafil,
Gah da yoxsulluqla əlbəyaxasan.
Yoxsulluq, bolluqda işin belədir,
Vaxt hanı haqqa da bir az baxasan.

**Hikmət**. Qəza birini şahlıq taxtından yerə salır, birini balıq qarnında diri saxlayır.

Şer

Sənin zikrin munis olar hər yerdə, hər məkanda
Lap Yunistək mümkün olsa bir balığın qarnında.

**Hikmət**. Qəza qəzəb qılıncına əl atsa imamlar, peyğəmbərlər başların içəri çəkər, mərhəmət qaşını oynatsa, pislər vurub yaxşıları geçər.

Şer

Olarsa məhşərdə qəhrilə xitab,
Üzrə dil açarmı heç bir peyğəmbər?
Qoy lütfün üzündə pərdə olmasın,
Axı əfv istəyir günahkar bəşər.

**Nəsihət**. Kim bu dünyadan ibrət alıb doğru yola gəlməsə, o dünyada əzab–əziyyətə mübtəla olacaqdır: «Biz bu dünyada onları yüngül imtahana çəkirik, axirətdə isə işgəncələr daha ağır olacaqdır».

Beyt

Əvvəlcə kiçiyə nəsihət olar,
O təsir etməsə bəndə vurular.

**Nəsihət.** Xoşbəxtlər özlərindən əvvəlkilərin başına gələn əhvalatlardan ibrət alarlar, bəd əməlləri ilə sonrakılara ibrət olmazlar.

Şer

Quş–quşu görüncə torun içində,
Dənə toxunmağa edərmi cürət,
Özgə əzabından sən ibrət götür,
Ta səndən almasın özgələr ibrət.



**Hikmət**. Bəxt qulağı kar yaradılan necə eşidə bilər, səadət kəməndi ilə aparılan necə getməyə bilər?!

Şer

Qaranlıq gecədə allah dostları,
Gündüztək aləmi işıqlandırar.
Qol gücü yaratmaz bu səadəti,
Əgər bəxş etməsə xudavəndkar.

Şer

Axı səndən kimə edim mən şikayət ey xuda,
Səndən daha üstün olan varmı bütün dünyada.
Kimə rəhbər sənsən onu heç kəs yoldan çıxarmaz,
Sən hər kəsi rədd eyləsən bir kəs çatmaz imdada.

**Hikmət**. Aqibəti pis şah olmaqdansa, nəhayəti yaxşı gəda olmaq yaxşıdır!

Şadlıqdan əzəlki kədər, qəm inan,
Xoşdur qəmdən əvvəl gələn şadlıqdan.

**Hikmət**. Göydən yerə nemət yaqır, yerdən göyə torpaq qalxır. hər kəsin qabında nə varsa onu büruzə verir.

Beyt

Sənin nəzərində pis olsam da mən,
Öz yaxşılığını vermə əlindən.

O böyük çəlal sahibi həm görür, həm də üstünü örtür, qonşu isə heç nə görmür, amma ağzına gələni deyir.

Beyt

Xalq əgər qeybdən tutsaydı xəbər,

Dünyada olmazdı rahat bir nəfər.

**Hikmət**. Qızılı, mədəndən–qazmaqla, xəsisdən isə–canını almaqla əldə etmək olar.

Şer

Alçaqlar yeməyib belə söyləyər,
«Yaxşıdır yeməkdən ümid dünyada»
Düşmənin kamınca bir gün görərsən.
O ölmüş, dövləti qalmışdır yada.

**Nəsihət.** Özündən gücsüzlərə rəhm etməyən, özündən güclülərin zülmünə rast gələr!

Şer

Qolunda zor varsa göstərmə barı,
Sən basıb sındırma zəif qolları.
Gücsüzə zülm edib ziyan vermə sən,
Ki, daha güclüdən zərər görərsən.

**Hikmət**. Ağıllı adam dava–dalaş gördü qaçar, barış gördü löngər salar. Orada salamatlıq kənardadır, burada rahatlıq ortada.
Zər atana se–şeş lazımdır, lakin se–yek gəlir.

Beyt

Meydandan min dəfə xoşsa çəmənzar,
Atın ki, əlində deyil ixtiyar.

Bir dərviş münacat çəkib deyirdi:
–İlahi, pislərə rəhmin gəlsin, yaxşılara rəhm edibsən ki, onları yaxşı yaradıbsan.
İlk dəfə paltara naxış vuran, barmağa üzük taxan Cəmşid[116] olmuşdur. Ondan soruşdular:
–Nə üçün zinəti sola veribsiniz, halbuki, fəzilətdə sag ondan ustündür.
Cəmşid dedi:



–Sağa sağlığın özü böyük zinətdir.

Şer

Çinli nəqqaşlara dedi Fridun,
Yazılsın təxtinə zərlə bu sözlər:
Ey aqil, pisləri yaxşı saxla ki,
Yaxşılar özləri olar bəxtəvər.

**Hikmət**. Böyük bir şəxsdən soruşdular:
–Sağ əl çox cəhətdən sol ələ üqtündür, buna baxmayaraq nə üçün üzüyü sol ələ taxırlar?
Dedi:
–Bilmirsən ki, fəzilətli adam həmişə məhrum olar!

Beyt

Ləzzəti, əzabı yaradan budur,
Birinə bəxt vermiş, birinə şüur.

**Nəsihət**. Şahlara yalnız o adam öyüd verə bilər ki, başından qorxmasın, ya da bəxşiş ümidində olmasın!

Şer

Allaha bir deyənin ayağına pul töksən,
Ya bir hindu qılıncı onun üstünə çəksən
Aldanmaz və qorxmaz o, tohid buna deyirlər,
Dindarlığın əsası belə olmuş mötəbər.

**Hikmət**. Şah, adamları zülmkarlardan, darğa dələduzlardan qorumaq üçündür. Qazı isə oğruları doğruya çıxarmaq üçün. Buna görə də iki müddəm haqq işə razı olsa, qətiyyən qazının yanına getməz.

Şer

Bir həqqi ödəmək lazım gələndə,

Xoşluqla ver onu, nə lazım hədə?
Könüllü verməsə hər kəs borcunu.
Zor ilə nəhayət alarlar onu.

**Lətifə**. Hamının dişi turşdan qamaşar, qazınınkı şirnidən.



Beyt

Qazı rüşvət alsa səndən beş xiyar,
Yüz qarpız xırını xeyrinə yazar.

**Hikmət**. İşdən düşmüş, əxlaqsız bir qarı fahişəlikdən, işdən düşürülmüş insafsız bir darğa mərdümazarlıqdan əl çəkib tövbə etməsin, bəs nə etsin?!

Beyt

Bənzər qoca abidə guşənişin bir cavan,
Ki qocada onsuz da durmağa yox tab, təvan.

Beyt

Cavan gərək gözləsin özünü çox şəhvətdən,
Ki süst qoca onsuz da bizardır yox şəhvətdən.

**Hikmət**. Bir filosofdan soruşdular:

–Allah bu qədər hündür, qocaman ağaclar yaradıbdır, nə üçün meyvəsiz sərv ağacından başqa heç birinə «azad» demirlər?

Dedi:

–Ağaclardan hər birinin müəyyən vaxtda bəhrəsi olar, ona görə onlar gah açılar, gan solar. Sərv ağacının isə heç bir barı yoxdur, odur ki, həmişə təzədir. Bu isə azadələrin sifətidir.

Şer

Hər keçən hadisəyə qəlbi verib aldanma,
Xəlfədən sonra da çox Dəclə axar Bağdadə.
Bacarırsansa əgər nəxl* kimi xurma yetir,
Mümkün olmazsa yaşa sərv kimi azadə.

**Hikmət**. İki adam öldü və dünyadan həsrətlə getdi: biri odur ki, yığdı yemədi, digəri odur ki, bildi eləmədi!

---

* Нязл – хурма агаъы

Şer

Paxıl olsa əgər adlı bir fazil,
Hər kəs tapacaqdır onda bir nöqsan.
Kəramət sahibi yüz günah etsə,
Kərəmi eybini örtəcək hər an.

## KİTABIN SONU

Allahın köməyi ilə bu «Gülüstan» kitabı bitdi və başqa müəlliflərdəki adətin əksinə olaraq özgələrinin şerindən istifadə edilmədi.

Beyt

Öz köhnə xirqəni geyməyin, inan.
Yaxşıdır birovuz təzə çuxadan.

Sədinin sözlərinin əksəriyyəti sevinc gətirən və məftun edəndir. Odur ki, gözü götürməyənlər öz tənəli dillərin işə salıb deyirlər ki, nahaq yerə beyni yormaq və faydasız olaraq çıraq tüstüsünü udmaq ağıllı adamların işi deyil. Lakin arif adamlara aydındır ki, (bu sözlər də onlar üçün yazılmışdır) şəfaverici nəsihət inciləri zərif ibarə sapına düzülmüş və acı məsləhət dərmanları şirin zarafat balına qarışdırıdmışdır ki, insanın yorğunluğa mail olan təbiəti bu sərvəti qəbul etməkdən məhrum qalmasın.

Şer

Yaşadıq dünyada biz də bir müddət,
Etdik bacardıqca neçə nəsihət,
Onu dinləməsə bir kəs nə olar.
Qoy bizdən dünyada qalsın yadigar.

Ey oxucum müəllifə bəxşiş dilə allahdan,
Katibə də istə onu bağışlasın girdikar,
Özünə də dua elə istəklərin doğrulsun,
Bu kitaba kim sahibsə o da olsun bəxtiyar!



## L Ü G Ə T

**Abid** – ibadətkar
**Astana** – kandar
**Ağuş** – qucaq
**Avaz** – səs
**Ağaz etmək** – başlamaq
**Bak** – qorxu
**Bəni-adəm** – Adəm övladları
**Bəzzaz** – toxuculuq məmuları satıcısı
**Bədəvi** – çöllü, köçəri
**Bərbət** – çalğı aləti
**Bişe** – meşə
**Cil** – qamışın həsir toxunan bir növü («lığ» da deyilir)
**Cani-pak** təmiz ürək
**Darğa** – keçmişdə bəy və mülgədarların mülkünə nəzarət edən vəkalətli şəxs
**Dərban** – qapıçı
**Dinar** – pul vahidi
**Dirəm** – çəki və pul vahidi
**Əta** – bəxşiş
**Fasiq** – ikiüzlü, hiyləgər
**Fazil** – bilikli, alim
**Fələk** – göy, səma
**Fəqih** – şəriət alimi
**Firavən** – bol
**Hücrə** – mollaxana və mədrəsədə dərs oxunan otaq
**Xanəqah** – rindlərin toplandığı yer
**Xacə** – ağa, sahib
**Xali** – boş
**Xamuş** – susmuş
**Xirqa** – dərvişlərə məxsus paltar
**Xislət** – xasiyyət
**Xuda** – Allah
**İltimas** – xahip
**Kan** – mədən
**Kerdiğar** – Allah, yaradan
**Kamiyab** – xoşbəxt, arzusuna çatan
**Kecavə** – saray xanımları üçün xüsusi düzəldilmiş səyyar təxt
**Kübar** – zadəgan, şəhər dövlətlisi
**Kəbr** – atəşpərəst
**Qaraqulaq** – qarolaq, vaşaq
**Qalandər** – dərviş
**Qəmər** – ay
**Qəriq** – qərq olan, tələf olan, suda boğulan
**Qubar** – toz
**Qur** – zebr
**Məddah** – tərif edən
**Moizə** – nəsihət
**Mömin** – qatı dindar, allah qorxusu ilə haqq-hesabda düz olan adam
**Munis** – dost, ürəyə ən yaxın

adam
**Mürği**–səhər – səhər quşu, bülbül
**Mütrib** – çalğıçı, xanəndə
**Müxənnəs** – alçaq, namussuz, qeyrətsiz
**Müddəi** – iddiaçı tələb edən
**Müəzzin** – nəsihət verən
**Nəxl** – xurma aqacı
**Nəsrani** – xristian, xaçpərəst
**Nayşəkər** – qənd qamışı
**Pavənd –** bağlı, asılı
**Pars –** farş
**Padzəhr** – əkszəhər, zəhərə qarşı
**Pasiban** – gözətçi
**Pərqü –** qutüklü
**Rehlət** – getmək, köçmək
**Ruzigar** – dövran, dolanışıq, külək
**Rinq** – qeydsiz, qəmsiz, arsız
**Rişe –** kök
**Rükət –** namazın hissələrindən biri
**Sahibxana** – ev sahibi
**Sərhəng** – polkovnik
**Səthixak** – yer üzü
**Səfsəfə** – səfistika
**Soxənvər –** şair, yazıçı
**Səmər –** fayda
**Sərmayə –** pul, kapital
**Sərrast –** düz, doğru
**Seyqəl –** ülüluma
**Sui–zənn** – pis niyyət
**Tərsa** – rahibə, xristian qadın
**Tüfli-gülüstan** – körpə gül-çiçək, tumurcuq
**Türfə** – ən əla, ən gözəl
**Tolud** – teşt
**Teşnə** – susuz
**Ud** – burada yandırıldıqda xoş iy verən bitki
**Vadi** – dərə
**Vaiz** – moizə edən, molla
**Zəxirə** – ehtiyat
**Zinhar** – uzaq ol, saqın



## KİTABIN İÇİNDƏKİLƏR

# ŞƏRHLƏR

[1] ***«Эцлцстан»*** ясяринин мцгяддимясиндя, Аллащын, Пейьямбярин вя Шираз щюкмдары Ябубякр Сяд ибн Зянэинин тярифи вардыр.

[2] ***Атабяй Ябубякр Сяд ибн Зянэи*** – Сядинин дюврцндя 1195-1226-чы иллярдя Ширазын щакими олмушдур. Сяди ондан щядиййя эюрмцш, юз тяхяллцсцнц онун адындан эютцрмякля, «Эцлцстан» ясярини она иттищаф етмишдир.

[3] ***Сцнбцлнинин «Эяндистан»*** ясяри ялйазмасы щалында олуб Азярбайъан Республика ялйазмалары фондунда сахланылыр. Бу ясяр ейнян Сядинин «Эцлцстан»ы кими башлайыб щязли мязмун дашыйыр. Буну «Эцлцстан»а бянзятмя вя йа тящзил адландырмаг олар. Чапа лайиг ясяр дейилдир.

[4] ***«Кячавядя щямнишиним вя щцърядя щямдямим»*** ифадясиндян айдын олур ки, Сядини «Эцлцстан» ясярини йазмаьа тяшвиг едян шяхс, онунла бирликдя сяйащятя чыхыб, мящрям сющбятляр едян юзц кими бир шаир олмушдур. Тяяссцф ки, Сяди бу достун адыны айдын сюйлямир.

[5] ***Ордибещишт*** – Иран шямси тягвиминин икинчи айы олуб, 21 апрел иля 21 май арасында давам едир.

[6] ***Нягши Яржянэи йахуд Яртянэи*** – Сасани (226 – 651) – щюкмдарларындан I Шапур вахтында (241–272) Иранда мяшщур олан ряссам Мaнинин китабынын адыдыр. Орада ян эюзял, няфис шякилляр мювъуд иди. Бу ифадя алтында бязиляри Чин ряссамларынын ряссамлыг сянятини дя нязярдя тутурлар.

[7] ***Бозоръмещр*** – Сасани падшащы Янушируяванын (531-579) аьыллы вязири олмушдур.

[8] ***Ялвянд даьы*** – Иранда щямядан шящяринин йахынлыьындадыр.

[9] ***Кянан...*** Бу мисрада «Йусиф вя Зцлейха» поемасынын гящряманы Йусифя ишаря едилир. Гардашларынын хяйанятиля гуйуйа салынмыш, гул кими сатылмыш, она ашиг олан Зцлейханын (аэасынын арвады) бющтаны иля йедди ил зинданда галдыгдан сонра нящайят шащлыьа чатмышдыр.

[10] ***Лоьман*** – Тарихи шяхсиййят олмасы мялум дейилдир. Кечмишдя мцхтялиф дюврлярдя Ярябистан вя Йунаныстанда бир нечя Лоьман адлы щяким вя алим шяхслярин йашадыьы гейд олунур. Йахын Шярг халгларынын классик поезийасында вя халг ядябиййатында бцтцн хястяликлярин чарясини билян бир щяким кими мяшщурдур.

[11] ***Щекайят*** – «Эцлцстан» китабында мцхтялиф щячмли вя мцхтялиф мязмунлу, ясасян шерля нясрин гаршылыглы ялагяси иля йазылан кичик щикмятамиз щекайяляр беля адланыр. Бурада да ейни адла сахланылмышдыр.

[12] ***Фридун*** – Яфсаняви Пишдадийан сцлалясиндян алтынчы падшащ щесаб олунур. Атасыны залим Зющщак юлдцрмцш, анасы ону хилас етмишдир. Дямирчи Эавя Зющщакы тахтдан салдыгдан сонра ону тахта яйляшдирмишдир.

[13] ***Мащмуд Сябуктякин*** – Гязнявилярин ян мяшщур вя гцввятли щюкмдарларындандыр. 997–1030-чу илляр арасындакы щюкмранлыьы дюврцндя Иран, Тцркцстан вя Щиндистанын ясас щиссясини юз щакимиййяти алтында бирляшдирмишдир.

[14] ***Нушируяван*** – Сасани сцлалясинин ян мяшщур щюкмдары олмушдур. 531–579-чу иллярдя щакимиййят сцряряк Иран вя еляхя дя бцтцн Йахын Шярг ядябиййатында ядалятли бир щюкмдар суряти кими мядщ олунмушдур. Эуйа Мящяммяд Пейьямбяр онун заманында доьулмасы иля фяхр едирмиш. щягигятдя ися Нушируяван чох залым олмуш вя азадихащ Мяздяк щярякатыны дагытмышдыр.

[15] ***Гур даьы*** – Гырмызы дянизин шималында Сина йарымадасында бир дагдыр. Йящудилярин Пейьямбяри сайылан Муса эуйа Мисирдя Пейьямбярлийя чатдыгда онун динини гябул етмяйян Фироуну бцтцн гошуну вя ямлакиля дянизя гярг етмиш, сонра юз тяряфдарлары иля Тур дагына чякилмишдир. Дини рявайятя эюря эуйа Аллащла бу дагын башында данышармыш.

[16] ***Эюрдцйцн щяр мешя санма ки, бощдур.***  
***Бялкя дя йатмышдыр орада гаплан***  
Бу ики мисранын фарсча ясли белядир:  
Щяр **бише** эяман мябяр ке, **халист**  
Шайяд ке, пялянэ хофте башяд.  
Бурада «бише» (мешя) вя «хали» (бош) сюзляринин бир дя «бися» йяни «халлы даш» вя «хал» кими охунмасы иля ялагядар олараг, тядгигатчылар бунун мянасыны «щяр гаралтыны халлы даш щесаб етмя, бялкя о йатмыш пялянэдир» кими дя изащ едирляр.

[17] ***Дцнйадан йох олса эяр щцма гушу.***  
***Бир кимся сайябан етмяз байгушу.***  
Щцма гушу гядим нагыл вя яфсанялярдя дювлят гушу кими тясвир олунур. Эуйа бу гуш кимин башы цзяриндя учуб

кюлэя салса, о падшащ олар. Яслиндя ися беля бир гуш щяйатда мювчуд дейилдир. Классик ядябиййатда мифик щцма гушу ня гядяр дювлят вя сяадят символудурса, байгуш да о гядяр фялакят вя бядбяхтлик символу кими гялямя алынмышдыр.

[18] ***Эцняши бцрцдц зил бир гаранлыг.***
***Эуйа ки, Йуниси удмушдур балыг***

Дини яфсаняляря эюря гядим Исраил халгы Пейьямбяр Йуниси эуйа дярйайа атмыш, дярйада ися бир нагга балыг ону удуб гарнында саламат сахламыш вя сонра ишыглы дцнйайа бурахмышдыр.

[19] ***Писляря йар олду Лутун арвады,***
***Айрылды пейгямбяр ханяданындан.***
***Итиня диггят ет Ясщаби-кящфин;***
***Йахшыларла эетди олду бир инсан.***

Дини рявайятя эюря гядим Фялястиндя Пейьямбяр олан Лутун арвады онун динини гябул етмяйянляря гошулуб яриндян цз дюндярмишдир.

«Ясщаби-кящф» ися дини яфсанялярдя ады чякилян «Маьара сащибляридир» (ясщаб сащибляр, кящф-маьара). Щядислярдя наьыл олунур ки, гядим Мисирдя Дягйанус адлы залым бир щюкмдарын 6 няфяр сарай хадими онун зцлмцндян гачыр, йолда бир чобан да юз ити иля онлара гошулур. Кеъялядикляри бир маьарада эуйа Аллащ онлара гийамятя гядяр ябяди йуху вермишдир, онларын щамысы, о ъцмлядян чобанын ити дя эуйа бещиштя эедяъякдир вя о дцнйада Ясщаби-кящфин ити иля Лутун арвадынын дярисини бир-бириля дяйишяъякляр.

[20] ***Зал бир эцн сюйляди оьлу Рцстямя...***

Зал фарсларын гядим яфсаняви гящряманы, мисилсиз пящляван Рцстямин атасыдыр. Онун атасы Сам, анадан аь тцклц догулмуш, буна эюря дя она гоъа мянасы верян Зал адыны вермишдир.

[21] ***Оьулмуш*** – Атабяй Юзбяк ибн Мящяммяд Ъащан пящляванын йахын адамларындан вя Султан Ялаяддин Мящяммяд Харязм шащын ямирляриндян биридир. Щямядан, Рей вя Исфящанын алынмасында Юзбяйя кюмяк етмиш вя щямин йерляря щаким тяйин едилмиш, нящайят 1217-ъи илдя Исмайили фядаиляри тяряфиндян юлдцрцлмцшдцр.

[22] ***Яъям*** – Ярябляр яраб олмайанлары, тцркляр ися иранлылары яъям йахуд яъями (йяни яъняби) адландырмышлар.



[23] ***«Шащнамя»*** – Ябцлгасим Фирдовсинин (934-1020) мяшщур ясяридир. Фирдовси бу юлмяз епопейасында Ипанын ян гадим дюврляриндян башламыш VII ясря гядярки щюкмдар вя гящряманларыны, тарихи-яфсаняви щадисяляри нязмя чякмишдир.

[24] ***Зющщак*** – Иранын гядим тарихиндя яфсаняви щюкмдардыр. Рявайятя эюря яряб няслиндяндир. Эуйа Иблис онун щяр чийниндя бир илан битирмиш вя бу иланлара щяр эцн ики ъаванын бейни верилирмиш.

Бундан ъана дойан халг Дямирчи Эавянин башчылыьы иля цсйан едиб, Зющщакы юлдцрмцш вя Ъямшидин оьлу Фридуну тахта отуртмушдур.

[25] ***Ъяннят ящли бир ъящянням санар икян ерафы,***
***Ъящяннямин ящли цчцн ераф юзц ъяннятдир.***

Дини хцрафата эюря эуйа ъяннят иля ъящянням арасында аралыг бир сащя вар ки, «ераф» адланыр.

[26] ***Касыб да, варлы да бу йердя гулдур,***
***Даща дювлятлися, даща йохсулдур.***

Бу бейтдя тярки-дцнйалыг вя дцнйа немятляриндян ял чякмяк кими мистик идейа мцдафия едилир. Орта яср мистикасына эюря дцнйа инсан цчцн мцвяггяти мянзилдир. Мал-дювлят ися инсаны бу мцвяггяти алямя даща чох баглайыр, гул едир, ону о дцнйайа, ябяди алямя эетмякдя лянэидир.

[27] ***Щяъъаъ Йусиф*** (Щяъъаъ-ибн Йусиф Яс-Сягяфи, 661-715). Ямяви дювлятинин ян залым щюкмдарларындан биридир. Гяддарлыгда ады зярбцлмясял олмушдур. 20 иллик щакимиййяти дюврцндя 120 мин адамы едам етдирмиш вя 54 йашында дящшятли бир хястяликдян юлмцшдцр. Бурада «бу дуанын щям сяня, щям дя бцтцн мцсялманлара хейри вардыр» ъцмлясинин мянасы одур ки, яэяр сян тез юлсян даща халга зцлм етмязсян, о дцнйа цчцн эцнащыьы нисбятян азалар вя мцсялманлар да сянин зцлмцндян гуртарар.

[28] ***Щиъаз***– Ярябистанда Мяккянин дахил олдуьу вилайятин адыдыр.

[29] ***Сащиб-Диван*** – Щцлаку ханын (1217-1265) вязири Шямсяддин Ъцвейнинин лягябидир.

[30] ***Дарыхма иш эюрцнся бир гаранлыг гуйуда***
***Чцнки гаранлыгдадыр о дирилик суйу да.***

Биринъи мисрада Йягуб пейгямбярин кичик оьлу Йусифин гардашлары тяряфиндян гуйуйа салыныб сонра бюйцк сяадятя

чатмасы вя икинъи мисрада Маэедонийалы Искяндярин дя ахтарыб тапа билмядийиябяди дирилик суйунун зцлмятдя олдугуну фярз едян гядим яфсаня нязярдя тутулур.

[31] ***Хаъя*** – Аьа, ъянаб. Бурада дцнйанын дярдлярини, эяляъяйин ишлярини нязяря алмайан гайьысыз дювлятли адам назярдя тутулур.

[32] ***Гарун*** – Муса Пейьямбярин ады иля баглы яфсаняви бир варлы образыдыр. Вар-дювлятин чохлуьундан юзцнц щамыдан йухары щесаб едиб, пейгямбяря табе олмазмыш. Эуйа буна эюря дя бцтцн вар дювляти иля бирликда йеря батмышдыр.

[33] ***Ямр Лейс*** – Сяффариляр сцлалясиндян икинъи щюкмдар олуб. Йягуб ибн Лейсин гардашы иди. 900-ъц илдя Ямир Исмайыл Самани тяряфиндан ясир едилнб Баьдада Аббаси хялифяляриндян Мютязилбиллащын щцзуруна эюндярилмиш вя орада едам едилмишдир.

[34] ***Зявзян*** – Щерат иля Нишапур арасында бир вилайятдир.

[35] ***Кейхосров*** – Гядим Иран падшащларындан Кяйанилор сцлалясинин цчцнъц щюкмдарыдыр. Фирдовсинин «Шащнамя» ясяриня эюря Сийавушун оьлу вя Кейкавусун нявясв щесаб едилир.

[36] ***Зцннуни-мисри*** – Ябцлфейз Субан ибн Ибращим. Дюврцнцн мяшщур яряб алими вя ядибляриндян олмушдур. 859-ъу илдя юлмцшдцр.

[37] ***«Мян бу адамы гурбан байрамы эцнц Бясрядя эюрмцшям».*** Мцсялман аляминдя щаъы лягяби Мяккяйя эедиб Кябяни зийарят едян адамлара верилир. Бу зийарят ися щиъри гямяри илинин зилщцъъя айынын 10-да, гурбан байрамы эцнцндя иъра олунур. Буна эюря дя гурбан байрамы эцнц Бясря шящяриндя олан адам орадан чох узагда олан Мяккядя байрам зийаряти мярасиминдя иштирак едя билмязди.

[38] ***Мялятиййя***– Фялястин йахынлыьында шящярдир.

[39] ***Янвяри (Овщядяддин)*** – Классик фарс шеринин эюркямли нцмайяндяляриндян биридир. Тус шящяри йахынлыьында Ябивярд гясябясиндя доьулмушдур. Хцсусан гясидя йазмагда бюйцк шющряти вардыр. Сялъуг щюкмдарларындан Султан Сянъярин яввялляр щюрмятини газанмыш, сонралар ися нуъума даир баш верян бир щадися нятиъясиндя онун горхусундан Бялхя гачмыш, 1209-ъу илдя орада вяфат етмишдир.

[40] ***Кясра***– Цмумиййятля Сасани сцлаляси падшащларына



верилян аддыр. Бурада ися Януширяван нязярдя тутулмущдур.

[41] ***Щарунярряшид*** - Аббасиляр (750-1258) сцлалясинин ян мяшщур хялифяляриндяндир. Онун щаким олдуьу 786-809-чу иллярдя хилафят чох гцдрятли олмушдур.

[42] ***Сяхр ъинни***– Яфсаняви ясатири див образыдыр. Эуйа Сцлейман Пейьямбярин цзцйцнц оьурламышдыр. Ейбяъярлик вя бядщейбятлилик тимсалыдыр.

[43] ***Мордад*** – Щиър шямсиййя илинин 6-ъы айы, 23 ийулдан 22 августадяк давам едир.

[44] ***Рямязан*** – Оруълуг айы. Щиъри гямяри илинин 9-ъу айыдыр.

[45] ***Румлу Исэяндяр (Маэедонийалы Исэяндяр)*** – Ераныздан яввял 330-ъу илдя Иран шащы 1-ъи Дараны мяглуб едиб, бцтцн Йахын Шярги истила етмишдир. Низами юлмяз «Хямся»синнн сон бюйцк поемасыны онун щаггында йазмышдыр.

[46] ***Кябя*** – Ярябистанда Мяккя шящяриндя мцсялманларын бюйцк зийарятэащыдыр.

[47] ***Ябдул Гадир Килани*** – Иранда мяшщур тяригят башчысы олуб 1165-ъи илдя вяфат емишдир.

[48] ***Мяьриб дянизи*** – Аралыг дянизи, бязян дя Гара дянизя дейирляр.

[49] ***Ъябраил вя Микаил*** – Дини мювщуми мялаикя адларыдыр.

[50] ***Щяфся вя Зейняб*** – Мящяммяд Пейьямбярин арвадларындан икисинин адларыдыр.

[51] ***Шейх*** – Бюйцк гябиля вя тяригят башчыларына дейилир. Шейх щям дини вя щям дя инзибати башчыдыр.

[52] ***Бириси сорущду гоъа Йягубдан:***
***Ей гялби нур сачан аьыллы инсан,***
***Бир кюйняк ийини дуйдун Мисирдян***
***Кянанда гуйуну эюрмядин нядян?***

Йягуб мяшщур «Йусиф вя Зулейха» дастанынын гящряманы Йусифин атасыдыр. Яфсанядя дейилир ки, щяля кичик икян бюйук гардашлары пахыллыг едяряк (Кянанда) Йусифи гуйуйа салыб, аталарына юлдц хябярини эятирмишляр. Лакни, Йусиф гуйудан хилас едилиб Мисря апарылыр, узун изтираблы сярьцзяштдян сонра о, Мисрин щакими олур. Аълыг илиндя тясадцфян онун йанына ьялмиш юз гардашлары васитяси иля

кюйняйини атасына эюндярир. Кюйняйин гохусуну ьуйа Йягуб щаля карван Мисирдян чыхмамыш щисс етмишди.

Бу шердю Пейьямбяр «узагкюрянлийинин» йалан вя уйдурма олдуьуна астещза едилир, чцнкн Йягуб пейгямбяр Мисирдя оьлувув кюйняйинв кюрдуйц щалда, йахыида онун душдцйц гуйуда ону кюрмзмнщди.

53 ***Бялбяк*** – Фялястиндя гядим шящяр олмуш, щазырда хярабяликляри галмышдыр.

54 ***«Вя нящну аграбу илейщв мин щяблил вярид».*** Гуранда бир айядир. Мянасы: «Мян онлара (инсанлара) бойунларынын шащ дамарындан да йахынам».

55 ***Вягф малы*** – Мясъидя вя дини-хейриййя идарясиня мяхсус олан мал, мцлкиййят.

56 ***Куфя*** – Ирагда шящярдир.

57 ***Няхлейи-Мящмуд*** – Мяккянин йахынлыьында бир мянтягядир. XII яср Азярбайчан шаири Яфзяляддин Хагани ьясидаляринин бириндя онун адыны чякир.

58 ***Шейх Ябцл Фяряъ Ибн Ъювзи (1115-1201)*** – «Баьдад низамиййя» мядрясясинин мяшщур мцяллими олмушдур. Мцхтялиф елмляря аид ясярляри вар.

59 ***Щяняфи мясляки*** – Ислам дини тяригятляриндян биридир.

Щаняфи тярагяти VIII ясрдя йашамыш, ислам дини тяригят-щцнасларындан бири олаи Ябу Щяняфи тяряфиндян йарадылмышдыр.

60 ***Бяни-Щилал*** – Мяккянин йахынлыьында вахтиля кичик йашайыш мянтягяси олмушдур.

61 ***Бящрам яэяр эур овлайыб эюрцнся дя гящряман,***
***О, зяифдир бир чяйиртня сцрцйан гарынъадан.***
Мяшщур «Сцлейман вя гарышга» тямсилиня ишарядир. Йяни бир эуру бцтюв шишя тахмасы иля шюцрятлянян Бящрам, яслиндя юз бядянинин чякисиндаи чох-чох аьыр чяйиртня будуну эютцря билян гарышгадан гат-гат зяифдир.

62 ***Шам***– Сурийа, Дямяшг

63 ***Ябу Щуреqря*** – Мящяммяд Пейьямбярин йахын адамларындан иди. Ясл ады Ябдцр-рящман ибн Сяхр Яздидир Пишикляря сон дяряъя йахындан гайгы эюстярдийиндян Мящаммяд пейэямбяр тяряфиндан Ябу Щурейря, йяни пишиклярин атасы ляьябини алыб. Бу адла да мяшщур олмушдур. 694-ъц илдя 78 йашында юлмцшдур.



64 ***Бейтцл - Мцгяддяс чюлц*** – Фялястиндя Йерусалим шящяри ятрафындадыр.

65 ***Траблис*** – Ливанда шящярдир.

66 ***Мцршщд вя Мцрид*** – Кечмиш вахтларда орта ясрлярдя ядяби-дини тяригятлярин башчысы мцршщд (бюйук), табеляри ися мцрид адландырылырды.

67 ***Фигщ елми*** – Шяриятин, дини гайдаларын шярщиндян бящс едир.

68 ***«Бир йатмышы башга йатмыш неъя ойада биляр?»*** – Сяди бурада XII яср Шярг классикляриндян «щядигятцл-Щягаиг» адлы ясярин мцяллифи мяшщур суфи Сянаини нязярдя тутур вя ону тянгид едир.

69 ***Ханягащ*** – Дяриншлярин вя онларын шейхляринин топландыглары йер.

70 ***Сяфа гардашлары*** – Орта ясрлярдя «Ихвани-сяфа» адлы мяшщур тяригят мячлисинин адыдыр, гардашлыг вя бярабярлик онларын асас щцары иди.

71 ***Сяряндиб*** – Щиндистанын ъянубунда Сейлонда шящярдир.

72 ***Тягва*** – Аллащ хофу, ядалят, рящимдиллилик. Бурада дин, иман нязярдя тутулур.

73 ***Гапындан йедди рянэ пярдя, эял, асма,***
***Сянин ки, евиндя биръя щясир вар!***
Йяни юз дахили хасиййят вя характерини эизлятмяйя ня гядяр сяй эюстярсян дя о йеня цзя чыхаъагдыр.

74 ***Щатями-Таи*** – Шярг халглары ядябиййатында ян сяхавятли вя гонагъыллыгда мисилсиз нцмуня эюстярян шяхс кими мядщ олунур. Дейилдийиня эюря, Ярябистанын Таи гябилясиндян олдуьу цчцн щямин лягябля мяшщурдур.

75 ***Щяляб*** – Сурийада шящярдир.

76 ***Фироун вя Щаман*** – Гядим Мисрин яфсаняви щюкмдарыдыр.

77 ***Ярдяшир Бабякан (226– 240)*** – Сасани сцлалясинин баниси щесаб едилир.

78 ***Васит*** – Ирагда шящярдир. Дейилдийиня ьюря о, Баьдадла Бясря арасында орта мясафядя олдуьундан Васит (вясят) йяни орта адыны алмышдыр.

79 ***Татар мщщарибяси*** – XIII ясрин яввялляриндя баш верян Монгол щцъуму нязярдя тутулур.

[80] ***Исэяндяриййя*** – Мисирдя шящярдир.

[81] ***Муса*** – Дин тарихиндя мяшщур Пейьямбярлярдян биридир. «Тюврат» адлы шярият китабы эуйа Аллащ тяряфиндян онун цчцн эюйдян енмишдир. Миладидян яввял 1571-ъи илдя доьулуб, 1451-ъи илдя вяфат етдийи гейд олунур. «Муса» сюзцнцн лцьяти мянасы Ибрани дилиндя «Судан хилас олмуш» демякдир.

[82] ***Бясря*** – Иранда шящярдир.

[83] ***Киш адасы*** – Фарс кюрфязиндя ададыр.

[84] ***Рум*** – Бизанс.

[85] ***...Чяксян Эяйан каманыны фяляк тутуб сахлайар...*** Бурада Кяйан шащлары ханяданы нязярда тутулур. Ейни заманда Эяйан сюзц бюйцк мянасыны да ифадя едир.

[86] ***Бякташ*** – аьа, ъянаб демякдир. Хилбаш ися Саманиляр (875– 999) дюврцндя вя ондан яввял сарай хидмятчиляри ичярисиндя вязифя дяряъяси иди.

[87] ***Мцсялла*** – Ширазда сяфалы бир йердир ки, мяшщур Иран шаири Щафизин гябри дя орададыр.

[88] ***Язцд-цд-дювля мягбяряси*** – «Эцлцстан»ын 1310-ъу щиъри (шямси) тарихли Тещран няшриндя наширин гейдиня эюря, Язцд-цд-дювля Дейляминин тикдирдийи мягбяря олмалыдыр.

[89] ***Суфи*** – дярвиш, дцнйа немятляриндян ял чякиб, ябяди алям, ахирят, Аллаща говушмаг идейасы иля йашайан, тярки-дцнйа; суфиляр юз ягидяляри етибариля мцхтялифдир.

[90] ***Щяким Ъалинус*** – Гядим Йунан философларындандыр.

[91] ***Сящбани-Ваил*** – Исламиййятин илк дюврцндя мяшщур яряб натиги вя алимидир.

[92] ***Щясян Меймянди*** (хаъя Ящмяд ибн Щясян Меймянди) Султан Мащмуд Гязнявинин вязири иди.

[93] ***Хятиб Ябцлфяварисин кобуд сяси чыханда***
***Ангыртысы Истяхрдя гала йыхар бир анда***
«Ябцлфяварис» яряб]я ешшяйя верилян мяъази аддыр, атын атасы демякдир. Йери эялдикдя йухарыдакы мязмунда мясял чякилир.

[94] ***Истяхр*** – Иранда шящярдир.

[95] ***Синъар*** – Ирагда шящярдир.



[96] ***Айаз*** – Султан Мащмудун ян севимли гулу иди.

[97] ***«...кябини цзцндян, чох гоъалмыш гайнанасы онун евиндя йашамалы олду».*** Шяриятя ясасланан кябин яслиндя гадынын бир ямтяя малы кими алыныб-сатылмасыны рясмиляшдирян бир сяняддир. Сюзцн бурадакы мянасы Азярбайъан дилиндя мещр сюзц иля даща чох ифадя олунур. Евлянян шяхс кябин кясдирдикдя мцяййян мябляьдя (бу ясасян гызыл йахуд мал-гара иля олур) гадын цчцн мещр вердийини гейд едирляр. Яэяр о арвады бошаса, щямин вяд олунмуш мябляьи йахуд мал-гараны гадына вермялидир.

[98] ***Тямуз*** – Кечмиш тягвимдя ийул айына мцгабил, йайын ян исти айыдыр.

[99] ***Мящяммяд Харязмшащ*** – XIII ясрин яввялиндя Орта Асийа Харязм шащ дювлятинин ахырынъы щюкмдарыдыр. Чинэиз гошуну иля гящряманъасына вурушмасы иля мяшщурдур.

[100] ***Кашьяр*** – Гярби Чиндя шящярдир, ейни заманда вилайят мяркязидир.

[101] ***Зямяхшяри*** – Мяшщур яряб филологу (1075–1144).

[102] ***Зейд вя Ямр*** – Яряб грамматика китабларында мисалларда чох ишлянян адлардыр.

[103] ***Хяфаъя*** – Мяккя зявварларына тез-тез басгын едян кючяри яряб тайфаларындан бири.

[104] ***Иддя*** – Гадынын бошандыгдан сонра 3 ай 10 эцн эюзлямяли олдуьу ялавя вахт. О, анъаг бу мцддят гуртардыгдан сонра йенидян яря эедя биляр.

[105] ***Сцщейл*** – Эюйун ъянуб даирясиндя ян парлаг улдузун адыдыр.

[106] ***Агуш вя Арслан*** – Мяшщур гул вя ян чох йайылмыш тцрк адларындандыр.

[107] ***Ращиб*** – Бцтцн щяйатыны килсядя гапалы дини хидмятя, ибадятя сярф едян кился хидмятчиляри.

[108] ***Салещин дявяси вя Дяъъалын ешшяйи*** – Салещ рявайятя эюря кечмиш пейгямбярлярдян бириси щесаб едилир. О ибадатя чаьырдыьы халгын тяляби цзря ян парлаг, ялван рянэли бир дявя зцщур етдирмякля мючцзя эюстярмишдир. Дяъъал ися эуйа гейб олмуш XII имамын зцщурундан яввал ешшяк белиндя эяляъяк, йаландан юзцнц Пейьямбяр елан едяъякдир. Салещин дявяси ня гядяр тямиз вя эюзял сайыларса, Дяъъалын ешшяйи дя о гядяр натямнз вя мурдар

щесаб едиляр.

[109] ***Нущун Туфаны*** – Эуйа ян гядим дюврлярдя пейгямбяр Нущ юз тайфасыны йцз иллярля диня ъаьырмыш, гябул етмямишляр, ахырда бюйцк бир туфан олмуш, су бцтцн дцнйаны басыб мящв етмиш, анъаг Нущун ъаьырышыны гябул едиб онун бюйцк ьямисиня минянляр саламат галмышлар.

[110] ***Биляган йахуд Бейляган*** – Агъабяди йахынлыьында, хярабялийи щазырда мювчуд олан мяшщур Орянгала шящяринин кечмиш адыдыр. V ясрдя бинасы гойулмуш, 1221-ъи илдя Чинэиз гошунлары тяряфиндян даьыдылараг, ушагдан бюйцйя бцтцн явалиси гылынъдан кечирилмишдир. XV ясря гадяр шящяр там виараня щалында галмышдыр. Эюрцнцр Сяди бурада Монголлардан яввял шящярин абад вахтыида олмушдур.

[111] ***Мярдяшт (Мярвдяшт)*** – Иранда йер адыдыр. Чини габлар биширмяк цчцн йарарлы мядян торпаьы иля зяньиндир.

[112] ***Ибращим*** – Мящяммяддан яввялки пейгямбярлярдян бирисинин адыдыр. О, Мяккядя исламиййятдян яввял мцгяддяс сайылан бцтляри гырмагда вя тящгир етмякдя шющрят газанмышдыр.

[113] ***Аби-щяйат*** – Дирилик суйу, эуйа Зцлмят сяфяриндя Исэяндяр бу суйу ахтарыб тапмамыш, Хызр адлы Пейьямбяр иcя ону тапыб ичмиш вя ябяди олараг йашайыр.

[114] ***Имам Мящяммяд Газалы***– Зейняддин Ябу Щамид Мящяммяд ибн Ящмяд Туси XII яср фарс рущани алимляриндяндир (1058-1111). Баьдадда Мядрясейи-Низамиййядя мцяллимлик етмишдир.

[115] ***Аьаъ*** – Кечмишдя Азярбайъанда вя еляъя дя бцтцн Гафгазда 7 километря бярабяр олан мясафя ващидидир.

[116] ***Ъямшид*** – Гядим Иран тарихиндя Пишдадиляр сцлалясинин дюрдцнъц падшащы сайылыр.